Elmi məsləhətçi: ***MƏHƏRRƏM QASIMLI***
Azərbaycan Aşıqlar Birliyinin sədri,
Dövlət Mükafatı laureatı

Layihənin koordinatoru: ***NİGAR HELMİ ABBASBƏYLİ***

Elmi redaktor: ***MAHİRƏ HÜSEYNOVA***
filologiya elmləri doktoru, professor

Hazırlayanlar: ***MƏHƏRRƏM QASIMLI***
Əməkdar elm xadimi, professor

***MAHMUD ALLAHMANLI***
filologiya elmləri doktoru, professor

***MUSA NƏBİOĞLU***
Əməkdar mədəniyyət işçisi

***ALTAY MƏMMƏDLİ***
filologiya üzrə fəlsəfə doktoru, dosent

***"QƏRBİ AZƏRBAYCAN AŞIQLARI (poeziya antologiyası)"***
***AZƏRBAYCAN AŞIQLAR BİRLİYİ.***
***"Zərdabi nəşr" MMC nəşriyyatı, Bakı, 2023, 512 səh.***

***Azərbaycan Aşıqlar Birliyinin ərsəyə gətirdiyi bu topluda Qərbi Azərbaycan torpaqlarında – İrəvan, Zəngəzur, Dərələyəz, Göyçə, Qaraqoyunlu, Dərəçiçək-Loru-Pəmbək və Ağbaba mahallarında yaşayıb-yaratmış ustad aşıqların poetik irsindən nümunələr toplanıb.***

***Antologiya ayrı-ayrı zaman kəsiklərində Qərbi Azərbaycanda yaşayıb-yaratmış ustad sənətkarların zəngin ədəbi irsi, buradakı aşıq mühitlərinin sənət ənənəsi, tarixi-mədəni prosesin inkişaf dinamikası, coğrafi arealın hansı milli-mənəvi zənginliyə köklənməsi haqqında informasiya vermək baxımından dəyərli bir qaynaqdır.***

***Şeirlərin seçimi zamanı toponimik səciyyəli yer-yurd adlarını və saz havalarındakı yurd nişanələrini özündə əks etdirən şeirlərə üstünlük verilib. Qərbi Azərbaycan mahalları ilə bağlı saz havaları nizamlanaraq ayrıca siyahı şəklində oxuculara təqdim olunur. Şeirlərdə yer almış yer-yurd adları da ayrıca göstərici-cədvəl şəklində təqdim olunur, ərəb-fars sözlərinin və arxaik sözlərin izahı verilir.***

***Qərbi Azərbaycan aşıqlarının poeziya antologiyası həm də bir yaddaş kitabıdır. Bu kitab İrəvanımızın, Zəngəzurumuzun, Dərələyəzimizin, Göyçəmizin, Ağbaba və digər mahallarımızın səsini-nəfəsini bu günümüzə və sabaha çatdırmaqda əhəmiyyətli rol oynayacaqdır.***

ISBN 978-9952-571-42–4

## AZƏRBAYCAN AŞIQLAR BİRLİYİNDƏN

***Milli-mənəvi varlığımızın ana axarları sırasında önəmli yer tutan ozan-aşıq mədəniyyətinin mühüm bir qanadı tarixən indiki Qərbi Azərbaycan mahallarından boy göstərib. İrəvan, Zəngəzur, Göyçə, Dərələyəz, Ağbaba, Qaraqoyunlu və Dərəçiçək-Loru-Pəmbək mahallarında yüzillər boyunca ustad sənətkarlar, azman aşıqlar çalıb-çağırmış, dilimizin, ruhumuzun, mədəniyyətimizin güc-qüdrətini Azərbaycan və oğuz-türk dünyası boyunca yayaraq şöhrətlənmişlər.***

***Aşıq şeirlərindən, saz havaları və dastanlardan səsi-sədası gələn Dədə Gözlü, Dədə Qürbət, Dədə Heykəl, Miskin Abdal, Ağ Aşıq, Xəstə Həsən, Aşıq Alı, Aşıq Ələsgər, Şenlik Çıldırlı, Növrəs İman, Dərəçiçəkli Alı, Şair Ağacan, Sallı Cəlil, Çobankərəli Cəfər, Sadıq Sultanov, İsgəndər Ağbabalı, İmran Həsənov, Murad Niyazlı və başqa onlarla ustad sənətkarın yaratdıqları poetik və melodik sənət inciləri milli qürur və iftixar yerimiz kimi ürəyimizin başında yer alır.***

***"İrəvan çuxuru", "Göyçəgülü", "Dərələyəz gəraylısı", "Cəlili", "Ağbaba gözəlləməsi" və bu sıradan olan başqa möhtəşəm saz havaları da milli-tarixi düşüncə və yaddaşımızı oyaq saxlayan çox mühüm, vacib qaynaqlardır. Çünki bu havaların melodik ruhu kimi, adı – toponimik ovqatı da bizi Qərbi Azərbaycanımıza – İrəvanımıza, Zəngəzurumuza, Dərələyəzimizə, Göyçəmizə, Vedibasarımıza səsləyir, oradakı dağın-daşın, yer-yurd ətrinin bizim könlümüzdəki, damarlarımızdakı tarixi-genetik dalğalanma ilə dopdoğma olduğundan xəbər verir.***

***Qərinələr boyu davam edən məkrli erməni siyasəti XIX-XX əsrlərdə Qərbi Azərbaycandakı oğuz-türk ellərini sıxışdırıb yer-yurdundan didərgin salsa da, o torpaqlara bağlı soydaşlarımızın canında, ruhunda olan Vətən eşqi sönməyib, daha da alovlanmaqdadır:***

***Vedinin yanı dağlar,***
***Ürəyi, canı dağlar,***
***Burda bir el varıydı,***
***Siz deyin, hanı, dağlar?!***

***bayatısından qopan;***

***İrəvanda xan qalmadı –***

***mahnısındakı şah misradan, eləcə də:***

***Yaylaq, bizim yaylaqlara bənzərsən –***

***poetik nicgil ağrısından havalanan yurd-yuva yanğılı milli ruh sarsılmazdır.***

***Bu, Qərbi Azərbaycanımızı soraqlayan sazın-sözün bağrı başındakı çağırış – ana yurda qayıdış tarixi qənaətidir ki, sözü gedən mübarək-müqəddəs düşüncə indi hər birimizin varlığında, ürəyində döyünür. Qərbi Azərbaycana qayıdış konsepsiyasının mahiyyətində də elə bu qənaət və strateyi hədəf durur...***

***Azərbaycan Aşıqlar Birliyi uzun zamandan bəridir ki, Qərbi Azərbaycan torpaqlarında – İrəvan, Zəngəzur, Dərələyəz, Göyçə, Qaraqoyunlu, Dərəçiçək-Loru-Pəmbək, Ağbaba mahallarında yaşayıb-yaratmış ustad aşıqların poetik irsinin toplanıb ayrıca antologiya şəklində hazırlanmasına xüsusi diqqət yetirib. Poetik örnəklərdə yer alan tarixi hadisə və əhvalatlar, toponimik səciyyəli yer-yurd adları və saz havalarındakı yurd nişanələri müəyyənləşdirilərək antologiyanın sonunda ayrıca göstərici-cədvəl şəklində verilib.***

***Gərgin zəhmətin nəticəsi olan bu kitabın toplanıb ərsəyə gəlməsində Aşıqlar Birliyinin əməkdaşları ilə yanaşı, Qərbi Azərbaycandan olan dəyərli ziyalılar – Avtandil Ağbabalı, Yusif Ağbulaqlı, Araz Yaquboğlu və Əmiraslan Göyçəli unudulmaz işlər görüblər.***

***İnanırıq ki, oxuculara təqdim olunan Qərbi Azərbaycan aşıqlarının poeziya antologiyası İrəvanımızın, Zəngəzurumuzun, Dərələyəzimizin, Göyçəmizin, Ağbaba və digər mahallarımızın səsini-nəfəsini bu günümüzə və sabaha çatdırmaqda əhəmiyyətli rol oynayacaqdır.***

## İRƏVAN AŞIQLARI

***Azərbaycan aşıq sənətinin inkişafında İrəvan aşıq mühitinin əhəmiyyətli mövqeyi olmuşdur. Özünəməxsus tarixi inkişaf yolu keçən bu mühit XX yüzilliyin əvvəllərinə qədər fəaliyyət göstərmişdir. Təəssüf ki, İrəvan aşıq mühitinin söz və musiqi repertuarı vaxtında yazıya alınmadığından indi onun gerçək görüntüsünü yaratmaq o qədər də asan deyildir. Bununla belə, bir tarixi faktı diqqət önündə saxlamaq lazımdır ki, İrəvanın Matenadaran əlyazmalar fondunda yer alan çoxsaylı aşıq şeirləri və dastanları böyük ehtimalla erməni katiblər məhz İrəvandakı aşıqlardan yazıya almışlar. XVI-XVIII yüzilliklərdə İrəvanda çalıb-çağıran erməni qusan və aşıqları da buradakı Azərbaycan aşıqlarının təsiri altında fəaliyyət göstərmişlər.***

***İrəvan aşıq mühiti çoxəsrlik fəaliyyəti boyunca tarixi məxəzlərə və folklor qaynaqlarına pozulmaz izlər sala bilmişdir. "İrəvan çuxuru", "İrəvan gəraylısı", "İrəvan gözəlləməsi" kimi saz havalarının mövcudluğu mühitdəki bəstəçilik və ifaçılıq mədəniyyətinin inkişaf səviyyəsi barədə xeyli təsəvvür verir.***

***İrəvan aşıqlığının sənət qüdrətini əks etdirən az sayda ustadın adı mənbələrə düşmüşdür: Dədə Gözlü, Dədə Güclü, Dədə Heykəl, Aşıq Heydər, Aşıq Cavad İrəvanlı, Aşıq Həsən Ortaçaylı və s. Təəssüf ki, İrəvan aşıqlığından söz açan, onlardan dastan və şeirlər yazıya alan erməni müəllifləri, o cümlədən də Xaçatur Abovyan bir nəfər də Azərbaycan aşığının adını qeyd etmir. Erməni məkri hər yerdə öz izini qoyur.***



# MÜƏLLİFİ BİLİNMƏYƏN AŞIQ ŞEİRLƏRİ VƏ BAYATILAR

## İRƏVANDA XAN QALMADI

İrəvanda bir quyu var,
Şəkərdən şirin suyu var,
Hər gözəlin bir xoyu var,
Ay qız, o xal nə xaldı,
Sən ora düzdürmüsən?
Ay naz, o xal nə xaldı,
Sən üzə düzdürmüsən?

İrəvanda yol işlərəm,
Xançalımı gümüşlərəm,
Bir öpərəm, bir dişlərəm,
Ay qız, o xal nə xaldı,
Sən ora düzdürmüsən?
Ay naz, o xal nə xaldı,
Sən üzə düzdürmüsən?

İrəvanın Ayaq quşu,
Gedər yazı, gələr qışı,
Yaxşı olar yar görüşü,
Ay qız, o xal nə xaldı,
Sən ora düzdürmüsən?
Ay naz, o xal nə xaldı,
Sən üzə düzdürmüsən?

İrəvanda Çarşıbazar,
İçində bir gəlin gəzər,
Dərdlərimə dərman yazar,
Ay qız, o xal nə xaldı,
Sən ora düzdürmüsən?
Ay naz, o xal nə xaldı,
Sən üzə düzdürmüsən?

İrəvanda Zəngi çayı,
Hüsnü mat eyləyər Ayı,
Mən yazıq yetimin payı,
Ay qız, o xal nə xaldı,
Sən ora düzdürmüsən?
Ay naz, o xal nə xaldı,
Sən üzə düzdürmüsən?

İrəvanda olar dügü,
Tacirlər bağlayar yükü,
Hindistandakı qul təki.
Ay qız, o xal nə xaldı,
Sən ora düzdürmüsən?
Ay naz, o xal nə xaldı,
Sən üzə düzdürmüsən?

İrəvanda xan qalmadı,
Gəncədə soltan qalmadı,
Daha məndə can qalmadı,
Ay qız, o xal nə xaldı,
Sən ora düzdürmüsən?
Ay naz, o xal nə xaldı,
Sən üzə düzdürmüsən?

## APARDI SELLƏR SARANI

Arpa çayı aşdı, daşdı,
Sel Saranı aldı qaçdı,
Ala gözlü, qələm qaşdı,
Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Yüz atlıydıq, çıxdıq düzə,
Bıçaq batsın yaman gözə,
Sağrı başmaq suda üzə,

Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Arpa çayı dərin olmaz,
Axar sular sərin olmaz,
Sara kimi gəlin olmaz,
Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Arpa çayı məni aldı,
Apardı dəryada saldı,
Cilovdarım darda qaldı,
Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Olduq əcəb günü qara,
Dərdimizə yoxdu çara.
Sara həsrət qaldı yara,
Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Qaldı bu sinəmdə dağı,
Öldürdü məni fərağı,
Oldu qara toy otağı,
Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Adaxlı gözlər yolunu,
Boynuna salsın qolunu,
Su aldı sağı-solunu,
Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Düyünü tökdüm qazana,
Qaynadı qaldı əzana,
Əlac yox Allah yazana,

Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Arpa çayı yata gəlir,
Kor yengələr dada gəlir,
Sağrı başmaq suda gəlir,
Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Gedin deyin Xançobana[1],
Gəlməsin bu il Muğana,
Muğan batıb nahaq qana,
Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

## İRƏVAN YOLUYNAN GƏLƏN BƏZİRGAN

İrəvan yoluynan gələn bəzirgan,
Halımı gözümdən bilən bəzirgan,
Axan göz yaşımı silən bəzirgan,
O eldən-obadan varmı bir xəbər?

İrəvan yolunu aşıb gəlmisən,
Sən də dərd içində bişib gəlmisən.
Yolunmu bu yana düşüb, gəlmisən,
O eldən-obadan varmı bir xəbər?

İrəvan yolundan mən də gəlmişəm,
Tufanda, dumanda, çəndə gəlmişəm.
Qəfildən düşmüşəm bəndə, gəlmişəm,
O eldən-obadan varmı bir xəbər?

***1. Xançoban – qədim türk tayfalarından birinin adıdır***

## İRƏVAN DEYİLƏN BİR DÜZƏN YERDİ

İrəvan deyilən bir düzən yerdi,
Tanrı yuvamızı yağıya verdi.
Müqəddəs ziyarət, ocaqdı, pirdi,
Ölüncə başıma döyər, ağlaram.

İrəvan deyilən cənnət məkandı,
Ürəyimdə təpər, canımda candı.
İrəvan deyəndə dilim də yandı,
Ölüncə başıma döyər, ağlaram.

İrəvan deyilən qayım bir eldi,
Ona ayna tutan o Toxmaq göldü.
Dağıldı el-obam, mərdlərim öldü,
Ölüncə başıma döyər, ağlaram.

## İRƏVAN ELİNDƏN YERİDİK BİZ DƏ

İrəvan elindən yeridik biz də,
Vətən həsrətini gətirdik gözdə.
O yer yada düşər söhbətdə, sözdə,
Bilməyən neyləsin, bilən neyləsin?

İrəvan elindən gedən birdimi?!
Necə açım deyim yada dərdimi.
Kafir arxalıydı, qırdı mərdimi,
Bilməyən neyləsin, bilən neyləsin?

İrəvan elindən ölən də oldu,
Köçlərə qarışıb gələn də oldu,
Yıxılıb yollarda qalan da oldu,
Bilməyən neyləsin, bilən neyləsin?

## BAYATILAR

Vedinin yanı dağlar,
Ürəyi, qanı dağlar.
Burda bir el varıydı,
Siz deyin, hanı, dağlar?

***

İrəvan qana düşdü,
Qəfil fəğana düşdü.
Təbriz, Gəncə gəlmədi,
Qollarım yana düşdü.

***

Gümrü yanı sarp qaya,
Boylandım Arpa çaya.
Ev tikdim, İrəvanda,
Əməyim getdi zaya.

***

Aşıq niyə yan gəzər,
Yan dolanar, yan gəzər.
İrəvanlı olan kəs,
Qalxar, İrəvan gəzər.

***

Əzizinəm xan oldu,
Xan oldu, sultan oldu,
İrəvan getdi əldən,
Türk ürəyi qan oldu.

***

Əzizinəm, can gəzdi,
Qansız olan qan gəzdi.
İrəvan sarayında
Sərdar adlı xan gəzdi.

***

Mən aşığam, yamandı,
Elsiz igid yamandı.
İrəvansız qalmışam,
A Göy məscid, amandı.

## "YETİM AYDIN" DASTANINDAN BİR PARÇA

***("Yetim Aydın" dastanından verilən bu mükəmməl təsvir-məlumat İrəvan mədəniyyət çevrəsinin tarixi zənginliyini ortaya qoyur. Sənət bilicilərinin məsləhəti və xeyir-duası ilə Təbrizdən İrəvana yola çıxan Yetim Aydın burada Dədə Gözlü, Dədə Qürbət, Dədə Heykəl kimi ustadlarla qarşılaşır.)***

## DƏDƏ GÖZLÜ İLƏ YETİM AYDININ QARŞILAŞMASI

...Beləcə, onlar ixtilat eləyə-eləyə gəlib yetdilər mənzil başına. Bir az dincəlib yol yorğunluqlarını çıxarandan sonra yollandılar İrəvan şəhərinin ortasındakı uçara[1]. Gəlib gördülər ki, ortalıqda boylu-buxunlu bir aşıq dayanıb, dörd dövrəsinə meydan oxuyur. Yanında da otuz-qırx saz var. Soruşub öyrəndilər ki, bu aşığın adı Dədə Gözlüdü. İndiyə kimi meydana nə qədər aşıq gəlibsə, hamısını bağlayıb, sazlarını da əlindən alıb. Yanına düzdüyü də həmən aşıqların sazlarıdı. Aşıq Urfanla Qurfan Aydına dedilər:

– Oğul, sən get atlarımıza göz ol, biz indi onun dərsini verək.

Yetim Aydın bir söz deməyib getdi atların yanına. Çox gözlədi, az gözlədi, gördü ustaları gəlib çıxmır. Axırda durub gəldi meydana. Baxdı ki, Dədə Gözlü aşıq Urfanı da, Qurfanı da bağlayıb, sazlarını da əllərindən alıb. İrəli yeriyib dedi:

– Dədə Gözlü, mən də aşığam. Gəl, indi mənimlə deyiş.

Dədə Gözlü güldü:

– A bala, heç sənin sazın da yoxdu, hardan oldun aşıq?

– Yoxumdu, indi alaram.

– Yaman yelli-yelli danışırsan. Eləysə, cavab ver görək.

Dədə Gözlü belə deyib də, götürdü görək nə dedi:

***Göydən enib doqquz nəsdə,***
***Söylə görüm, səri nədi?***
***Dörd dilli, beş nisbət,***
***Söylə görüm, pəri[2] nədi?***

***1. Uçar - meydan***
***2. Pər – burada qanad mənasında***

Yetim Aydına Tanrı vergisi verilmişdi, o səbəbdən də heç çətinə düşmədən cavabını verdi:

***Sən deyirsən doqquz nəsdə,***
***Onun səri fəraildi.***
***Dördü kəlam, beşi nisbət,***
***Gətirəni Cəbraildi.***

Dədə Gözlü baxdı ki, bu baxəbər adama oxşayır. Sorğu-sualı bir az da dərinləşdirdi:

***Bir məcid[1] var, ol ərşdədi,***
***Söylə görüm, nə gürşdədi?***
***Binəsin bil, adın söylə,***
***Nə nigar, nə naxışdadı?***

Yetim Aydın cavabında:

***Ol məcid ki, sən deyirsən,***
***Yeddi bürcdən yuxarıdı.***
***Binəsi nur, adı Əqsa,***
***Qələm nigar naxışdadı.***

Dədə Gözlü:

***Bir anadan bir qız olsa,***
***Atasına nigah qılsa,***
***Gözlü deyər, bəyan olsa,***
***Əri kimdi, pəri kimdi?***

Yetim Aydın cavabında:

***Aydın deyər, yandı canım,***
***Eşq oduna bələndi qanım.***

***1. Məcid – məscid***

***Adəm ata ol Həvvanın,***
***Həm əridi, həm pəridi.***

Dədə Gözlü:

– Ustadına bərəkallah, oğul, – dedi, sənin kamalına söz yoxdu.

Yetim Aydın gördü, bu Dədə Gözlü başda-bilikdə o biri aşıqlara bənzəmir. Öz-özünə fikirləşdi ki, gəlsənə, bir sorğu-sual da mən başlayım. Axırı nə olar, olar. Bu fikirlə də üz tutdu Dədə Gözlüyə:

– Ustad, sən sual elədin, mən də cavabın verdim. Aşıqlığın qaydası belədi ki, indi növbə mənimdi. İzin versən, iki-üç kəlmə də mən soruşaram.

Dədə Gözlü özündən arxayın idi, dedi:

– Buyur, neçə kəlmə xətrindi, soruş.

Götürüb görək burda Yetim Aydın nəyi soruşdu, necə soruşdu:

***Yer altında qızıl öküz,***
***Söylə, neçə yaşındadı?***
***Qulaq qırpır, yer titrədir,***
***Nə güc onun başındadır?***

Dədə Gözlü döyükə-döyükə qaldı. Cavab almayanda, Aydın dübarə soruşdu:

***Kimi ağa, kimi nökər,***
***Nökər olan hicran çəkər.***
***Bir milçəkdən qorxu çəkən,***
***Milçək hansı tuşundadı?***

Yenə bir səs-soraq çıxmadı. Aydın sözün arxasını belə tamamladı:

***Yetim Aydın deyir bunu,***
***Dağlardan qalındı gönü.***
***Tutub cütə qoşun onu,***
***Ləzzət cütün xışındadı.***

Dədə Gözlü Yetim Aydının suallarından heç birinə cavab verə bilməyib dedi:

– Sənin cavabını versə, mənim böyük qardaşım Dədə Qürbət verər. Get, özünü onunla sına.

## DƏDƏ QÜRBƏTLƏ YETİM AYDININ DEYİŞMƏSİ

Aydın Dədə Qürbətin yer-yurdunu öyrənib, üz qoydu həmən ünvana. Gethaget, axırda gəlib çatdı Dədə Qürbətin olacağına. Salam-kəlamdan sonra sözünə belə başladı:

– Ustad, sözünü-söhbətini eşidib, səni deyib gəlmişəm. Məni şəyirdliyə götür.

Dədə Qürbətin oğlanın diribaşlığından xoşu gəldi. Amma o, indiyə kimi nə qədər şəyird götürmüşdüsə, hamısını imtahana çəkib sonra yanında saxlamışdı. Ona görə də şərtini bəri başdan kəsdi:

– Bala, mən sınağa çəkməmiş bir kimsəni şəyirdliyə götürmərəm. Gərək baxam sənin qabında bir şey var, yoxsa yox.

Aydın razılaşdı. Dədə Qürbət görək ondan nələri xəbər aldı:

***Ol nə şeydir, alçaqlardan axayi?***
***Ol nə şeydir, yerdən göyə baxayi?***
***Ol nə şeydir, nərdivandan ənəyi?***
***Ol nə şeydir, nərdivandan çıxır hey.***

Aydın cavabında:

***Ol sudur ki, alçaqlardan axayi,***
***Ol məhsuldur, yerdən göyə baxayi.***
***Ol qocadır, nərdivandan ənəyi,***
***Ol cahildir, nərdivandan çıxır hey.***

Dədə Qürbət, – Əhsən, – deyib dübarə soruşdu:

***Ol nə şeydir, göydən yerə sallanır?***
***Ol nə şeydir, hər nə versən allanır?***
***Ol nə şeydir, dalısından nallanır?***
***Ol nə şeydir, əldən-ələ gəzər hey.***

Aydın götürüb belə cavab verdi:

***Ol yağışdır, göydən yerə sallanır,***
***Ol uşaqdır, hər nə versən allanır,***
***Abbasıdır, dalısından nallanır,***
***Ol şahıdır, əldən-ələ gəzər hey.***

Dədə Qürbət sualın bir düzümünü də düzdü:

***Ol nə dağdır, onu lalə bürüməz?***
***Ol nə dağdır, yaz-qış qarı əriməz?***
***Ol kim idi, ölməz, itməz, qarımaz?***
***Ol kim idi, qədəriyə gəzər hey.***

Aldı Yetim cavabında:

***Tur dağıdır, onu lalə bürüməz,***
***Şah dağıdır, yaz-qış qarı əriməz,***
***Bir Allahdır, ölməz, itməz, qarımaz,***
***Mikayıldır, qədəriylə gəzər hey.***

Dədə Qürbət əlacsız qalıb sözü tamamlamaq qərarına gəldi:

***Qürbət deyir, kim gəzədür havada,***
***Ol nə şeydir, dildə, dişdə, duvada?***
***Ol nə şeydir, yalqız yatar yuvada?***
***Ol nə şeydir, ona tövbə qılallar?***

Yetim Aydın cavabında nə dedi:

***Aydın deyər, mən gəzirəm havada,***
***Bismillahdı dildə, dişdə, duvada.***
***Can quşudur, yalqız yatar yuvada,***
***Əzrayıldı, ona tövbə qılallar.***

Aydının hazırcavablığı Dədə Qürbətin xoşuna gəldi.
– Hə, oğul, səni şəyirdliyə götürürəm.
Şəyirdlik bəhanəydi, Aydın Dədə Qürbəti sınağa çəkməyə gəlmişdi.

Odur ki, bir balaca qımışıb dedi:

– Usta, cavab verməyim kimi, sual vermək bacarığım da var. İzin versən, beş-altı sual da mən verərəm.

Dədə Qürbət çar-naçar razı oldu. Götürüb burda Yetim Aydın kamalı-ədəbnən görək ondan nəyi soruşdu:

***Məndən salam olsun Dədə Qürbətə,***
***Bəydən Bəydullaha nə demək gərək?***
***Oxuyanda kərəmullah surəsin,***
***Haqqın birliyinə nə demək gərək?***

Dədə Qürbət çox sorğulara düşüb-çıxmışdı, yeddibaşlı sualların, qıfılbəndlərin cavabın tapmışdı, amma hələ beləsinə tuş gəlməmişdi, ha fikirləşdisə, cavabı bir yana çıxara bilmədi. Aydın onun döyüküb qaldığını görüb, sualın arxasını gətirdi:

***Bu dünyada oynamasan, gülməsən,***
***Orucunu, namazını qılmasan,***
***Ya Allahın, peyğəmbərin bilməsən,***
***Deynən məşhər günü nə demək gərək?***

Yenə bir cavab çıxmadı. Yetim Aydın belədə dübarə söylədi:

***Aydın Yetim dəryalara dalanda,***
***Saralıban heyva kimi solanda,***
***İnkir-minkir gəlib sual alanda,***
***Dili bəndə düşüb, nə demək gərək?***

Dədə Qürbət yerindəcə quruyub qaldı. Nə ağ dinə bildi, nə qara. Han-nan-hana özünə gəlib dedi:

– Bala, sənin bu sualının cavabını versə, mənim böyük qardaşım Heykəl verər. Get özünü onunla sına.

## DƏDƏ HEYKƏLLƏ YETİM AYDININ DEYİŞMƏSİ

Yetim Aydın Dədə Heykəlin yer-yurdunu öyrənib, üz tutdu həmən tərəfə. Çox getdi, az getdi, axırda gəlib mənzil başına yetdi. Şəyird olmaq istədiyini Dədə Heykələ bildirib, onun razılığını aldı. Hər gün axşam düşəndə o da başqa şəyirdlərlə bir yerdə ustadın evinə yığışıb saz-söz söyləməyə başladı. Bir axşam qırx şəyirdnən bahəm dərsə gələndə Aydın böyük bir odun şələsini çiyninə alıb qapıdan girdi. Bunu görüb Dədə Heykəlin arvadı ağzını büzdü:

– Ay kişi, sənin bu külbaş təzə şagirdin heç oturuş-duruşunu bilmir. O biri şəyirdlər çalıb-oxumağa gələndə bu da bir şələ odun gətirir.

Dədə Heykəl Yetim Aydının bu hərəkətindən alındı:

– Yox, arvad, o şələynən gəlib qapıdan girməkdə "mənim yüküm var", – deyə işarə verir. Belə getsə, işlər şuluxdu.

Şəyirdlər gəlib yığışdı. Dədə Heykəl bir yerdə qərar tapa bilmirdi. Üzünü tutdu şəyirdlərə:

– İstəyirəm, bu axşam sizi bir imtahan eləyim, görüm qabınızda bir şey var, ya yox.

Götürüb sazı, görək nələri xəbər aldı:

***Ol nə şeydir, iki başı –***
***Parası var, parası yox.***
***Neçə illərdi uzunu,***
***Mənzili çox, arası yox?***

***Ol nədir, göydə tutuşur,***
***Biri-birindən ötüşür?***
***Ol nədir, rizqə yetişir,***
***Uçmağa mürğ anası yox?***

***Heykəl deyər, urfun əci,***
***Ol nədir, sura içi?***
***Hər dərdin var bir illacı,***
***Ol nə dərddi, çarəsi yox?***

Şəyirdlər bir-birinin üzünə baxdı. Aydın üstündə oturduğu şələdən bir odun çəkib saz əvəzinə bağrına basdı:

– Usta, izin versən, sualın cavabını mən deyərəm.

Dədə Heykəl içindən qırılıb qaldı. Bildi ki, şübhələndiyi şələ söhbəti boşuna deyil. Amma əlacı nəydi, könülsüz də olsa razılığını bildirdi.

Götürüb görək Yetim Aydın onun suallarının cavabını kamalı-ədəbnən necə verdi:

***Ol dünyada iki başı,***
***Parası var, parası yox.***
***Beş yüz ilədir uzunu,***
***Mənzili çox, arası yox.***

***Aynan gün göydə tutuşar,***
***Biri-birindən ötüşər.***
***Can quşu rizqə yetişər,***
***Uçmağa müğ anası yox.***

***Aydın deyər, urfun əci,***
***Ana südü surə içi.***
***Hər dərdin var bir əlacı,***
***Ol ölümdü, çarəsi yox.***

Dədə Heykəl onun cavabını bəyənib "afərin" söylədi:

– Oğul, sən şəyirdliyi neynirsən, özün kamil aşıqsan. Get məclis apar, ustadlıq elə.

Aydın təşəkkürünü bildirib dedi:

– Usta, cavab verməyim xoşuna gəldi, gəlsən, bir sual etməyimə də baxasan.

Dədə Heykəl baxdı ki, qırx şəyirdin qırxının da gözü ondadı. Özünün də hələ indiyə kimi meydanda söz qabağından qaçdığı olmayıb. Ona görə də dedi:

– Buyur, oğul, sorğu-sualını elə.

Yetim Aydın əlindəki odun parçasını sinəsinə basıb xəbər aldı:

***Məndən salam olsun Aşıq Heykələ,***
***Nə üstdə durubdu, dədə, Kavmahi[1]?***
***Nə yeyər, nə içər, nəyə bağlıdır?***
***Nə üstdə durubdu, dədə, Kavmahi?***

***Salmanlar nisbətin nə günü bağlar?***
***Nə gündə saç töküb, nə gündə ağlar?***
***Kimlər qabağında başın kim bağlar?***
***Nə sütuna bağlıdır, dədə, Kavmahi?***

***Dindirirsən, Yetim Aydını dindir,***
***Ayətül-Quranın ayəsi nədir?***
***Atası yox idi, anası kimdir?***
***Nə gündə oldu, dədə, Kavmahi?***

Dədə Heykəl çox açılmayan bağlamalar açmışdı, tapılmayan cavablar tapmışdı. Amma Aydın soruşan ölçü-biçidə bir söz-söhbət eşitməmişdi. Çox götür-qoydan sonra dedi:

– Oğul, bu sorğu-sual hələ bir yanda oxunmayıb. Oxunsa, mən eşidərdim. Əgər cavabı varsa, onda cavabını da de, bilək.

Aydın dedi:

- Düzdü, usta, bunun cavabı məndən qeyri bir aşığa əyan deyil. İndi ki, bilmək istəyirsən cavabını da qulluğunuza yetirim:

***Məndən salam olsun Aşıq Heykələ,***
***Bəhr üstə durubdur, dədə, Kavmahi.***
***Nur yeyər, nur içər, pirə bağlıdır,***
***Bəhr üstə oturubdu, dədə, Kavmahi.***

***Salmanlar nisbətin belinə bağlar,***
***Cümə gün saç tökər, şəbi gün ağlar.***
***İsrafil Haqq günü başını bağlar,***
***Ərşin sütunundadı, dədə, Kavmahi.***

***1. Kavmahi – balıq növünün adı***

***Yetim Aydını dindirərsən dindir,***
***Ayətül-Quranın ayəsi nundur.***
***Atası yox idi, anası nurdur,***
***Çərşənbədə oldu, dədə, Kavmahi.***

Dədə Heykəl öz sazını da, şəyirdlərinin sazını da gətirib qoydu Aydının qabağına:

– Aşıqlığın qaydası belədi, cavabını verəmmədik, sazlar sənindi.

Ustanın mərdliyi Yetim Aydının xoşuna gəldi:

– Yox, – dedi, – usta, sənin eldə-mahalda adın var. Mən səni başıaşağı eləmərəm. Amma mümkünsə, özün mənə bir saz peşkəş elə.

Aşıq Heykəlin ehtiyatda yaxşı bir sədəfli sazı varıydı. Çıxardıb onu Aydına peşkəş elədi.





## ÇOBANKƏRƏLİ AŞIQ CƏFƏR
*(1883-1943)*

***Zəngibasar bölgəsinin Çobankərə kəndində 1883-cü ildə dünyaya göz açan Aşıq Cəfəri mühitin söz-sənət qaynarlığı erkən yaşlarından özünə çəkib. Güclü musiqi duyumu, söz demək bacarığı, səs tembri ilə tez bir zamanda şöhrətlənib. Ustadların yaradıcılığını, dastanları sinədəftər edən aşıq ayrı-ayrı havaları yüksək ustalıqla çala bilməsi bacarığı ilə də sayılıb-seçilib. Onun məclis ədəb-ərkanı, dastan söyləyiciliyi, özünəməxsus ifa bacarığı haqqında çox sayda əhvalat və rəvayətlərin yaranmasına əsas olub.***

***Bölgədə yaşanan gərginliklər, ermənilərin törətdiyi saysız-hesabsız hadisələr, siyasi mühit səviyyəsində sıxışdırmalar əhalinin yurd-yuvasını tərk etməyə gətirib çıxarıb. Aşıq Cəfər də erməni qırğınlarından qaçaraq Naxçıvanın Şıxmahmud kəndinə pənah gətirib (1922), burada ustad sənətkar kimi tanınıb. Dastançı aşıq kimi daha çox xatırlanır. "Ziyad-Şövkət" dastanının yaradıcısıdır. Aşıqların repertuarında şeirləri yaşamaqdadır.***

***Aşıq Cəfər 1943-cü ildə vəfat edib.***

### GÖZƏL

Leyli kimi calallıdı, məni Məcnun sandı gözəl,
Əlində məzə şərbəti, məclisi dolandı gözəl.
Cismini pərvayiş edib, atəş tutub, yandı gözəl,
Dövrə vurub şux yeriyir, gör necə də candı gözəl.

Yeriyəndə min nazınan, yerişin qaza bənzətdim,
Uca boylu, mina gərdan, boyun şahbaza bənzətdim.
Bilmirəm yaşı neçədi, baxdıqca qıza bənzətdim,
Bir cüt busə lütf eləsən, elə bil ehsandı, gözəl.

Sən sevən kimsənələr, necə qəlbində yanmasın,
Özü gözəl, sözü gözəl, doğan ana utanmasın.
Danışdı mərdi-mərdana, gərək ilqardan dönməsin,
Aşıq Cəfər otağına, bir gecə mehmandı, gözəl.

## OLARMI?

Ay bimürvət, ay biinsaf, ay zalım,
Yaxşı dosta yalan satmaq olarmı?
Bir yar ki, yolunda canından keçər,
Heç onu aldadıb, atmaq olarmı?

Taleyi yatmışsa, heç vaxt kar olmaz,
Tərlan oylağında bil ki, sar olmaz,
Nanəcibdən, bədəsildən yar olmaz,
Ölüncə murada çatmaq olarmı?

Cəfərin taleyi dönməsin tərsə,
Külək əsib, yelkənini çevirsə.
İki könül bir-birini sevirsə,
Onun günahına batmaq olarmı?

## KİMİ

Qızlar durub xan Arazın başında,
Eybi yoxdu kirpiyində, qaşında,
Həddi-buluq – on dörd-on beş yaşında,
Sanasan dağların maralı kimi.

Arazın dörd yanı sırsıra buzdu,
Kimisi gəlindi, kimisi qızdı.
Başına döndüyüm, ay ala gözdü,
Könlümü eylədin qaralı kimi.

Aşıq Cəfər burda qoydu nişana,
Ayrılıq həsrəti kar eylər cana.
Sinəmə gəlibdi bir neçə xana,
Deməsəm, qalaram yaralı kimi.

## GÖZƏLLƏR

Al-yaşıl geyinib çıxdı qarşıma,
Yeriyin naz ilə dəstə, gözəllər.
Xudam sizi nə xoş gündə yaradıb,
Qurban sizin kimi dosta, gözəllər.

Qəvvas olan duz çıxarır dərindən,
Aşıq olan keçər başı-sərindən.
Üçünüzü seçmərəm biri-birindən,
Qaymaq dodaq, ağız püstə gözəllər.

Sizi mən eylərəm başımın tacı,
Həsrət könlüm gül camalın möhtacı.
Mən sizə qardaşam, siz mənə bacı,
Oldum dərdinizdən xəstə, gözəllər.

Yəqin bilin, var-yoxumu tökərəm,
Gözəllərin zəhmətini çəkərəm,
İsmim Aşıq Cəfər, sizə nökərəm,
Xoş gəldiniz gözüm üstə, gözəllər.

## SƏHNƏ XANIM

Bir qız gördüm Gözəldərə[1] elində,
Küsmə aşiqindən, gül, Səhnə xanım.
Gözüm qaldı zənəxdanda, telində,
Sallan, bizə sarı gəl, Səhnə xanım.

O qələm qaşların canımı aldı,
Qıya baxıb, bu cismimə od saldı,
Məşuqun üç gecə mehmanın oldu,
Qurban olsun sənə el, Səhnə xanım.

Aşıq Cəfər dərdə düşgün adamdı,
Dilin şəkər, dodaqların badamdı.
Anam Şaban, Məmişoğlu atamdı,
İstərsən, xəbər al, bil, Səhnə xanım.

***1.Gözəldərə - Qərbi Azərbaycanda – Zəngəzurda yer adı.***

## ZƏNGƏZUR AŞIQLARI

### ULULU KƏRİM
*(XVIII-XIX əsrlər)*

***Ululu Kərim aşıq sənətinin sayılıb-seçilən ustadlarından olmuşdur. Əlimizdə olan ədəbi irsi onun yaradıcı istedadının parlaq göstəricisidir. XVIII əsrin ikinci yarısında Zəngəzur mahalının Ululu kəndində anadan olduğu ehtimal edilir. Mənbələrin verdiyi məlumata görə, ahıl vaxtlarında Şahbuz mahalına köçmüş, yüz ilə qədər ömür sürmüşdür. Ustadlardan kamil dərs alan və sənət ənənəsini yüksək şəkildə mənimsəyən Ululu Kərim mühitin zənginliyinin örnəyidir. Zəngəzurda, eləcə də İrəvan, Dərələyəz, Dərəçiçək, Ağbaba, Naxçıvan və digər bölgələrdə yüksək istedadı ilə sayılıb-seçilmişdir. Xalq arasında çeşidli şeirləri dillər əzbəri olmuşdur.***

***Yüksək təbə malik bu sənətkar aşıq şeirinin müxtəlif formalarında yazıb-yaratmışdır.***

### BAYATILAR

Xoş günümü dərd aldı,
Aldı əldən, sərt aldı.
Müxənnət öldürərdi,
Dərd əlindən mərd aldı.

Sinəm başı yaradı,
Bəxtim üzü qaradı.
Dörd yanımı dərd alıb,
Mənim yerim haradı?

Dərdin odu canadı,
Yoxdu pəri, qanadı.
Yarı uzaqdan gördüm,
Könül yaram qanadı.

Bıçaq olar, koralar,
Tüstülənən qor olar.
Varlıya "gəl-gəl" deyən,
Yoxsul görsə, kor olar.

## GƏLDİM

Firqətindən, ey dilbəra,
Təngə yetib, cana gəldim.
Sənsiz bu xəstə könlümün,
Əlindən amana gəldim.

Məni, bu dildəki nalə,
Saldı bir özgə xəyalə.
Getdim, yetmədim vüsalə,
Yenə yana-yana gəldim.

Bir zaman kuyində qalsam,
Qolumu boynuna salsam,
Küfr zülfün ələ alsam,
Elə bil imana gəldim.

Hicrində qaldım avarə,
Rəhm edən yox dili zarə,
Sən özün eylə bir çarə,
Kim, sizin divana gəldim.

Aşiq, yamandır zəmanə,
Etibar olmaz xubanə,
Qoymuşam mərdü-mərdanə,
Bu başı meydana, gəldim.

## KEÇİLİ[1] YAYLAĞINDA

Ay ağalar, möcüz gördüm
Mən Keçili yaylağında.
Süsən-sünbul, tər bənövşə,
Qız Keçili yaylağında.

Gözəlləri bölük-bölük,
Dörd bir yanında var hörük.
Bilməm maraldı, ya əmlik,
Qız Keçili yaylağında.

Üst tərəfi Toğluqaya,
Axar-baxarı var çaya.
Gözəlləri ağca maya,
Qız Keçili yaylağında.

Yay olar, çıxarlar dağa,
Bulud dola, hava yağa.
Kəsərlər qurban qonağa,
Qız Keçili yaylağında.

Alt tərəf Nurs Kuluşdü,
Mollası yox, işi pisdi.
Kərim deyər, məndən küsdü,
Qız Keçili yaylağlında.

## KİM OLA

Fələyin əlindən qılan ahu-zar,
Biri mənəm, biri, yarəb, kim ola?
Gülü-rüxsarına çəkən intizar,
Biri mənəm, biri, yarəb, kim ola?

*1. Keçili – Naxçıvanda dağ adıdır*

Ey gözləri cəllad, qaməti mövzun,
Bu qədər bəndəni eyləmə dilxun,
Sərgəşteyi-aləm, hali didərgin,
Biri mənəm, biri, yarəb, kim ola?

Kərimin könlünü eyləmə viran,
Zülmündən usanıb halına bir yan,
Hicran ələmindən didəsi giryan,
Biri mənəm, biri, yarəb, kim ola?

## OLMAZ

Fürsət əldə ikən yaxşılıq eylə,
Həmişə əlində ixtiyar olmaz.
Gəl, güvənmə dövlətinə, malına,
Mala, mülkə, ömrə etibar olmaz.

Dörd yanımız bağça ola, bağ ola,
Sinəm üstü düyün ola, dağ ola,
Bir kiçik ki, böyüyünə ağ ola,
Düşər el gözündən, bəxtiyar olmaz.

Ululu Kərimi axtaran tapar,
Bir könülü yapan Kəbəni yapar.
Sən çalış, işini Haqq ilə apar,
Haqdan qeyri kimsə sənə yar olmaz.

## GETDİ

Şikayət var bu dünyanın əlindən,
Neçə Süleymanlar var idi, getdi.
Qışı hikmətindən əsnəmir dağlar,
Bax, dağları tutan qar idi, getdi.

Mülkü Süleymana vəfa qılmadı,
Loğman da dərdinə çarə qılmadı,
Neçə padşah gəldi, səndə qalmadı,
Kəfənin belinə sarıdı, getdi.

Uz tutarıq Sübahana, Səttarə,
Müşkülə düşəndə etginən çarə,
Çəkdi zülfüqarı, vurdu kafərə,
Zülfıqarı vuran var idi, getdi.

Bə görmürsən bu bivəfa dünyanı,
Neynədin Rüstəmi-Zal pəhləvanı,
Ərəsət ayağı, Haqqın divanı,
Kərim ondan xəbərdarıdı, getdi.

**YAXŞIDIR**

Salam verib bir məclisə varanda,
Yaxşı əyləş, yaxşı otur, yaxşı dur.
Dindirəndə kəlmə-kəlmə cavab ver,
Görən desin: bərəkallah, yaxşıdır.

Mənəm deyənləri tanı elində,
İgidin saxası gərək felində.
Pis övladın yaxşı ata yerində,
Qalmağından qalmamağı yaxşıdır.

Ay Ululu Kərim, söz yerdə qalmaz,
Nakəs təkəbbürlər dost qədri bilməz.
Dayan demək ilə namərd əylənməz,
Hər kəstənin özü bilən yaxşıdır.

## TƏKHATƏK

Ay ağalar, dərdim həddən aşıbdı,
Ərzi-halım sizə deyim təkhatək.
Ya hazır ərənlər, qırxlar sultanı,
Müşkülüm var, yetiş dada təkhatək.

Sərindən tökülüb siyah tellərin,
Buxağında dəstə-dəstə güllərin.
Yadıma düşəndə şirin dillərin,
Sinəm od tutub, gəzirəm təkhatək.

Bülbülün harayı budağa düşmüş,
Sinəm çalın-çarpaz bu dağa düşmüş.
Məcnunun məskəni bu dağa düşmüş,
Seyr edirəm səhraları təkhatək.

Kərim deyər, yaralarım yaradan,
Xəstə cismin sızıldaşır yaradan.
Yeri-göyü, ərşi-kürşü Yaradan,
İmdad eylə, yetiş dada təkhatək.

## NƏ İSƏ QALDI

Əcəl yastığına başım gələndə,
Fikir xəyalımda nə isə qaldı.
Geymişdim əynimə zərli libası,
Zərli paltarım nə isə qaldı.

Qızılın, gümüşün yoxdu miqdarı,
Qılıncın, qalxanın yox vəfadarı.
Oğulu, qızı, vəfalı yarı,
Gözəl vəfadarım nə isə, qaldı.

Bu dünyada beş gün gəzdik əmanət,
Gəl eyləmə əmanətə xəyanət.
İstər bir dəyə tik, istər imarət,
Qəsr otaqlarım nə isə, qaldı.

## MƏNİM

Durnalar, dərdimi qoy sizə deyim,
Ürəkdə sağalmaz dərdim var mənim.
Bu qürbətdə qalan bir qəribəm mən,
Haraya üz tutum, haram var mənim.

Yarı cida saldı fələk də məndən,
Beləcə ayrıldı mələk də məndən.
Sizə uğur olsun, dilək də məndən,
Alım, yaşılım yox, qaram var mənim.

Dönün, lələk salın Kərim eşqinə,
Sanki qədəm basdım yarın köşkünə.
Nə olar, siz mənə, qərib-düşgünə
Qəm verin, qəm ilə aram var mənim.

## DEYİLƏM

Allahı sevirsən, incitmə bizi,
Hikmət dəryasında üzən deyilsən.
Səninki haramdı, bir də əyrilik,
Söz sözün dalınca düzən deyilsən.

Şeytanlıq əlbət ki, çoxdu canında,
Mömin görünürsən mömin yanında.
Hiylə, min bir fitnə gəzir qanında,
Sən qəlbi-ürəyi düzən deyilsən.

Pula pir deyirsən, nəfsinə qulsan,
Müxənnət, qəlbi xılt, həm də çuğulsan.
Nə olar, insan tək bir insan olsan,
Sən eldə-obada gəzən deyilsən.

Ululu Kəriməm, bir əhli-halam,
Ümidim mövladı, gərək düz qalam.
İstərəm dünyada söz ilə qalam,
Sən əlin haramdan kəsən deyilsən.

## VAR

Hikmət aləmindən xəbərdaram mən,
Dünyavi-aləmin min bir halı var.
Kimi həsrət qalıb yavan çörəyə,
Kimi kef içində, cah-calalı var.

Yaradana bəlli dərd də, dərman da,
Onun əlindədi hər bir fərman da.
Allaha inamın olsa da canda,
Həyatın, taleyin qeylü-qalı var.

Kərimin dərdi çox, dərmanı yoxdu,
Bəlaya tuş olur bu qoca vaxtı.
Dərd artdı, biri də bu yandan çıxdı,
Bu qoca kişinin dövlət-varı var?!

## OLDU

Adın da Qəribdi, özün də qərib,
Qərib-qərib ötdün, halım pis oldu.
Könlüm qan ağladı, dözə bilmədim,
Sənin dediklərin mənə bəs oldu.

Kasıblıq çətindi, görmüşəm mən də,
Fələk əzəl gündən salıb kəməndə.
Həmişə qalıram dumanda-çəndə,
Ah çəkdin, eşitdim, ayrı səs oldu.

Varlı-pullu səni eşitməz, görməz,
Yoxsul qapısına atını sürməz.
Harındı, şeytanın qıçını qırmaz,
Nə də əl tutmağa bir həvəs oldu.

Görürsən, satdığım üzüm, ərikdi,
Məni ki tanıdın, dərdini tök di.
Demirəm dünyada Kərim də təkdi,
Qara bəxtın üzü bir az his oldu.

## DAĞLAR

Yaz gəldi, yaşıldı döşün, yamacın,
Sellər dərə boyu sallandı, dağlar.
Tez aldın qoynuna malı-qoyunu,
Suların elə bil ballandı, dağlar.

Yenə qurulacaq dəyə, alaçıq,
Sinəndə dolanıb xoşbəxt olacıq.
Qonağa hər zaman yolların açıq,
Lalənin yanağı allandı, dağlar.

Hayıf, ömür keçdi dərddə-ələmdə,
Yaxşı günüm hanı dünya-aləmdə.
Zildən düşüb indi dinirəm bəmdə,
Ululu Kərimin hallandı, dağlar.

## EYLƏRƏM

Dedim ki, tutaram Haqqın rahını,
Olaram mərdlərin dostu-yaxını.
Kasıbın-kusubun nalə-ahını,
Qataram sözümə, izhar eylərəm.

Duraram yollarda, dərvişan görəm,
İstəməm yoxsulu pərişan görəm.
Qəlbimi həmişə alışan görəm,
Hər dərdi özümə azar eylərəm.

Yaşın çoxdan keçib, Ululu Kərim,
Tayın-tuşun köçüb, Ululu Kərim.
Qəm şərbətin içib, Ululu Kərim,
Bu gələn əcələ nəzər eylərəm.

## YEDDİ
*(qıfılbənd)*

Ay ağalar, gəlin sizə söyləyim,
Burda bir dərya var, ayağı yeddi.
Altmış min şam yanır onun içində,
Şöləsi bərq vurub, çırağı yeddi.

Necə güldür, dərmək olmur muyundan,
Leyli necə dolsun Məcnun boyundan.
Nə çeşmədir, doymaq olmur suyundan,
Daşın da başı var, qaynağı yeddi.

Altmış min darvaza, altmış min bazar,
Altmış min içində həm əsası var.
Altmış min məscidi tamam laləzar,
Alışan taxtı var, otağı yeddi.

Bir bağbanın üç yüz altmış bağı var,
Üç yüz altmış bağın üç budağı var.
Kərimin dünyadan getmiş çağı var,
Səkkiz ev istəyib, otağı yeddi.

Nə camaldı, cansız üstə məskəndi,
Nə məcazdı, qabağıcan səsləndi.
Necə şeydi, əl dəyməmiş bəsləndi,
Üstündə sallanıb çırağı yeddi.

Nə bağbandı, on səkkiz min bağı var,
On səkkiz min bağın üç budağı var.
Desələr Kərimin onda sanı var,
Səkkiz ev yaslanıb, ocağı yeddi.

## DƏRƏLƏYƏZ AŞIQLARI

***Sənət ənənənəsi baxımından Göyçə aşıq mühitinə olduqca yaxın olan Dərələyəz aşıq mühiti öz sazlı-sözlü oymaqları, çal-çağırlı məclisləri və kamil ustadları ilə ad çıxarıb, qaynar sənət həyatı İrəvan, Naxçıvan və Göyçə mahallarına güclü təsir göstərib.***

***Dərələyəz mahalının Sallı, Hors, Qabaxlı, Qaraqaya kəndləri peşəkar aşıqlar məskəni sayılıb. XIX yüzilliyin sonu ilə XX yüzilliyin ortaları arasında Sallı kəndində iyirmiyə yaxın saz-söz sənətkarının çalıb-çağırması orada sənət həyatının olduqca qaynar keçməsindən soraq verir. Sallı kəndində ərsəyə gələn Aşıq Paşa, Qul Mustafa, Aşıq Cəlil, Şair Təhməz, Dəllək Xələf, Aşıq Əsəd, Şair Alhüseyn, Şair Məhəmməd (Aşıq Cəlilin qardaşıdır), Şair Rzaqulu, Aşıq Qulu, Məhəmmədəli, Aşıq Bəhmən, Aşıq Mirzalı və başqaları Dərələyəz aşıq mühitinin ən kamil saz-söz ustadları kimi şöhrətlənmişlər.***

***Dərələyəz aşıq mühitinin sonrakı dövr sənətkarları içərisində də Sallı kəndindən olan Aşıq Cəlil xüsusi yer tutmuşdur. Aşıqlıq elminin sirlərinə dərindən bələd olan Aşıq Cəlil bəstəçilik sahəsində – yeni saz havalarının yaradılmasında misilsiz xidmətlərə malikdir. Söyləndiyinə görə, o, on iki saz havasının yaradıcısıdır. “Baş Cəlili”, “Orta Cəlili”, “Ayaq Cəlili”, “Qəhrəmanı”, “Dərələyəz gəraylısı”, “Qaytarma”, “Badamı” aşıq havalarını Aşıq Cəlil yaradıb. Aşıq Cəlil bəstələrinin melodik özəllikləri göstərir ki, “İrəvan çuxuru”, “Ağır şərili” və “Yüngül şərili” havaları da onun barmaqlarının ovqatına çox yaxındır.***

***XIX-XX yüzilliklərdə Dərələyəz aşıq mühitinə mənsub aşıqlar öz fəaliyyətlərinin çox hissəsini Naxçıvan aşıq mühitinin tərkibində davam etdiriblər. Bununla belə, müxtəlif dönəmlərdə Kəlbəcərə, Laçına, Bərdəyə, Tərtərə və Gəncəyə gələrək orada məskunlaşan Dərələyəz kökənli aşıqlar həmin çevrələrdə sənətin inkişafına öz qatqılarını göstəriblər.***

## SALLI AŞIQ CƏLİL
*(1850-1928)*

***Aşıq Cəlil 1850-ci ildə Dərələyəz mahalının Sallı kəndində anadan olub. Erməni-müsəlman davası zamanı (1918) Naxçıvanın Şərur bölgəsindəki Dizə kəndində məskunlaşıb. Ustadı Cənubi Azərbaycanın ustad sənətkarlarından olan Aşıq Abbas olub. Göyçə, Naxçıvan, İrəvan, Dərəçiçək mühitləri ilə xüsusi sənət bağlantıları olub. El ağsaqqallarının verdiyi bilgiyə görə, ucaboylu, yaraşıqlı və nüfuzli bir şəxs olub. "Cəlili", "Ağır Şərili", "Yüngül Şərili", "Qaytarma", "Sallama gəraylı" ("Dərələyəz gəraylısı") və s. saz havalarının yaradıcısı Aşıq Cəlildir.***

***Naxçıvan aşıqlığının inkişafında Aşıq Cəlilin böyük rolu olub. Mühitin bir sıra sənətkarları ondan ustad dərsi alıb. Onun qardaşı və üç oğlu da aşıq olub. Sallı Aşıq Cəlilin anadan olmasının 150 illik yubileyi 2018-ci ildə Bakıda qeyd olunub.***

***Aşıq Cəlil təxminən 1928-ci ildə vəfat edib.***

### GÖZƏ GÖRÜNMƏZ
*(divani)*

Dilbilməzin əsiriyəm naçar, gözə görünməz,
Şükürlüyəm dağ-düyünə, açar gözəgörünməz.
Mərhəmətsiz nə kişidir, mənəm-mənəm deməsin,
Ədəb-ərkan bilməyənlər qaçar, gözə görünməz.

Sanma məni dilacıyam, gəl məni gör qəlbimdə,
Naşı deyil, anlayıram dürüstü də, qəlbi də.
Ala qarğa, kor yapalaq uça bilməz qəlbidə,
O qartalın layiqidir, uçar, gözə görünməz.

Gəl, Sallılı Cəlili sən qana salma nahaqdan,
Xəbərin yox nə xaliqdən, nə şahiddən, nə Haqdan.
Bax özünə, bax özümə, ayır haqqı nahaqdan,
Sən seçməsən, ay kəminsaf, seçər gözəgörünməz.

## PEŞMAN OLAR

Taytaq atı uzaq yola,
Capan kişi peşman olar.
Qürbət eldə qırx çeşmə ev,
Yapan kişi peşman olar.

Yaşasa da beş gün qəmnən,
Rastlaşar betər qəmnən.
Xoş güzəran əqli kəmnən,
Tapan kişi peşman olar.

Aşiqləri tapa hardan,
Söhbət aça biilqardan.
Gözəl üçün çirkin yardan,
Qopan kişi peşman olar.

## HARDASAN

Üzülübdür doğma yurddan ayağım,
Gecələr zülmətdir, sönüb çırağım.
Alınmaz səngərim, arxam, dayağım,
Dilim-ağzım, söhbət-sözüm, hardasan?

Soruşmursan dost-tanışdan, hardayam?
Sağım yağı, solum düşmən – dardayam.
Dörd bir yanım dəmir qəfəs – tordayam,
Yetiş dada, canım-gözüm, hardasan?

Yapon bu yerlərdə meyvə sulayır,
Nijde[1] belimizdə ocaq qalayır,
Yurdumda-yuvamda bayquş ulayır,
Sönür od-ocağım, közüm, hardasan?

*1. Qaregin Nijde - erməni millətçisi, silahlı quldur dəstəsinin üzvü*

Kafir süngüsünə keçir qız-oğlan,
Arpa qayasından qan süzülür, qan!
Qalmadı mahalda ər, sənə qurban,
Şəhid olur oğlum-qızım, hardasan?

Civə, Sallı, Ərgəz oda qalandı,
Leyliqaçan, Bülbülölən talandı.
Arpa qan ağladı, sular bulandı,
Açılmaz baharım, yazım, hardasan?

Kəsdilər yağılar bərəni-bəndi,
Odlara qalandı Əmağu kəndi.
Bütün Dərələyəz ağlayır indi,
Bu dərdə mən necə dözüm, hardasan?

Cəlil deyər, gözlərimiz qan ağlar,
Viran oldu abidələr, saraylar,
Sinəm üstə gecə-gündüz haraylar,
Xan Abbasım, telli sazım, hardasan?

## OLAR

Əqlində olmasa ixtiyar iblis,
Sövdada düşmannan bitişmək olar.
Olsa ləyaqətin insanlığa xas,
Fələhnən, pələhnən öpüşmək olar.

Xəstə sağalarmı, ağı olmasa?
İgid seçilərmi, yağı olmasa?
Sinəndə qohumun dağı olmasa,
Qaçarda ceyrannan ötüşmək olar.

Bilərsən qiymətin incinin, zərin,
Əgər elmin olsa dərindən, dərin,
O Şah Süleymanın, o peyğəmbərin
Taxtına, tacına yetişmək olar.

Cəlilin dilində, qəlbində Allah,
Keçər günahından, keçər şahənşah.
Böyük ustadlardan dərs alıb, vallah,
Ustadlıq adına yetişmək olar.

## BİLMƏRƏM

Dedilər: Çatginən şana-şöhrətə,
Dedim: Çatmamışam, çata bilmərəm.
Dedilər: Ləzzət var arsız ömürdə,
Dedim: Yetməmişəm, yetə bilmərəm.

Dedilər: Sağlam gör, görcək hər kəsi,
Dedim: Təbiblərlə etmərəm bəhsi.
Dedilər: Cənnətdir namərd kölgəsi,
Dedim: Yatmamışam, yata bilmərəm.

Dedilər: Ay Cəlil, gəl eyləmə naz,
Dedim: Rüzigara ərkim var bir az.
Dedilər: Mənliyin satmasan olmaz,
Dedim: Satmamışam, sata bilmərəm.

## ÜZ OLA

Yetən məni kari görür, lal sayır,
Nə var danışmağa hər söz, üz ola.
Aşıq deyər, üz ola,
Gər münasib üz ola.
Sənə çiynində çinin,
Mənə Tanrım üz ola.
Astar kimi doğulanlar qoy bilsin,
Gözləməsin, gəlib ondan üz ola.

Mənə göstər dərdsiz adam, Haqq sözdü,
Ləğviyyətə deməzlər ha, Haqq sözdü.
Aşıq deyər, Haqq sözdü,
Haqq özü də Haqq sözdü.
Yalanı yalvarmasın,
Canım alsın Haqq sözdü.
Mərd igidin mərd övladı Haqq sözdü,
Bəxt gətirə, üzündə də üz ola.

Yaran var, ay Cəlil, gözlə yaraynan,
Yaranmısan, yararlı tək yaraynan.
Aşıq deyər, yaraynan,
Sal bıçağı yar aynan.
Fərhad kimi külüng çal,
Sərt qayanı yar aynan.
Vaxt deyilsə, insan ölməz yaraynan,
İstər yara dərin ola, üz ola.



## AŞIQ QƏHRƏMAN
*(XIX-XX əsrlər)*

***Dərələyəz mahalının Hors kəndindəndir. Horslu Aşıq Qəhrəman kimi tanınmışdır. 1875-1880-ci illərdə anadan olması ehtimal edilir. Aşıq Cəlilin yanında sənətin sirlərinə yiyələnmişdir. Özünəməxsus avazı ustadın marağına səbəb olmuşdur. Dərələyəzdə, İrəvan ətrafı bölgələrdə, Naxçıvanda ağır məclislər aparmış, mühitin sənət ahənginə öz təsirini göstərmişdir. 1905-ci il erməni-müsəlman davasında həyat yoldaşı öldürülmüşdür. Ermənilərin törətdiyi faciə və qırğınların canlı şahidi olan sənətkar onun acı nəticələrini ailə və nəsil içində də yaşamışdır.***

***Aşıq Qəhrəmanın evi aşıq ocağı kimi xatırlanır. Onun ailəsindən xeyli sayda aşıqlar çıxmışdır. Oğlu Aşıq Paşa və nəvələri (Paşanın oğulları) Sultan, Yaqub, Siyanfər də sənətkar kimi bölgədə tanınmışdır. "Qəhrəmanı" saz havasının yaradıcısı da Aşıq Qəhrəman olduğu güman edilir. Ömrünün son illərini Şərur rayonunun Qarxun kəndində yaşamışdır.***

### ELLƏR

Gəlib çatıb yaz ayları,
Köç-köç olub ağır ellər,
Hər yanda səs-səsə verib,
Ötüşürlər tuti dillər.

Obalar düzülüb yola,
Qəflə işlər sağa, sola.
Ətir verir nərgiz, lala,
Açılıb qonçalar, güllər.

Gözəllər gedib bulağa,
Batıblar yaşıla, ağa.
Çıxıblar əlvan yaylağa,
Sayrışırlar siyah tellər.

Xublar yeriyirlər sana,
Ala gözlər susar qana,
Çalxanır yaşılbaş sona,
Bulanır dalğalı göllər.

Qızlar gəlir dəstə-dəstə,
Qəddi əlif, boyu bəstə,
Qəhrəman alıb qol üstə,
Xoş saz çalır şümşad əllər.

**TƏRLANIM**

Dün güzarım düşdü yara,
Gözəl, havalı tərlanım.
Saqın, uyma zalım sara,
Gözəl, havalı tərlanım.

Boylanırsan yanı-yanı,
Gözlərinin mən qurbanı.
O verdiyin peyman hanı?
Gözəl, havalı tərlanım.

Aşıq qonaq eləmədin,
Bir "xoş gəldin" söyləmədin.
Bağrım başın teyləmədin,
Gözəl, havalı tərlanım.

Gözəlliyin bildirirsən,
Dostlarını güldürürsən,
Axır məni öldürürsən,
Gözəl, havalı tərlanım.

Ağrın alım, qoşa kaman,
Çəkdirmə dostuna aman.
İltimas eylər Qəhrəman,
Gözəl, havalı tərlanım.

## YERİNDƏDİR

Dost məzəmmətindən incimək olmaz,
Əgər onda namus, ar yerindədir.
Gözlədiyin karvan çoxdan keçibdir,
Sanma ki, vəfasız yar yerindədir.

Xəstənin təbibdir, dağdır çarəsi,
Gözələ şöhrətdir onun vəfası.
O nə dostdur, səndən vardır yarası,
Eyləyir əl-aman, zar yerindədir?!

Qəhrəman dost üçün sərdən keçibdir,
Gahı şərbət, gahı zəhər içibdir.
Sən deyən bülbüllər çoxdan uçubdur,
Ötüşür budaqda, sar yerindədir.

## SEVDİYİM

Məndən uzaq gəzən Zərnişan xanım,
Eləmə bəxtimi qara, sevdiyim.
Sənə qurban olsun bu şirin canım,
Vurma ürəyimə yara, sevdiyim.

Kirpiklərin cəllad, gözlərin yağı,
Çəkirsən qəlbimə düyünü, dağı.
Qoynunda behiştin o gözəl bağı,
Vermə qızılgülü xara, sevdiyim.

Qoymadın hüsnünə baxıb qanam mən,
Necə qıydın, bu odlara yanam mən,
Səndən dönməm, əyri telli sonam mən,
Eylə bu dərdimə çara, sevdiyim.

Əllərindən dolu badə içmişəm,
Yar yolunda bu canımdan keçmişəm,
Gözəllər içində səni seçmişəm,
Məni atma sən kənara, sevdiyim.

Bizim bağda sallanıban gəz gözəl,
İnci, sədəf ağ buxağa düz gözəl,
Məclisimdə sağa, sola süz gözəl,
Salma məni qəm-qubara, sevdiyim.

Mən nələr çəkmişəm yar, səndən ötrü,
Bülbül fəqan eylər çəməndən ötrü,
Sən də bir şövqə gəl qiz, məndən ötrü,
Çəkmə aşığını dara, sevdiyim.

Səndən ayrı necə dözər Qəhrəman,
Qaşına, gözünə olubdu heyran.
Gen gəzmə dostundan, sevdalı ceyran,
Mənlə yaxın olsun ara, sevdiyim.

## DÜŞÜBDÜ

Bir sonam qalxıbdı göl kənarından,
Havalanıb burda tora düşübdü.
Sevdiyim nazlı yar əğyara uyub,
Bülbül güldən qalxıb xara düşübdü.

Sən gül xonçasına mən oldum bağban,
İnsaf et, çəkdirmə dostuna aman,
Qoymadın ki, məndə qala din-iman,
Meylim bağçadakı bara düşübdü.

Ayrıla bilmərəm yarın xasından,
Doymaram qaşının təmənnasından,
Keçməyir ürəyim qəm dəryasından,
Həsrət canım ahu-zara düşübdü.

Qəhrəman, mətləbin canana söylə,
Xəncər al, bağrımın başını teylə,
Dərmansız dindirmə, bir dərman eylə,
Gözüm qoynundakı nara düşübdü.

## BİLMƏDİM

Gözüm düşdü bir gözəlin qaşına,
İstədi meylimi bilə, bilmədim.
Məhbubluqda yoxdu yar bərabəri,
Hardan düşüb bizim elə, bilmədim.

Darayıb telini gərdənə düzdü,
Ala gözləriynən dostunu süzdü,
Sitəmkar bağrımın başını üzdü,
Çəkdi məni fitnə-felə, bilmədim.

Üzükdən keçir bax o nazik beli,
Zalım sözlərimə demədi bəli.
Az qaldım dərdindən mən olam dəli,
Axdı gözüm yaşı, silə bilmədim.

Sallana-sallana qarşıdan keçdi,
Neştər qaynaxları canımı deşdi.
Ömrümü hərcayı budadı, biçdi,
Dostun öhdəsindən gələ bilmədim.

Qəhrəman bulmadı bir vəfalı yar,
Bu düşgün halıma güldü ol əğyar.
Bada getdi yara etdiyim ilqar,
Düşdü sirr sözlərim dilə, bilmədim.



## NƏBİ ƏHMƏDOĞLU
*(XIX-XX əsrlər)*

***Nəbi Əhməd oğlu Dərələyəz mahalının Cırranlı kəndindəndir. Mahalın məşhur aşıqlarından biri kimi ad-san qazanmışdır. On doqquzuncu əsrin sonu, iyirminci əsrin qırxıncı illəri arasında yaşadığı söylənilir. Dəqiq anadan olma və vəfat tarixi məlum deyildir. Bölgənin qaynar saz-söz mühiti onun bir sənətkar kimi formalaşmasına təsirsiz ötüşməmişdir.***

***Zəngin istedadı, yaradıcı qabiliyyəti, musiqi duyumu mahalın aşıqlarının marağına səbəb olmuşdur. Ustadından kamil sənət bilgisi alan Nəbi Əhməd oğlu təkcə məclis ədəb-ərkanı ilə deyil, həm də səsi, nəfəsi ilə tezliklə tanınmışdır. Bölgənin ayrı-ayrı kəndlərində, eləcə də yaxın-uzaq ərazilərdə bədahətən söz deyə bilmək bacarığı, dastan söyləyiciliyi onu əhalinin sevimlisinə çevirmişdir.***

***Aşıq Nəbinin ailəsi aşıq ocağı kimi tanınmışdır. Oğlu Əhməd, nəvələri Baloş, Zülfi, Oktay da aşıq kimi ailədə sənət ənənəsini davam etdirmişlər.***

### DAĞLAR

Dağılıb ağır elləri,
Həsrət qalıb xasa dağlar.
Dərdin, qəmin şərbətindən,
İçibdi bir kasa dağlar.

Mərdlər ilə öyünübdü,
Güllü donun soyunubdu,
Kərəm təki geyinibdi,
Bir qara libasa dağlar.

Ağrının dağı qoşadı,
Gülü nərgiz, bənövşədi.
Qıran tayqulaq paşadı,
Dünya döndü yasa, dağlar.

## CAN SƏFƏRALI

Xəbər gəldi, Məmmədalı tutulub,
Qol-qanadı qandalağa bükülüb.
Bədövə minəndə qullar tökülüb,
Yüz atlı dağıdan can Səfəralı,
Düşmənə yaladır qan Səfəralı.

Pristav öldürüb, izin izlədi,
Sir sözünü şirin dildə gizlədi.
Tikəni yemədi, yoldaş gözlədi,
Hatəmə tay olan xan Səfəralı.

Göydağda çadırın qurub dirəkli,
Ətrafı bəzənib güllü, çiçəkli.
Ey enli kürəkli, pələng biləkli,
Yetir, qandalı aç, can Səfəralı,

Qırır bəyi, xanı, gen açır meydan,
Kasıb, yoxsullara eyləyir ənam.
Dünyaya gəlmiyif heç belə insan,
İçirdir düşmənə qan Səfəralı.

Neçə para kəndi eylədi azad,
Qırdı ermənini, qəlblər oldu şad.
Aşıq Nəbi aldı bir ağır xələt,
Düşmənə içirtdi qan Səfəralı.

## İGİD SƏFƏRALI, QOÇ MƏMMƏDALI

Aslan kimi cumdu rusun üstünə,
İgid Səfəralı, qoç Məmmədalı.
Ata-oğul düşmənlərin qəsdinə,
İgid Səfəralı, qoç Məmmədalı.

Qaçdı İvan, qorxdu Nikolay, Saşa,
Afərin, türk oğlu, söylədi Paşa.
Qoç ata var olsun, oğul yüz yaşa,
İgid Səfəralı, qoç Məmmədalı.

Nizəyə taxanda düşmən başını,
Qoymadı daş üstə qala daşını.
Qırıb tökdü sərçə kimi qoşunu,
İgid Səfəralı, qoç Məmmədalı.

Göydağdan yollandı Ağrıya şir tək,
Hay saldı dağlara nərə çəkərək.
Anadan doğulub bu dünyada tək,
İgid Səfəralı, qoç Məmmədalı.

Aşıq Nəbi igidliyi şan eylər,
Ellərə səs salıb, bir dastan eylər.
Rusa hücum çəkib neçə qan eylər,
İgid Səfəralı, qoç Məmmədalı.



## AŞIQ XANLAR
*(XIX-XX əsrlər)*

***Aşıq Xanlar Dərələyəz mahalının Herher kəndindəndir. On doqquzuncu əsrin sonu, iyirminci yüzilliyin ortalarında yaşayıb-yaratmışdır. Anadan olduğu və vəfat tarixi dəqiq məlum deyildir. Xalq arasında haqqında müxtəlif səpkili xatirə-əhvalatlar dolaşmaqdadır. Mühitin ustad sənətkarlarının məclis ədəb-ərkanına, çalıb-oxumalarına həssaslıq göstərən Xanlar erkən yaşlarından sənət yolunu seçmiş və dövrünün tanınmış aşıqlarından sənət dərsi almışdır.***

***Aşıq Cəlil, Aşıq Qəhrəman və s. sənətkarların təsirində formalaşmış, yüksək şeir istedadı olmuşdur. Şeirləri dillər əzbərinə çevrilərək sağlığında əhali arasında yayılmışdır. Təəssüf ki, zamanında yazıya alınmadığı üçün şeirlərinin böyük əksəriyyəti itib-batmışdır. Əldə olan nümunələr aşıqların repertuarından yazıya alınmışdır. Yaradıcı aşıq kimi tanınan aşıq Xanların, ictimai məzmunlu şeirlərində ermənilərin törətdiyi hadisələr daha çox özünə yer alır, yurd, torpaq həsrəti üstünlük təşkil edir.***

### QALDI

Yasıl dağlar, qan boyanan dərələr,
Deyin görüm, Əmağudan kim qaldı?
Yapon əclaf al[1] elədi ellərə,
Yandı ellər, bizlərə də qəm qaldı.

Hiylə ilə əldən silah alındı,
Arvad-uşaq tövlələrə salındı.
Od vuruldu, nəhəng tonqal qalandi,
Oda yandı, evlər uçdu, him qaldı.

Belə dərdi Xanlar necə götürsün,
Səs-sədası eldən elə yetirsin.
Allah «hayı»ı[2] yer üzündən itirsin,
Kədər aldıq, sitəm gördük, dəm qaldı.

---

*1. al - hiylə*
*2. hay - erməni*

## MƏNİ

Nə müddətdi qan ağlayır gözlərim,
Nə olar, vətənə yetirin məni.
Öpüm torpağımı, verim canımı,
Doğma qəbristana götürün məni.

Görüm dağ-dərəni, sorum halını,
Şeyda gözəlinin şah camalını,
Qırmızı lalənin qara xalını,
O doğma yerlərə ötürün məni.

Mən Xanlaram, gedim yurda daş qoyum,
Vətən deyim, uğurunda baş qoyum.
Bu dünyada bu həyatdan bir doyum,
Nə olar, imana gətirin məni.





## AŞIQ MƏHƏMMƏD
*(XIX-XX əsrlər)*

***Aşıq Məhəmməd Dərələyəz mahalının ünlü sənətkarlarındandır. On doqquzuncu əsrin sonlarında Dərələyəz mahalının Amağu kəndində anadan olub. Erkən yaşlarından mühitdə parlayıb. Göyçə, Naxçıvan, İrəvan, Dərəçiçək və s. bölgələrdə ağır məclislər aparıb. Dövrünün ustad sənətkarlarından hesab edilir. Yaşlı adamların verdiyi məlumata görə, zəngin yaradıcılıq yolu keçib.***

***Xalq arasında Füqəra Məhəmməd kimi tanınıb. Bu, onun sakit təbiətinə müvafiq olaraq verilmiş təxəllüsdür. Yaşlı vaxtında Yayçı kəndində yaşayıb. Yaradıcı aşıq olub, yüz ildən çox ömür sürüb.***

### HEY

Seyraqubu döyün, getsin qoyuna,
Tutun, boğazına salıb bağlar hey.
Tifil kimi, onu basıb bağrına,
Döşünü ağzına salıb ağlar hey.

O kimdir ki, Allahına ox atıb,
Şikarına balıq verib, o xatıb.
Gör nə gözəl xəlq eyləyib o katib,
Qaranın altından salıb ağlar hey.

Ey Füqara, dərin qazdır sini sən,
Yetirmisən indi yüzə sinni sən.
Düzdürmüsən məclisinə sini sən,
Fələk sinən üstə salı bağlar hey.

### FÜQARALIQDIR

Bizdən salam olsun sübhü danlara,
Adəmi Səfidən neçə tarixdi?
Bu yerdən dumana, dumannan günə,
Gündən də asmana nə qadalıxdı?

Nə idi, su ikən gətirdi cana,
Ona ruzi verir gündə pünhana.
Doqquz ay, doqquz gün salır zindana,
Bu necə qurğudu, nə ustalıxdı?

O necə padşahdı, min bir adı var,
Bir adı Kərimdi, bir adı Cabbar,
Sidq ilə çağırram qadiri Qaffar,
Bağışla, günahım Füqaralıqdır.

## GÖR KİMƏ QALDI

Ay ariflər, gəlin sizə söyləyim,
Yurdumun sərvəti gör, kimə qaldı?
Atamın görgahı, babamın mülkü,
Əlimin zəhməti gör, kimə qaldı?

Arpa çayı tərsə saldı axarın,
Təpəsidəlik[1] heç vaxt pozmaz vüqarın.
Rus haya[2] pay verdi Herher bağların,
Culun səltənəti gör, kimə qaldı.

Əyricə, Ələyəz, Qısırın dağı,
Sandıqlı, Sarıyer, Yazı yaylağı,
Göy dağın meşəsi, Morun bulağı,
İstisu cənnətdi, gör, kimə qaldı?

Yazdığın lavaşı, əmliyi, əti,
Balığın kababı, zirincin məti,
Məhəmməd, süfrənin şanı-şöhrəti,
Şəkəri-şərbəti gör, kimə qaldı.

---

***1. Təpəsidəlik – dağ adıdır***
***2. Hay – erməni***

## AXTALI AŞIQ QAFAR
*(XX əsr)*

***Aşıq Qafar iyirminci əsrin əvvəllərində Dərələyəzin Axta kəndində anadan olub. Mühitin qaynar söz-sənət ahəngi onun aşıq kimi yetişməsinə güclü təsir edib. Erkən yaşlarından məlahətli səsi, yaradıcı istedadı, söz deyə bilmək bacarığı ilə diqqəti cəlb edib və ağsaqqalların məsləhəti ilə ustadların yanında püxtələşib. Dastanları, klassik aşıqların yaradıcılığını sinədəftər edib, güclü ifaçı kimi tanınıb. Bölgədə aşıq məclisləri aparıb və dinləyicilərin sevimlisinə çevrilib. Ermənilərin törətdiyi deportasiyada (1948) dogma yurd-yuvasını tərk etmək məcburiyyətində qaldığından Əlibayramlı (Şirvan) rayonunda məskunlaşıb.***

***Dərələyəzli aşıq Hüseynə şəyirdlik edərək, ondan sənətin sirlərini mənimsəyib. Yaradıcı aşıq kimi tanınıb, rəngarəng mövzularda gəraylı, qoşma, təcnis, ustadnamə, divani və müxəmməsləri dillər əzbəri olub. Aşıqların repertuarından yazıya alınan şeirləri onun istedad və bacarığının göstəricisidir.***

### PULDUR

Hər kasıb-varlının bəşəriyyətdə,
Dilinin əzbəri, çörəyi puldur.
Bəzi milyonerdi, gözləri doymur,
Bəzinin çırpınan ürəyi puldur.

Cibin dolu olsa, kefin kök olur,
Cibdə olmayanda, rəngin də solur,
Qaşların çatılır, gözlərin dolur,
Hər dərdin, dərmanın dirəyi puldur.

Bəzinin cibindən qaçaq olubdu,
Bəzinin çantası dümdüz dolubdu,
Neçə padşahları taxtdan salıbdı,
Bəzinin olmayıb yeməyi, puldur.

Bəzi varlananda adı ucalır,
Bəzi Koroğlu tək qılıncın çalır,
Bəzini bulunmaz dərdlərə salır,
Bəzi ah-vay deyir, diləyi puldur.

Ahutək gözəllər mənliyin satır,
Qardaş dinar üstə qardaşın atır,
Çox bayıslar gündə min qana batır,
Qafar, çətin günün gərəyi puldur.

## UNUTMA

Dərdin çoxdur, dərd əhlini unutma,
Qulluq eylə yaxşı sözlər alınca.
Sınanmamış kəsdən dost olmaz, tutma,
Qeybət edər, düz danışmaz dalınca.

Yaxşısı var, yaman qoymur tanıyaq,
Vəfalısın nə cür seçək, sınayaq?
Çoxların dost edir araqla, konyak,
Mehribandı, istəkanı dolunca.

“Qonağım ol” sözün diliynən deyir,
Yeməkdir adəti, pul vermək - xeyir!
Yeyir-içir, gedib belə söyləyir,
Xam tapmışdım, yedim-içdim doyunca.

Belələri özün insan sınamır,
Qohum da, qardaş da bezir, qınamır.
Özü öz mənliyini hələ unamır,
Şeirə yazılıb ifşa olunca.

Bir dərin fikirlə xəyala dalın,
İnsan olub, insanlıqdan ad alın,
Səxalı mərd adı ilə ucalın,
Qafar şeirində yada salınca.

## QULU BAYRAMOĞLU
*(XX əsr)*

***Qulu Bayram oğlu Bayramov Dərələyəz aşıq mühitinin yetişdirdiyi sənətkarlardandır. Mühitin zəngin sənət ahəngi onun istedadının parlaması üçün müstəsna rol oynayıb. İyirminci yüzilin ilk onilliyində Dərələyəzin Sallı kəndində anadan olan Qulu Bayramov dövrünün ünlü sənətkarı olan Aşıq Cəlilin yanında şəyird olaraq sənətin sirlərinə yiyələnib. Güclü hafizəsi, şeir biliciliyi, saz duyumu ilə erkən yaşlarından nəzər-diqqəti cəlb edib, Dərələyəzdə, İrəvanda, Dərəçiçəkdə, Naxçıvanda ağır məclislər aparıb. Aşıq Cəfər və Aşıq Fətulla ilə birgə çoxlu məclislər aparıb. Dastanların bilicisi olub və dastançı aşıq kimi daha çox tanınıb.***

***Ermənilərin törətdikləri faciələr, qırğınlar onun həyatında da izsiz ötüşməyib və canlı şahidi olduğu bu dəhşətlər müxtəlif şəkillərdə onun şeirlərində öz ifadəsini tapıb. O, 1948-ci il deportasiyası zamanı Salyan rayonuna köçürülüb.***

***Yaradıcı aşıq olub. Gəraylı, qoşma, müxəmməs və bağlamaları xalq arasında geniş yayılmışdır.***

***Aşıq Qulu 1968-ci ildə Salyan rayonunun Kürqamışlı kəndində vəfat edib.***

### XOŞ GƏLDİN

Budur, gəldi bahar fəsli,
Sən bu diyara xoş gəldin.
Çilə bizi salıb qəfsə,
Çəkirdi dara, xoş gəldin.

Çilənin ömrü azalsın,
Baharın ömrü çoxalsın,
Qoyginən yoxsul dolansın,
Dərdinə çarə, xoş gəldin.

İnsanlar girməz içəri,
Açılar gülü, çiçəyi,
Gəlib dünyanın göyçəyi,
Yetib havara, xoş gəldin.

Quşlar havasından uçar,
Ördəklər gölünə qaçar,
İnsanın qəlbi açılar,
Düşməz azara, xoş gəldin.

Qulu deyər, sözüm düzdü,
Sonalar göləndə üzdü.
İndi inanmışıq, yazdı,
Çatdıq bahara, xoş gəldin.

## DANIŞAQ

Gəl, sənə söyləyim, ey duran aşıq,
Tənəfsiz[1] , dirəksiz göydən danışaq.
Yaranmış insanın ruzisin verən,
İstəkli torpaqdan, yerdən danışaq.

Bahar fəsli insan yaxşı qazanır,
Sülhü sevənlərin ömrü uzanır,
Təyyarələr ərş üzündə dolanır,
Elmi artıq olan dildən danışaq.

Səd afərin olsun belə insana,
Gör nələr yaradıb, çıxıb meydana,
Quş kimi səslənib uçur hər yana,
O qızıl barmaqdan, əldən danışaq.

Ayla Günəş ərş üzündə durubdur,
Bu qurğu büsatı bəs kim qurubdur?
Neçə il bu dünya yetim qalıbdır?
Onlardan bilirsən, ondan danışaq.

Qulu deyər, dünya halı necədir?
Gahdan o gündüzdür, gahdan gecədir.
Göydəki ulduzun sayı neçədir,
Hesab eylə, gəl onlardan danışaq.

***1. Tənəf – ip***

## OLDU

Bir zəmanə gördük, tərsin başladı,
Gündə bir kənd yanıb səngi-sar oldu.
Altmış meyit birdən düşdü araya,
Nə kəfən tapıldı, nə məzar oldu.

İnsanın içinə düşdü bir səda,
Yazıqlar bir-birin yandırdı oda.
Erməni dəstəsi oldu bir fida,
Müsəlman seçilib, can bezar oldu.

Kimini boynundan çəkdilər dara,
Kiminin qəlbinə vurdular yara,
Müsəlman millətim düşübdür dara,
Bilmədim dünyada qeylü-qal oldu.

Millətin içinə düşdü vəlvələ,
Danışasan, qəmi sığışmaz dilə.
Biz deyərik, dalı çəkər yüz ilə,
Kim deyərdi, dünya mürgüzar oldu.

Yeni dövran gəldi özün yetirdi,
Düşmənləri qovub burdan itirdi.
Qulu üçün xoş günləri gətirdi,
Vətən çiçəkləndi, laləzar oldu.

## GƏZİRƏM

Dəli könül, doğru yolla düz yeri,
Deyir bir vəfalı yarı gəzirəm,
Axtarıram onu tapa bilmirəm,
Qoynunda bəsləmiş narı gəzirəm.

Mənə nə eylədi nainsaf fələk,
Axırda başıma o açdı kələk,
Bir tərəfdə qoyun, bir yanda inək,
Onu itirmişəm, varı gəzirəm.

Bülbül cəh-cəh vurar, qonar budağa,
Gülün açılmağı qalar sabaha,
Axşamçağı çörək gələr qabağa,
Yağ əlimdən çıxıb, şoru gəzirəm.

Könül pərvazlanıb, namusu atmır,
Qəm tuğyan eyləyir, heç yuxu yatmır,
Arpaya, buğdaya qüvvətim çatmır,
Əlacım kəsilib, darı gəzirəm.

Qulu deyir, vaxtım keçib, qalmaram,
Əlac olsa, bu sazımı çalmaram.
And içmişəm, bihəyanı almaram,
Əgər alsam, koru, karı gəzirəm.

## DÜŞÜBDÜ

Ey ariflər, gəlin sizə söyləyim,
Ağ kağız üstünə qara düşübdü.
Tərk olduq vətəndən, qohum-qardaşdan,
Fələk vurdu, bu diyara düşübdü.

Kim bilirdi, axır belə olacaq,
Hərə bir diyarda düşüb qalacaq.
Yurddan uzaq düşən qərib öləcək,
Qohum-qardaş hər diyara düşübdü.

Yazı beləymiş ki, ayrıldıq eldən,
Sonalar dövr edər, tərk olar göldən,
Sizə xəbər verim, şeyda-bülbüldən,
Onun qızılgülü xara düşübdü.

Sözün günahını qoy deyim barı,
Ürəyimdə çoxdur qəmin anbarı,
Pərvanə dövr eylər ataşa sarı,
Qanadları yansa, nara düşübdü.

Bir kağız yazıram o qardaşıma,
Bu ayrılıq Haqdan gəlib başıma,
Hərdən hirsim tutur öz yoldaşıma,
Könlüm pərişandır, dara düşübdü.

Qərib olan hər dillərdə ad olar,
Hansı kəndə düşsə, orda yad olar,
Həsrət çəkər, axır bimurad olar,
Yazıq Qulu bu azara düşübdü.

## DAĞLARIM

Əziz dostlar, gəlin sizə söyləyim,
Gör necə xoş keçir halı dağların.
Süsəni, sünbülü, gülü, reyhanı,
Nə gözəl bəslənir malı dağların.

Onun erkəyinin çoxdur qiyməti,
Boyun əyməz, nədir xalqa minnəti.
Arısı, beçəsi, şanı-şöhrəti,
Pətəkdən kəsilir  balı dağların.

Al-yaşıl geyinir qız-gəlinləri,
Çeşmələrdə gəzir incəbelləri.
Nazik barmaqları, şümşad əlləri,
Nə gözəl tam verir yağı dağların.

Kəklikləri qayalarda səs eylər,
Qaqqıldaşıb bir-biriylə bəhs eylər,
Ovçu marıtdayıb çox həvəs eylər,
Üç təpədən keçir yolu dağların.

Qulu deyər, ayrı düşdüm elimdən,
Başım ayazımır didəm selindən.
Dəmliyəsən çayı səhlab gülündən,
Uzaq düşdü bizə yolu dağların.

## BƏHMAN SALLILI
*(1904-1979)*

***Bəhmən Kərbəlayı Səfəralı oğlu Mustafayev 1904-cü ildə Dərələyəz mahalının Sallı kəndində anadan olub. El-obada, ətraf bölgələrdə də Sallılı Aşıq Bəhmən adı ilə tanınıb. Mühitin sənət ruhunu bütün tərəfləri ilə mənimsəyib, Göyçə, Dərəçiçək, Naxçıvan aşıqları ilə sıx təmasları olub. Uzun müddət bölgədə ustad sənətkarlarla birgə məclislər aparıb.***

***Deportasiya zamanı (1948) dogma yurdundan Salyan rayonuna köçürülüb. Aradan xeyli vaxt keçdikdən sonra mühitin təbiətinə uyğunlaşa bilmədiyi üçün təzədən dogma kəndinə qayıdıb. Lakin ardı-arası kəsməyən təqiblər üzündə yenidən doğma yurdu tərk etməli olub.***

***Xaçmaz rayonunun Arzu kəndinə köçən sənətkar orada da sazı-sözü ilə sayılıb seçilib. Quba, Qusar, Dəvəçi və s. bölgələrdə məclislər keçirib. Köçdüyü yeni yurdda da dünyasını dəyişib.***

***Məlahətli səsi, yüksək yaradıcı qabiliyyəti ilə məşhur olan aşıq saz havalarının mahir ifaçılarından olub. Müxtəlif mövzularda yazdığı şeirləri xalq arasında geniş yayılıb.***

### MƏNİM

Nəsihətim kar eyləmir,
Qan ağlar həyatım mənim.
Dağa-daşa ün salıbdır,
Bu qəmli bayatım mənim.

Bahar olmaz zimistansız,
Adım sağdır, özüm cansız.
Dözə bilmirəm Telmansız,
Qopub qiyamətim mənim.

Fələk sındırdı könlümü,
Kökündən vurdu qolumu,
İtirdim doğma yurdumu,
Çatıb son saatım mənim.

## HANI

Görünmür boz muxruların,
Qan ağlayar çınqılların,
Qoyun-quzu, naxırların,
Səndə gəzən ellər hanı?

Köksündə otlar sürülər,
Suyundan içən dirilər.
Əlvan libaslı hürülər,
Səndə gəzən ellər hanı?

Bəyəli[1] zəngin düdmandı[2],
Güllü-çiçəkli ormandı,
Qənimi hökmü-zamandı,
Sənda gəzən ellər hanı?

Bəhman, unutma bu yeri,
Bir gün təkər dönər geri.
Dağıdar səddi, çəpəri,
Səndə gəzən ellər hanı?

## HAYIF OLDU

Bir tülək tərlanım uçdu əlimdən,
Adı əzbər olub, düşmür dilimdən,
Qocalmışam, bir iş gəlmir əlimdən,
İşləmir qollarım, diz hayıf oldu.

Vicdan qəbul etmir böhtan, məzəmmət,
Qəlp çıxıb müsayib, yoxdur məhəbbət,
Oğulda, uşaqda qalmayıb hörmət,
Ortalıqda çörək, duz hayıf oldu.

Bülbül idim, ayrı düşdüm gülümdən,
Zaman ayrı saldı məni elimdən.
Vəfalı dostlarım çıxdı əlimdən,
Kəsildi ixtilat, söz hayıf oldu.

---

***1. Bəyəli - yer adı***
***2. Düdmandı - ev***

Qocalıq əl verib, dağılıb huşum,
Köçdülər dünyadan çox tayım-tuşum.
Gor deyə titrəyir bəlalı başım,
Ömrüm bada getdi, tez hayıf oldu.

Həyatda bir müddət eylədim dövran,
Axırda bir bağa kəsildim bağban.
Qəza vurdu, soldun, şüara Bəhman,
Əlində sədəfli saz hayıf oldu.

## VƏSİYYƏT

Acı rüzgar döyəcləyir şəhəri,
Gümüşü qar, elə bil ki, kətandır.
Kirpiyimlə açacağam səhəri,
Əynimdəki paltar deyil, kəfəndir.

Səfərbərlik ya bu gündür, ya sabah,
Dörd tərəfdə şüvənə bax, yasa bax,
Aman gətir, ya Sübhanım, ya Sabah,
Dava deyil, bu taundur, tufandır.

Kiçik səhvimi də böyük söz etdin,
Üzümü darayıb, üstümü diddin,
Bəlkə də ölmədim, uzun vaxt itdim,
Çıxıb getmə, gözlə məni, amandır.

Sən unutma olanları, ötəni,
Heç axtarma qürbət eldə itəni.
Yaxşı saxla Roza ilə Kətəni,
Bilirsən ki, onlar əziz balamdır.

Qurban getsəm bu Vətənə, bu elə,
Çox ağlama, bir neçə gün qəm eylə.
Şər deməsən, xeyir gəlməz qəm ilə,
Üç oğlum var, hər birisi Bəhmandır!

## FƏTULLA ALLAHVERDİYEV
*(1910-1942)*

***Fətulla İbad oğlu Allahverdiyev 1910-cu ildə Dərələyəz mahalının Novlar kəndində anadan olub. Atası İbad kişi 1917-ci ildə vəfat edib. Uzun müddət ailənin ağırlığı onun üzərinə düşüb və o, muzdurluq edib.***

***Çətin həyat şəraiti olan Fətulla nəsildən gələn sənət ənənəsini ləyaqətlə davam etdirib. Bacarıq və qabiliyyətini görən babası Fətullaya aşıqlığın sirlərini öyrədib. Saz havalarını, region aşıqlarının ədəbi irsini, dastanları mükəmməl şəkildə mənimsəyib. Klassik aşıqların yaradıcılığı repertuarında üstünlük təşkil edib.***

***Babası Haqverdi dövrünün tanınmış aşıqlarından olub. Söz demək bacarığı, sənət duyumu, güclü yaddaşı onun az bir vaxtda parlamasına səbəb olub, babası Aşıq Haqverdi ilə birgə məclislər keçirib.***

***1928-ci ildən aşıqlığa başlayan Fətulla yaradıcılıq qabiliyyəti ilə daha çox sayılıb-seçilib. Aşıqların ikinci qurultayının (1938) iştirakçısı olub. "Aşığın səsi" (1939) kitabında şeirləri çap olunub.***

***Aşıq Fətulla İkinci dünya müharibəsində (1942) həlak olub.***

### GƏLİN

Ürəkdə pünhan dərdim var,
Gərək deyim sizə, gəlin.
Əlini ver sən əlimə,
Gəlsən, gedək bizə, gəlin.

Baxışından od tökürsən,
Ortalığa qan əkirsən,
Naz ilə vəsmə çəkirsən
Qaş altından gözə, gəlin.

Sənsən ariflərin canı,
Sinəndədi gövhər kanı.
Fətulla tək aşıq hanı,
Bu cəbirə dözə, gəlin.

## DAŞDAŞA

Aşığın sinəsi ləldi, gövhərdi,
Yendirsən, sındırar ləli daş daşa.
Aşıq hiddətiynən girsə gərdişə,
Layiq deyil qeyrisiynən daşdaşa.

Əsil aşıq özün oda yandırsa,
Həqiqəti anlayana qandırsa,
Aşıq səni qeyri halda dindirsə,
Layiqdi, sal oda, yandır ataşa.

Fətulla da özün saldı dərinə,
Can qurban eylədi dostun sərinə.
El borcunu yaxşı yetir yerinə,
Əyləşənlər desin əhsən, yüz yaşa.

## MEYDANI

Aşıq gərək ələ ala sazını,
Çala sinəsində, süzə meydanı.
Həqiqət kəlməsi dilində əzbər,
Qalmaya məəttəl, üzə meydanı.

Qəvvas olan ləl çıxardar dəryadan,
Bənna olan himi qazar binadan,
Aşıq odu, sözü əzbər sinədən,
Cəvahir kəlməylə düzə meydanı.

Fətullaya kömək olsun ərənlər,
Mərd igiddir mətləbini verənlər.
Mənəm-mənəm deyib, cəhlə girənlər,
Deyə, qabaq verdim sizə meydanı.

## GÖZƏL

Bir ah çəksəm, dağı-daşı əridər,
Bəsdi, zinət verdin camala, gözəl.
Hər baxanda od salarsan könlümə,
Dəhanın batıbdı xub bala, gözəl.

Şirinsən dünyada hər bir gözəldən,
Vərqadan, Gülşadan, Yusif-Kənandan,
Yanağın lalədi, olubdu xəndan,
Möhtacam ağ üzdə o xala, gözəl.

Qədrini bilənsən gövhər, zərin də,
Qızılgül əlində, cığa sərində,
Ağlın, huşun, söz-söhbətin yerində,
Afərin səndəki kamala, gözəl.

Əhvalım pozulub, halım pərişan,
Eşqindən ürəyim olubdu şan-şan,
Çəkirəm həsrətin, bilginən pünhan,
Bir yol rəhmin gəlsin bu hala, gözəl.

Nagah aldın Fətullanın canını,
Yox kimsəsi, ala səndən qanını.
Almısan əlimdən din-imanımı,
Döndərdin qəddimi sən dala, gözəl.

## ZÜLFLƏRİN

Bir ala gözlüyə nəzər eylədim,
Darayıb töKübdü yana zülflərin.
Halqa-halqa, dəstə-dəstə, çinbəçin,
Yaxşı düzüb dal gərdana zülflərin.

Gecə-gündüz gözüm gəzdi, aradı,
Ah çəkməkdən bağrım başı yaradı.

Gecəm sitəmlidi, günüm qaradı,
Döndərib könlümü qana zülflərin.

Fətulla hər cövrü-cəfaya dözər,
Nazı-qəmzələrin bağrımı üzər.
Bəxtəvər başına, sinəndə gəzər,
Arayar, axtarar şana zülflərin.

**BƏNZƏR**

Sevdiyim, bənzərsən Misir şahına,
O kaman qaşların hilala bənzər.
Düz on dörd gecəlik Aydı camalın,
O şəhla gözlərin piyala bənzər.

Buxağında əlvan-əlvan gülləri,
Vardır mənim kimi çox bülbülləri.
Məzədi ləbləri, şirin dilləri,
Bu qəndi-şəkərə, o bala bənzər.

Bir sənsən, özgəyə gəlmir gümanım,
Sirrim, həm sirdaşım, dinim, imanım.
Fətullayam, sənsən əzəli-canım,
Sən getsən, işlərim zavala bənzər.

**DODAQ-DODAĞA**

Bahar fəsli, gül mövsümü gələndə,
Ötüşər bülbüllər, qonar budağa.
İki həsrət bir-birini qucanda,
Qoyarlar ləb-ləbə, dodaq-dodağa.

Pünhan-pünhan danışarlar, gülərlər,
Şümşad bilək, şana barmaq, gül əllər,
Qaydadı, gözəldən dilək diləllər,
Aşıqlar dilinə olmaz qadağa.

Fətullah eşqindən şirin güləndə,
Hərdən yar yanına pünhan gələndə,
İşarətlə dərdi-dilin biləndə,
Canım olsun belə dosta sadağa.

## ALLI QIZ

Xətrinə dəyməsə, bir söz deyərəm,
Zər-ziba geyinən yaşıl, allı qız.
Ətirli buxağın gül qönçəsidi,
Ləbi şirin, dodaqları ballı qız.

Ürəyim açılar, olsan mənə yar,
Çıxar bu könlümdən, gedər qəm-qubar.
Eşqindən olubdu dünya mənə dar,
Şirin dil, şirin söz, xoşxəyallı qız.

Fətulla aşıqdı, ilqarda düzdü,
Oxların sinəmdə əllidi, yüzdü,
Başına döndüyüm, ay alagözlü,
Ağ buxağı dənə-dənə xallı qız.

## İSTƏR KÖNLÜM

Baharın xoş fəsli güllər açanda,
Nərgiz, bənövşəli yaz istər könlüm.
Tovuz tamaşalı, tərlan duruşlu,
Qəmzəsi can alan qız istər könlüm.

Dindirsən can deyə, cana can düzə,
Hər vaxt aşiqinin cəbrinə dözə.
Yanaqlar piyalə, dodaqlar məzə,
Onda işvə, qəmzə, naz istər könlüm.

Könlüm bir pay dilər sinəndə nardan,
Camalın ötədi yaylaqda qardan.
Bil ki, əl çəkmərəm vəfalı yardan,
Yarınan qolboyun gəz, istər könlüm.

Sevdiciyim, bürünmüsən ala sən,
Bu sınıq könlümü alsan ələ sən.
Götürüb qələmi alsan ələ sən,
Mən deyim, dərdimi yaz, istər könlüm.

Fətulla mayıldı cığalı telə,
O qaymaq dodağa, o şirin dilə.
Xoş yeriyə, xoş danışa, xoş gülə,
Bu nişanlar onda düz istər könlüm.

## YAN BARI

Bemürvət, beinsaf, əl çək zülümdən,
Şərik ol dərdimə, alış, yan barı.
Məcnunam, üzündən gəzirəm düzdə,
Soruş bu dərdimi, sən də qan barı.

İnsafdımı, aşıq düşsün çöllərə,
Car etdim vəsfini cəmi ellərə.
Salmışam meylimi qönçə güllərə,
Eyləmə bülbülü bağrıqan, barı.

Uca dağ başını qucan qar olar,
Bülbülün qisməti ahu-zar olar,
Qönçənin ətrini çəkən xar olar,
Olma seyraqubla mehriban, barı.

Ötüşən bülbüllər qonar budağa,
Bir canım var, olsun yara sadağa.
İnsaf əhli dözə bilməz bu dağa,
Eyləmə könlümü pərişan barı.

Fətullanın canı olubdu yarı,
Tərlansan, qoynuna almaynan sarı.
Mən əziz tutaram əhdi, ilqarı,
Az eylə aşiqi imtahan, barı.

## DAĞ-DAĞA

Dolandım dünyanı, gəzdim hər yanı,
Görürsənmi, söykənibdi dağ dağa.
Mən aşiqəm, dağ-dağa,
Söykənibdi dağ dağa.
Fələk vurub sinəmə,
Çalın-çarpaz dağ-dağa.
Binadan ki əsli gözlü olmaya,
Başa gəlməz, söykəyəsən dağ dağa.

Mən tərpəndim, hafis oldum bəladan,
İrəbbim-İrəsmim qövrü bəladan.
Mən aşığam, bəladan,
Oxu dərsin bəladan,
O qədər ki narındı,
Deyən, içib bəladan.
Hər gül gözəl olmaz, çıxsa taladan,
Çalın-çarpaz olar baxsan dağ-dağa.

Fətulla da dərsin alıb Əbğətdən[1] ,
Oxuyubdu lam içində Əbğətdən,
Mən aşiqəm, Əbğətdən,
Oxu dərsin Əbğətdən,
Eşq oduna yanan gül,
Gərək keçsin Əbğətdən.
Aşıqlıq işində sözdən, sənətdən,
Köksündə dağ ola, dura dağ-dağa.

*1. Əbğət - əbcəd nəzərdə tutulur*

## BEHBUD ALIYEV
*(1916-1975)*

***Behbud Bəşir oğlu Alıyev 1916-cı ildə Dərələyəz mahalının İstisu kəndində anadan olub, mühitin sayılıb-seçilən söz adamlarından biri kimi tanınıb. İbtidai təhsilini dogma kəndində alıb, daha sonra Cul kəndində davam etdirib. Mahalın müxtəlif kəndlərində müəllim, hesabdar köməkçisi, ferma müdiri, kolxoz sədri vəzifələrində çalışıb. Xalq arasında aşıq kimi tanınıb.***

***Dərələyəz mahalının toy, şənlik məclisləri daha çox onun iştirakı ilə keçirilib. Aşıq Haqverdi, Aşıq Bəhman, Aşıq Fətulla ilə sıx sənət əlaqələrində olub. Dastan söyləmə bacarığı, şirin ləmsi, məclis ədəb-ərkanı ona xüsusi hörmət qazandırıb.***

***Aşıq Behbud İkinci dünya müharibəsinin iştirakçısı olub. Müharibə zamanı 1942-ci ildə Tiflisdə zabit kursunu bitirib, cəbhədə səhra komandiri, kapitan kimi döyüşlərdə iştirak edib. Şeirləri bölgədə dillər əzbəri olub.***

***Aşıq Behbud 1975-ci ildə vəfat edib.***

### AĞSU

Yenə gəldi bahar fəsli,
Qonaq gəldik sənə, Ağsu.
Çiriş ilə bənövşəni,
Yığdıq dənə-dənə, Ağsu.

Axar suyun süddən ağdı,
Dörd bir yanın dərə-dağdı.
Nə qədər ki canım sağdı,
Gəl ol mənə ana, Ağsu.

Ötür torağay quşların,
Göyərib yal-yamacların,
Yenə gəlir sirdaşların,
Qapına mehmana, Ağsu.

Bir tərəfin Arpaçayı,
Gözəllikdə yoxdu tayı.
Üç ay yazı, üç ay yayı,
Bənzəyirsən xana, Ağsu.

Muradtəpədi bir yanı,
Neçə dərdlərin dərmanı,
Behbud, həm Nərimanı,
Gətirdin imana, Ağsu.

## GETDİ

Bulaq üstə duran qızın,
Saçları xurmadı, getdi.
Mətləb istədim diləyəm,
Söhbətə durmadı, getdi.

Gəlməsin qada-bəlaya,
Camalın oxşatdı Aya.
Sailəm, gəlmişdim paya,
Payımı vermədi, getdi.

Bilmirəm eşqin sirrini,
Qoynunda yumru görünü,
Qoşa narından birini,
Mənə də qıymadı, getdi.

Behbudun uçub tərlanı,
Canımdan əzizdi canı,
İstədim olam qurbanı,
Qurbanı görmədi, getdi.

## NECOLDU

Səndən xəbər alım, ay Muradtəpə,
Səndə dövran sürən canlar necoldu?
Yamaclardan gül-çiçəyin dərənlər,
At oynadan növcavanlar necoldu?

Gahdan bürünürsən yaşıla-ala,
Yaylağında gəzən dəli, məst ola.
Buludtək tökəndə zülfünü dala,
Şahmar zülfün yan açanlar necoldu?

Bahar fəsli ağır keçir toyların,
Qıj-qıj edir boz-bulanıq çayların,
Gəzdim oylağını, yoxdu toyların,
Durna telli məhtəbanlar necoldu?

Payız düşüb, yenə üzün bozarıb,
Dörd yanımı duman, çiskin, çən alıb.
Köçüb ellər, yurdun-yuvan boş qalıb,
Ağ sürülü xan çobanlar necoldu?

Behbudun qəlbindən çox qanlar axır,
Qalmayıb nə sürü, nə də ki naxır.
Ayrılıq çağları yandırıb-yaxır,
Dağ oynadan pəhləvanlar necoldu?

## SAZIMDI

Məclis-mərəkəni şövqə gətirən,
Əlimdə çaldığım telli sazımdı.
El içində xeyir işlər bitirən,
Əlimdə çaldığım telli sazımdı.

Sınıq könülləri abad eyləyən,
Vəfalı dostları şən, şad eyləyən,
Həqiqəti, düzü isbat eyləyən,
Əlimdə çaldığım telli sazımdı.

Gecə-gündüz arifləri güldürən,
Dost-aşnanı şirin dillə dindirən,
Aşiqlərin ürək sözün bildirən,
Əlimdə çaldığım telli sazımdı.

Döyüş meydanında mərdana duran,
Cəbhələr dağıdan, ordular yaran,
Axır mənzilə də Behbudla varan,
Əlimdə çaldığım telli sazımdı.

## DÖZƏSƏN GƏRƏK

Osman qağa[1], ocağına gəlmişəm,
Ad-sanına, sorağına gəlmişəm,
Sarıyerdən Şahdağına gəlmişəm,
Mənim bu dərdimi yazasan gərək.

Vurğundan[2] qalmısan bizə yadigar,
Səndə cəsarət var, səndə ürək var.
Zəngəzur, Dərələyəz, nə qədər nə var,
Meydanda nər kimi qızasan gərək.

Behbud deyir, Haqqa tutdum üzümü,
Köçürtdüm kağıza ürək sözümü.
Babalardan öyrənmisən dözümü,
Mənim də cəfama dözəsən gərək.

***1. Osman Sarıvəlli nəzərdə tutulur***
***2. Səməd Vurğun nəzərdə tutulur***

## GÖYÇƏ MAHALI

Car çəkirəm, səsim düşsün hər yana,
Şairlər ocağı Göyçə mahalı.
Hörməti var gələn əziz mehmana,
İgidlər oylağı Göyçə mahalı.

Kəsir qonağına əmlik quzunu,
Yazıram, deyirəm sözün düzünü,
Dədə Ələsgərin ustad sözünü,
Yayır ölkələrə Göyçə mahalı.

Ürəkdən sevirəm Miri qardaşı,
Dilimin əzbəri, ürək sirdaşı,
Yolunda qurbandı Behbudun başı,
Pozulmaz növrağın, Göyçə mahalı.



## MEHDİ MEHDİYEV
*(1923-2003)*

***Mehdi Ataş oğlu Mehdiyev 1923-cü ildə Qərbi Azərbaycanın Dərələyəz mahalının Herher kəndində anadan olub. Uşaq yaşlarından saza-sözə həvəs göstərib, dayısı Aşıq Fətullanın yanında şəyird olub, sənətin sirlərini öyrənərək aşıqlığa başlayıb. Bir müddət dayısı ilə birgə məclislər aparıb. Sonra müstəqil aşıq kimi mahalın şənliklərində iştirak edib, Göyçə, Naxçıvan, Qarabağ aşıqları ilə sıx təmasları olub.***

***Mehdi Mehdiyev İkinci dünya müharibəsində iştirak edib. 1948-ci il deportasiyası zamanı dogma yurdunu tərk edib – Tərtər rayonunun Səhləbad kəndinə köçürülüb.***

***O, Naxçıvanda müəllimlər institutunu bitirib, fizika-riyaziyyat müəllimi kimi pedaqoji fəaliyyət göstərib.***

***Xalq arasında Aşıq Mehdi kimi tanınıb, elin-obanın məclislərini aparıb. Şeirləri dövri mətbuatda, ayrı-ayrı toplularda nəşr olunub. "Qurban olum torpağına, daşına" və "Deyirdin ölərəm sənsiz" adlı kitabları işıq üzü görüb.***

***O, ustadların yaradıcılığını, dastan repertuarını yüksək səviyyədə mənimsəyib. Söz, sənət biliciləri arasında onunla bağlı çoxlu əhvalat və hekayətlər dolaşmaqdadır.***

***Aşıq Mehdi 2003-cü ildə Tərtər rayonunun Səhləbad kəndində vəfat edib.***

### DAĞLAR

Saysız igid yola salıb,
Özü təkcə qalan dağlar.
Ağ örpəyin örtən kimi,
Matəm marşı çalan dağlar.

Bilinməyir yaşın sənin,
Əyilməzdir başın sənin,
Vüqarlıdır daşın sənin,
Payız oldu, solan dağlar.

Murad təpə yaylağından,
Çobanların oylağından,
Gözəllərin bulağından,
Məni ayrı salan dağlar.

Mehdi baxıb, səni süzdü,
Məcnun kimi, Leyli gəzdi.
Duman gəldi, dodaq büzdü,
Gah boşalıb, dolan dağlar.

## O DAĞLARIN

Dolaylardan axıb gələn,
Bulağıyam o dağların.
Ellərinə nəğmə deyən,
Dodağıyam o dağların.

El şənliyi olsa haçan,
Saz götürüb, söhbət açan,
Məclislərə işıq saçan,
Çırağıyam o dağların.

Beçə balın, yağın süzən,
Köz üstünə kabab düzən,
Dövrəsində çoban gəzən,
Ocağıyam o dağların.

Göylərində şimşək çaxan,
Qayasından qartal baxan,
Sinəsindən sular axan,
Qucağıyam o dağların.

Duman kimi qalxıb gedən,
Çaylar kimi axıb gedən,
Mehdi deyər: baxıb gedən,
Qonağıyam o dağların.

## QOYNUNDA-QOYNUNDA

Mərd igidlər sürər səfa
Dağlar qoynunda-qoynunda.
Toy-büsatlı gözəl həyat,
Dağlar qoynunda-qoynunda.

Mehribandı qonaqları,
Xoşa gələn yaylaqları,
Lilpar gözlü bulaqları,
Dağlar qoynunda-qoynunda.

Dan ulduzu açar səhər,
Üz bürüyər səndə ülkər.
Çadırların olub şəhər,
Dağlar qoynunda-qoynunda.

Doğdu günəş, gül oynadı,
Sazımdakı tel oynadı,
Mehdi çaldı, el oynadı,
Dağlar qoynunda-qoynunda.

## DÜŞDÜ

Dərələzin, güvəndiyim
Torpağına zəhər düşdü.
Çəmənimə bələndiyim
Torpağına zəhər düşdü.

Çəmən-xalça oylağının,
Ellər düşən yaylağının,
Suyu sərin bulağının
Torpağına zəhər düşdü.

Dağlarımın lalasının,
O Salsalın qalasının,

Ceyran, cüyür balasının
Torpağına zəhər düşdü.

Mehdi deyər, kəkliklərin,
Meşədəki əliklərin,
Balbas quzu əmliklərin
Torpağına zəhər düşdü.

## SÜZƏ-SÜZƏ

Ağ dumanlar zirvələrdə
Yallı gedir, süzə-süzə.
Qüzeylərin sinəsinə
Muncuq taxır düzə-düzə.

Bulaqları axarlıdır,
Yaylaqları baxarlıdır.
Ləpələri ovxarlıdır,
Dənizlərdə üzə-üzə.

Mən Mehdini dilləndirir,
Tavar sazı telləndirir,
Məclisləri gülləndirir,
Mağarları gəzə-gəzə.

## KƏKLİK

Yalçın qaya-daşda durub,
Qaqqıldayır ana kəklik.
Qüdrətindən bəzəklidir,
Ayağında xına kəklik.

Yeri yalçın qayalıdır,
Qanadları cunalıdır,
Ayaqları xınalıdır,
Dimdik batıb qana kəklik.

Əzəldən vurğunam sənə,
Xoş səsindi müjdə mənə.
Mehdi deyər, dönə-dönə,
Oxu daşda, sona kəklik.

## SAXLA

Aqil maclisində, natiq yanında,
Yersiz demə, danışmağa söz saxla.
Mübtəlası olma varın-dövlətin,
Dostun olsa, ilqarını düz saxla.

Arı kimi pətəyində bal qazan,
Sərsəm olma, el-obada xal qazan,
Könül qırma, zəhmət çəkib mal qazan,
Dalaşanda barışmağa üz saxla.

Namərd adamların yorğunu olma,
Suyun axarı ol, durğunu olma,
Hər yetən gözəlin vurğunu olma,
Fitnə qaşlarına baxma, göz saxla.

Süfrə aç, çörək ver, xəsis utandır,
Qananın qulu ol, qanmazı qandır.
Ocaqlar söndürmə, ocaqlar yandır,
Qar-boranlı günlərinə köz saxla.

Sərvətin olsa da, qumara qoyma,
Şeytana aldanıb, tumara uyma,
Mehdinin sözlərin əfsanə sayma,
Pisləri at, yaxşıları yaz, saxla.

## OLMAZ

Dəli könül, demə dünya mənimdir,
Ömür karvanını əyləmək olmaz.
Hər yetən gədəyə sirdaşdı deyib,
Sir sözünü ona söyləmək olmaz.

Ürəkdən xaini, qəlbiqaranı,
Qəlbimi bürüyən kədər-boranı,
Sinəmə vurulan yaman yaranı,
Vaxtı yetişməmiş teyləmək olmaz.

Mehdi də canını odlara yaxdı,
Çevrildi dövranı, çevrildi taxtı,
Əcəl yastığına dayanan vaxtı,
Əzraili aldadıb, piyləmək olmaz.

## GÜLƏRMİŞ

Ürəkdən xainə, qəlbi qaraya,
Ariflər kəc baxıb, mahal gülərmiş.
Mərdin məclisinə namərd gələrsə,
Müxənnət həcv deyib, naqqal gülərmiş.

Məcazi mənalı nakəs bir bəndə,
Utanmaz-utanmaz düşür hər kəndə.
Gördüyü işlərə, tutduğu fəndə,
Şeytan fitnə verib, baqqal gülərmiş.

Namusu yedəkdə vara çəksələr,
Mehdini yandırıb nara çəksələr,
Aslanı zəncirdə dara çəksələr,
Tülkü meydan açıb, çaqqal gülərmiş.

## AŞIQ ƏLİ FƏRMANOĞLU
*(1923-1999)*

***Əli Fərman oğlu Kərimov 1923-cü ildə Dərələyəz mahalının Terpi kəndində anadan olub. Xalq arasında Aşıq Əli kimi tanınıb. Onun atası 1937-ci ildə siyasi dustaq kimi Sibirə sürgün olunub.***

***Aşıq Əli 1942-ci ildə İkinci dünya müharibəsinə yola düşüb və 1947-ci ildə ordudan tərxis olunub. Müharibədən sonra aşıqlıq sənətini davam etdirib, elin-obanın ağır toy şənliklərini aparıb. Dərələyəzdə, Naxçıvanda, Şərurda, Ordubadda, Şahbuzda ağır məclislər keçirib. Aşıq Cəlil, Aşıq Haqverdi, Aşıq Bəhram və s. kimi ustadların sənət ənənəsini bölgədə davam etdirib.***

***Qərbi Azərbaycandan 1948-ci deportasiyası zamanı Salyan rayonunun Qarabağlı kəndinə köçürülüb, sənətini orada davam etdirib.***

### NAXÇIVAN

Hayana baxırsan güldü, çiçəkdi,
Səfalı yaylaqlı, dağlı Naxçıvan.
Bağ-bağçada güllər ləçək-ləçəkdi,
Almalı, heyvalı bağlı Naxçıvan.

Tarixlərə baxsan, böyük adın var,
Şairin, alimin, çox övladın var,
Cəlilin, Cavidin, Ordubadin var,
Min şeirli, yüz dastanlı Naxçıvan.

Sədərəkdən düş, gəl Şərura sarı,
Tale bəxş eyləyib meyvəni, barı.
Qışda qovurması, motalı, şoru,
Qaymaqlı, pendirli, yağlı Naxçıvan.

Batabatı gözəl, xoş mənzərəli,
Enişli, yoxuşlu, düzlü, dərəli,
Nanəli, yarpızlı, acıtərəli,
Cəlilə, Cavidə bağlı Naxçıvan.

Əliyəm, deyirəm sözün düzünü,
Ordubad meyvəsi, Şahbuz üzümü,
Hər yerdə söylərlər sənin sözünü,
Qəlbim də səninlə bağlı, Naxçıvan.





## HƏMİD AĞAMALIYEV
*(1925-1986)*

***Həmid Məmmədbağır oğlu Ağamalıyev 1925-ci ildə Dərələyəz mahalının Kotanlı kəndində anadan olub. Erkən yaşlarından sənətə meyil göstərib.***

***Aşıq Həmid sənətin sirlərini babası Aşıq Adıgözəldən öyrənib. Ağsaqqalların söyləməsinə görə, səsi dayısı Aşıq Surxayın səsinə bənzəyib. Saz havalarının məharətli ifaçılarından biri kimi, tanınıb. O, yaradıcı aşıq olub, müxtəlif səpkili poetik örnəkləri bölgə aşıqlarının repertuarında özünə yer alıb.***

***Aşıq Həmid də ermənilərin təqiblərindən yaxa qurtarmaq üçün Şərur rayonuna köçüb, orada məskunlaşıb, burada bir müddət aşıqlar ansamblına rəhbərlik edib.***

***Aşıq Həmid 1986-cı ildə Şərur rayonunun Yenikənd kəndində dünyasını dəyişib.***

### DAĞLAR

Məğrur olan qartalların,
Ağ çalmandı zirvə qarın,
Səndən köçsə dostun, yarın,
Qəlbim sızlar, mələr, dağlar.

Hər qayanın min sirri var,
Hər daş altda tarix yatar.
Hər yaz quşlar qatar-qatar,
Sənə qonaq gələr, dağlar.

Həm əzəmət, həm hünərsən,
Bahar gəlcək təzə-tərsən,
Bir gün məndən üz döndərsən
Aşıq Həmid ölər, dağlar.

## VƏTƏN DARDADI, DARDADI

Şahinlərim, qanadlanın,
Vətən dardadı, dardadı.
Yaraqlanın, tez atlanın,
Vətən dardadı, dardadı.

Azğınlara qan uddurun,
Başlarına toy tutdurun,
Adlarını unutdurun,
Vətən dardadı, dardadı.

Canımızdan keçək gərək,
Qanımızdan keçək gərək,
Bu yolda and içək gərək,
Vətən dardadı, dardadı.

Nəğmələri bayquş ötər,
Bağ-bağçada qanqal bitər,
Mənlik itər, qeyrət itər,
Vətən dardadı, dardadı.

Nə sızla, nə də ah eylə,
Öz gücünə pənah eylə,
Həmid, sazı silah eylə,
Vətən dardadı, dardadı.

## BİLƏRSƏN

Əziz dostum, sən Şərurun qiymətin,
Mehman olmaq üçün gəlsən, bilərsən.
Gəzib qarış-qarış hər torpağını,
Bəhrəsin əlinlə dərsən, bilərsən.

Sən də vurğunu ol halal zəhmətin,
Burda oğlan mətin, burda qız mətin.
Əhmədin, Yusifin şanın-şöhrətin,
Yaxından danışıb görsən, bilərsən.

Dəyişib donunu Şərurun zaman,
Gəl, söz sal İsadan, Həlməxatından.
Həmid tək yurdumun abadlığından,
Şeir çələngini hörsən, bilərsən.

## OLMUSAN

Gördüm gözlərini, kövrəldim yenə,
Məhzun, lal baxışın dərd oldu mənə.
Kimin gücü çatar ürək deyənə,
Qəlbimin təşnəsi, odu olmusan.

Nə deyim fələyin fitnə-felinə,
Qərq edib eşqimi tilsim gölünə,
Bu yazıq, vəslinə həsrət dilinə,
Min bir qıfılbəndli cadu olmusan.

Bir zaman qəlbimin həmdəmi idin,
İlk eşqin naminə bir də danış, din,
Vəfasız, nə oldu, Aşıq Həmidin,
İndi ən uzağı, yadı olmusan.

## VƏTƏN, BİZƏ SƏN ƏMR ELƏ, ƏMR ELƏ

Göylərində qara bulud oynaşır,
Vətən, bizə sən əmr elə, əmr elə!
Yağı düşmən qarışqa tək qaynaşır,
Vətən, bizə sən əmr elə, əmr elə!

Qucağında yaşamaqdan doymarıq,
Adi qara daşına da qıymarıq.
Torpağını tapdanmağa qoymarıq,
Vətən, bizə sən əmr elə, əmr elə!

İnam olsa, gül açdırrıq kolunda,
Birləşərik, güc olarıq qolunda,
Sinəmizi sədd edərik yolunda,
Vətən, bizə sən əmr elə, əmr elə!

Həvəsliyik yaratmağa, qurmağa,
Gözütoxuq, ilişmərik qarmağa.
Həmid deyər, keşiyində durmağa,
Vətən bizə sən əmr elə, əmr elə!



## MƏMMƏDTAĞI CƏFƏRQULU OĞLU
*(1925-1998)*

***Məmmədtağı Cəfərqulu oğlu Məmmədov 1925-ci ildə Dərələyəz mahalının Hors kəndində anadan olub. Mühitin qaynar sənət ahəngi onun parlamasında böyük rol oynayıb. Güclü yaddaşı, şeir duyumu, sənət marağı ilə ustadların nəzər-diqqətini cəlb edib. Dərələyəz aşıqlarının şeirlərini, dastan söyləyiciliyini mənimsəyib.***

***Aşıq sənətinə xüsusi maraq onun Göyçəyə gəlib çıxmasına səbəb olub. Sənətin sirlərinə daha çox Göyçə mahalının Daşkənd kəndində yiyələnib. Sallılı Aşıq Mirzalı ilə Dərələyəzdə, Şərurda, Naxçıvanda məclislər keçirib.***

***Yaradıcı təbi onun aşıq şeirinin müxtəlif şəkillərində poetik örnəklər yaratmasına əsas olub. Sənət bilicilərinin yaddaşında şeirlərindən örnəklər bu gün də özünə yer almaqdadır.***

***Qərbi Azərbaycandan 1988-ci il deportasiyası zamanı dogma yurdu tərk edərək, əvvəlcə Şərura köçüb, sonra isə Bakıda məskunlaşıb.***

***Aşıq Məmmədtağı 1998-ci ildə Bakıda vəfat edib.***

### QALDI

Elin gedir, ağla dağlar,
Dağlar, səndə izim qaldı.
Hüsnündən heç vaxt doymadım,
Dağlar, səndə gözüm qaldı.

Bizim dağın yolu dalda,
Bulud oynar sağı-solda,
El-obanın gözü yolda,
Dağlar, səndə izim qaldı.

Süsən-sünbülün sinəndə,
Nərgiz, bənövşə çəməndə,
Məmmədtağı, saz sinəndə,
Deyilməmiş sözüm qaldı.

## YOXDU

Dəli könül, nə gəzirsən,
Bağçaların bağı yoxdu.
Didərginin bu günündə
Qapısını açan yoxdu.

Çoxlarına bel bağladım,
Sazla qəlbləri dağladım.
Vətənimçün çox ağladım,
Haya güllə çaxan yoxdu.

Tağıyam, nədi günahım,
Ərşə dayanıbdı ahım,
Kimsədən yoxdu pənahım,
İndi dada çatan yoxdu.

## VAR MƏNİM

Ay ellər, eşidin ana yurdumda,
Gül-çiçəkli bağça-bağım var mənim.
Yurdum Dərələyəz cənnət diyarda
Tükənməyən cah-cəlalım var mənim.

Ərəb at üstündə gəzirdim dağı,
Dostuma dost oldum, düşmənə yağı.
Ermənilər çəkdi qəlbimə dağı,
Onlara çəkəsi dağım var mənim.

Ermənilər nələr gətdi başıma,
Zəhər qatdı mənim bişmiş aşıma.
Dərd çəkməkdən ağ tük gəldi başıma,
Qərib yerdə bir cüt balam var mənim.

Aşıq Tağı, deyin, indi neynəsin?
Xəncər çəksin, ermənini teyləsin.
Bir canı var, yurda qurban eyləsin,
Bu yürüşə qeyrət-arım var mənim.

## NƏSİB MUSAOĞLU
*(1926-1973)*

***Nəsib Musa oğlu 1926-cı ildə Dərələyəz bölgəsinin Qovuşuq kəndində anadan olub. Orta təhsilini də həmin kənddə alıb. Mahalın zəngin söz-sənət ruhu, ustadların apardığı ağır məclislər onun istedadının parlaması üçün əsas olub, Nəsibin özü də müəyyən poetik örnəklər yaratmağa başlayıb.***

***Nəsib Musa oğlu İkinci dünya müharibəsinin iştirakçısı olub. Müharibədən qayıtdıqdan sonra Göyçənin İnəkdağı kəndində Aşıq Qənbərin yanında şəyird olaraq ondan sənətin sirlərini öyrənib. Ustadı ilə birgə Göyçədə, Dərələyəzdə, Naxçıvanda məclislər aparıb. "Sarıtel", "Dilqəmi", "Kərəmi", "Misri" və s. havaların mahir ifaçısı kimi tanınıb.***

***Yaradıcı aşıq olan Nəsib Musa oğlunun rəngarəng mövzularda poetik örnəkləri mühitin saz-söz bilicilərinin dilində əzbər olub.***

***Aşıq Nəsib 1973-cü ildə vəfat edib.***

### BİZƏ DOĞRU

Novruz da baharın ilk nişanıdır,
İstəyirik gəlsin yaz bizə doğru.
Könül parvazlanıb qalxsın havaya,
Aşıqlar da çalsın saz bizə doğru.

Sevgili sevgiyə eyləyir nazi,
Hacı bir-birindən qalır irazı,
Məhəbbət bürüyüb çölləri, düzü.
Yazılır ilqarlı söz bizə doğru.

Gətirib bağçalar çiçəkli barı,
Açıb üzümüzə xoş rüzigarı,
Azadlıq həsrəti çəkən diyarım,
Onu da döndərsin tez bizə doğru.

Açıb ana-bacı qolun, qanadın,
Ucaldır dünyada Vətənin adın,
Sevib, seçilməyə səs verən qadın,
Edir işvələrin, naz bizə doğru.

Aşıq Nəsib, sənin söhbətin, sazın,
Bürüyür elləri coşqun avazın,
Əlindən qaşı at şeytanın izin,
Açılsın könüllər düz bizə doğru.





## AŞIQ ŞÜKÜR
*(1927-2006)*

***Şükür Əli oğlu Məmmədov 1927-ci ildə Dərələyəz mahalının Terp kəndində anadan olub. Aşıq Haqverdi, Aşıq Bəhman, Aşıq Fətulla, Aşıq Mehdi, Aşıq Əli və s. kimi sənətkarlarla sənət bağlantıları olub. Saza-sözə erkən yaşlarından xüsusi maraq göstərib. Yaradıcı təbi, coşqun sənət eşqi onun sənətkar kimi formalaşmasında mühüm rol oynayıb.***

***Qurbani, Abbas Tufarqanlı, Abdalgülablı Valeh, Xəstə Qasım, Aşıq Alı, Aşıq Ələsgər, Aşıq Cəlil kimi ustadların yaradıcılığına mükəmməl şəkildə bələd olub.***

***Qərbi Azərbaycandan 1948-ci il deportasiyası zamanı dogma yurd-yuvasını tərk etmək məcburiyyətində qalıb, zorla Salyan rayonunun Qarabağlı kəndinə köçürülüb. Az bir zaman içərisində burada da sənəti ilə camaatın sevimlisinə çevrilib, məlahətli səsi və ifaçılıq qabiliyyəti ilə sevilib-seçilib.***

***Aşıq Şükür 2006-cı ildə vəfat edib.***

### BAYATILAR

Əzizim, yüz də var,
Əlli də var, yüz də var,
Öpməli yanaq gördüm,
Diksinməli üz də var.

Əziziyəm, keçdi məndən,
Ox dəydi, keçdi məndən.
Mərdlərə körpü oldum,
Namərdlər keçdi məndən.

Əzizinəm, yüz qandı,
Əlli qandı, yüz qandı,
Qanana canım qurban,
Qanmayanı yüz qandır.

## OLMASA

Quzu neyləyər damğanı,
İnsanlar xain olmasa.
Günün keçər ahı-vayla,
Yarın öz tayın olmasa.

Quş qəfəsdən çıxa bilməz,
Su göllənsə, axa bilməz,
Namərd mərdi yıxa bilməz,
Yatıb arxayın olmasa.

Qopsa tufan, əssə külək,
Dizdə qüvvət, davam gərək.
Elsiz olsan, qalarsan tək,
Köməyin, hayın olmasa.

Bələd oldun belə sözə,
Ağır ellər gəzə-gəzə.
Dost-tanışın baxmaz üzə,
Əlində payın olmasa.

Aşıq Şükür, dostu ara,
Qəmlər səni çəkər dara.
Tərlan könlün dönər sara,
Arxanda elin olmasa.

## DÜNYA

Dünya, insafsızsan əzəldən bəri,
Namərdi yemlədin mərd baxa-baxa.
Yaxşını yaşatdın zillət içində,
Apardın məzara dərd baxa-baxa.

Fəryada baxmayıb, üz tutub getdin,
İgidlər başına çox oyun gətdin.
Varlıya diz çökdün, yaltaqlıq etdin,
Kasıbın üzünə sərt baxa-baxa.

Pələng bəndə düşüb ahı-vaydadı,
Pişik meydan açıb, şir nə haydadı,
Fələyin işidi, bu nə qaydadı,
Şeş yekə uduzur nərd baxa-baxa.

## AŞIQ TALIB
*(XX əsr)*

***Aşıq Talıb Dərələyəz sənət çevrəsinin sayılıb-seçilən aşıqlarından olub. İyirminci yüzillikdə yaşayıb-yaradıb. Haqqında təfərrüatlı məlumat yoxdur. Yaradıcı istedadı, güclü sənət duyumu ilə mühitdə tanınıb. Aşıq Cəlil, Aşıq Haqverdi və s. kimi ustad sənətkarların ona böyük təsiri olub.***

***Göyçə, Dərəçiçək, Naxçıvan və s. aşıqları ilə sıx təmasları onun həmin bölgələrin də sənət ənənəsini mənimsəməsinə imkan verib. Yaradıcı aşıq kimi müxtəlif səpkili bədii nümunələr düzüb-qoşmağa da xüsusi meyil göstərib. Rəngarəng mövzularda yazdığı gəraylı, qoşma, təcnisləri və s. bunun bariz nümunəsidir.***

### OLDU

Ağla, könül, sızla, könül,
Maya xanım gedər oldu.
Daha bir də sağalmaram,
Mənim dərdim betər oldu.

Yar olan arxa çevirdi,
Taxtımı yana devirdi.
Bu necə murad dövrüdü,
Gəldi, mənə kədər oldu.

Talıb, kimə gümanın var,
Dağsan, başda dumanın var.
Sənin ahın-amanın var,
Qazandığın kədər oldu.

## GEDİR

Alış indən belə, yan indən belə,
Ay könül, sevdiyin xar alıb gedir.
Yalçın qayalara get döy başını,
Gədə igid kimi yar alıb gedir.

Kasıblıq odunda tutuşan sönməz,
Ər ölər, əyilməz, nadana enməz.
Bir sənsən üstümdə, gözəgörünməz,
Tərlanın şikarın sar alıb gedir.

Talıb, nə yatmısan, mal qazanginən,
Sərinə sevdanı al, qazanginən.
Əlləş, çalış, vuruş, öl – qazanginən,
Gözəllər malını var alıb gedir.



## AŞIQ ABDULLA
*(XX əsr)*

***Dərələyəz aşıq mühitinin sayılıb-seçilən sənətkarlarından olub. İyirminci əsrin qaynar söz-sənət ahəngi onun bir aşıq kimi yetişməsinə şərait yaradıb. Erkən yaşlarından sənətə maraq göstərib, ustadların çalıb-çağırması, el-oba məclislərində söylədiyi əhvalatlar onun bacarıq və qabiliyyətinin üzə çıxmasında böyük rol oynayıb.***

***Ağ Aşıq, Aşıq Alı, Aşıq Ələsgər, Aşıq Cəlil, Daşkəndli Nəcəf, Növrəs İman, Aşıq Əsəd və s. kimi ustadların zəngin sənət ənənəsinə köklənib, özü də gəraylı, qoşma yazıb. "Aşıq Qərib", "Abbas və Gülgəz", "Qul Mahmud", "Nəcəf və Pərizad" və s. kimi dastanlar repertuarında üstünlük təşkil edib.***

### AŞIQ

Meydandakı bir uşaqdı, giribsən meydana, aşıq,
Deyirsən, əla iş tutdum, olubsan mərdana, aşıq,
Nə deyim ki, anlayasan, sən gələsən, dona aşıq,
Qansızlığın yayma elə, bu yerdən dörd yana, aşıq!

İşin olmasın uşaqla, nə sözün var, mənə buyur,
Qızışıbsan, göz təpəndə... Düşüb işə çəkə, aşıq.
Vurağan öküzlər kimi, fısıldayıb önə, buyur,
Hirs qaraldar sifətini, verməz xeyir cana, aşıq!

Abdulla deyilən mənəm, tanıdınmı daha məni,
Xəstə yataqda yatırdım, çıxarırsan dağa məni.
Fikrin budu öldürəsən, tez bükəsən ağa məni,
Aşıq odu, dərd anlaya, sənətkarı qana, aşıq!

## KİMİ

Yellənirsən elə-belə, mollanın əbası kimi,
Cibin elə genişdi ki, tiyançı torbası kimi.
Adın bəllidi hamıya, kəndin ən qabası kimi,
Od tutubsan, ataşdasan sən Allaha ası kimi.

İşin nədi, gücün nədi, ona-buna tənə demək,
Səninki iş görmək deyil, tərpətməkdi çənə, demək.
Zəhərli sözlərin birbaş şamil olub mənə, demək?
Qolun uzundu, ay aşıq, çobanın yabası kimi.

Sənə bir gəliş gələrəm, yanılarsan öz yolunu,
Azıb qalarsan dərədə, tapammazsan öz yolunu,
Ağlın azıb havalısan, gedəmmirsən düz yolunu,
Abdulla yandırar səni, qışın sərt havası kimi.

## AFƏRİN

Ayrılıram, yana-yana ağlama,
Vallah, dünya belə qalmaz, Afərin.
Verən tanrı, bəndə kimdi neyniyə,
Yaxşı günü Allah almaz, Afərin.

Bəla tutub, od düşübdü hər yana,
Kövrək könül ha alışa, ha yana.
Fürsət düşüb müxənnətə, xayına,
Göydəkini yada salmaz, Afərin.

Abdullayam, iraq ollam elimdən,
Ayırırlar çiçəyimdən, gülümdən.
Telli sazım daha çıxdı əlimdən,
Bir də onu kimsə çalmaz, Afərin.

## YAVAŞ-YAVAŞ

Kimin gəlinisən, kimin qızısan,
Bələnir dodağa bal yavaş-yavaş.
Bu qərib aşığa qaynadı qanın,
Sürüşdü başından şal yavaş-yavaş

Özün əhli-halsan, bəstədi boyun,
Məni də yandırdı alovun-odun.
Nəzərə gələrsən, bəd gözdən yayın,
Yaşmağı dodaqdan sal yavaş-yavaş.

Aşıq Abdullayam, sinəm dağlıdı,
Eşqim daşa dəyib, qolum bağlıdı.
Deməynən bu aşıq qaş-qabaqlıdı,
Düşməsin qəlbinə xal yavaş-yavaş.

## XALOĞLU

Bir gün seyraqubdan bir söz eşitdim,
Meyl edirsən heyva-nara, xaloğlu.
Deyirlər ki, çox aşiqsən məşuqa,
Bel bağlama dilivkara, xaloğlu.

Göydən dul adına enə bir pəri,
Nə sözü düz olar, nə də ilqarı.
Yadına düşəndə qabaqkı əri,
Başlayacaq ahu-zara, xaloğlu.

Sən içən şərabdan mən də içmişəm,
İndi peşman olub, başa düşmüşəm.
Sənə baxıb, mən bir dükan açmışam,
Həsrət qaldın xiridara, xaloğlu.

Abdulla da desin sözün düzünü,
Qonaqlıqda göstərəcək özünü.
Daha burda qurtarıram sözümü,
Çəkmə özün bərkə, dara, xaloğlu.

## MİRZALI MİRZƏYEV
*(1929-1992)*

***Mirzalı Əziz oğlu Mirzəyev 1929-cu ildə Dərələyəz mahalının Sallı kəndində anadan olub. Erkən yaşlarında atasını itirdiyindən yaxınlarının himayəsində yaşayıb. Yüksək yaradıcı təbi, söz-sənət duyumu, səsi onu aşıqlığa gətirib çıxarıb.***

***Orta məktəbi mahalın Qovuşuq kəndində bitirib. Babası Aşıq Cəlilin sənətini yaşatmağa üstünlük verib və Sallı Aşıq Qulunun yanında şəyird olub. Xalq arasında məlahətli səsi ilə sayılıb-seçilib. Zəngin söz-sənət yükü ilə tez bir zamanda bölgədə məşhurlaşıb. Ustadı Aşıq Qulu ilə birgə məclislər aparıb.***

***Qərbi Azərbaycandan 1948-ci il deportasiyası zamanı Salyan rayonunda məskunlaşıb. Salyanda bir müddət yaşadıqdan sonra, buranın havası səhətində problemlər yaratdığına görə, Naxçıvana köçmək məcburiyyətində qalıb. Naxçıvanda Aşıqlar Birliyinin sədri (1965) olub.***

***Aşıq Mirzalı 1970-ci ildə Tərtər rayonunun Qaynaq kəndinə köçüb.***

***Aşıq Mirzalı 1992-ci ildə vəfat etmişdir.***

### VAR

Doğru tanı məni, hakim,
Ellər sevən sənətim var.
Həqiqətdən söz açanda,
Dürlü gövhər qiymətim var.

Zülməti çox görür gözüm,
Daha tükənibdi sözüm.
Haqsız işə necə dözüm,
Nə dövlətim, sərvətim var?

Şeytanlar bərədə yatdı,
Müstəntiq məni aldatdı,
Mirzəliyəm, baxtım yatdı,
Oyatmağa minnətim var.

## QALMADI

Yüz iyirmi dörd min peyğəmbər getdi,
Fani dünya Süleymana qalmadı.
Kərəm yandım dedi, Fərhad dağ çapdı,
Məcnun Leyli dedi, bir kam almadı.

Kimi var topladı, kimisi ağıl,
Kimi söz gəzdirdi, kimisi nağıl,
Kimi qız bəslədi, kimisi oğul,
Kimisinə övlad qismət olmadı.

Yüz ağıl neyləsin bir yatan baxta,
Baxtın oyanarsa, çıxarsan taxta.
Ağılsız baş, vallah, saxtadı, saxta,
Saxta ağıl boş kəlləyə dolmadı.

Çoxunun qisməti gəldi çətindən,
Barsızlıq yaxşıdır el töhmətindən.
Çoxu var topladı el sərvətindən,
Axır getdi, heç kəs yada salmadı.

Çoxların sınadım, daşdı ürəyi,
Hesaba almayan duzu, çörəyi.
Mirzəli, çoxları etdi diləyi,
Qəvvas olub, dəryalara dalmadı.

## ARASINDA

Özün gör yarını, özün danışdır –
Belə bir misal var el arasında,
Dostlar sadiq olar, qohum mehriban,
Olmasa hərcayi dil arasında.

Ömür bəzəyidi bir vəfalı yar,
Hər şeydən üstündür vicdan, düz ilqar.

Pak bir gülüstana qona bilməz xar,
Bülbül seyr eyləyər gül arasında.

Mirzəli, burada çəksən də zillət,
Çalış, qardaşa da eyləmə minnət.
Qərib ellər dönüb olsa bir cənnət,
El-obana qayıt, qal arasında.

## HƏSRƏT

Qollarım da bağlı, yolum da bağlı,
Xəstə könlüm qalıb dağlara həsrət.
Gecə yuxum yoxdu, gündüz qərarım,
Tükənib gözyaşım, ağlara həsrət.

Nə deyim dövrana, nə deyim vaxta,
Umud qalmayıbdı o yatan baxta.
Dövran puç olubdu, insanlar saxta,
Keçirdiyim gözəl çağlara həsrət.

Mirzəli, mərdlərə məhəbbət bəslə,
Alacaq cəzasın, kim dursa qəsdə.
Bülbül kimi nalə çəkib qəfəsdə,
Bağçalara həsrət, bağlara həsrət.

## AŞIQ

Mərd ilə çörək ye, mərd ilə əyləş,
Namərdin yanında qalma, ay aşıq.
Əsli-kök olandan əmanət istə,
Sonradan görəndən alma, ay aşıq.

Tale düz gətirə gərək əzəldən,
Ətir gəzmə payız tökən xəzəldən.
Etibar gözləmə yetən gözəldən,
Eşqin ürəyinə salma, ay aşıq.

Mirzəli, gizlətmə xoş avazını,
Sədaqətə çatdır öz murazını,
Ruhları oxşayan telli sazını,
Qanmazın yanında çalma, ay aşıq.

## OĞUL

Vəsiyyət yüngüllük, həm də şəfadır,
Dünya cəfasına aldanma, oğul!
Nə qədər çox olsa dostun, sirdaşın,
Nəbadə, heç kəsə inanma, oğul!

Hər gözələ uyma, onlardan yan keç,
Ömür şərbətinin zülalından iç.
Əvvəl nəslin yoxla, sonra zatın seç,
Nacins bedasıla calanma, oğul!

Əvvəldən belədir dünyanın işi,
Daim qarşıdadı eniş-yoxuşu.
Əvvəldən fikirləş tutduğun işi,
Heç kəsin yanında utanma, oğul!

Etibar eyləmə dosta, qohuma,
Nalayiq işləri heç vaxtı yuma.
Dünya vəfasızdır, yatma, uyuma,
Çalış, şöhrət qazan, yubanma, oğul!

Haqqın yazısından tapsan da xata,
Kəsmə umudunu, düşsən zülmata.
Bir qohum ki, səni dar gündə ata,
Tez uzaqlaş ondan, dayanma, oğul!

Mirzəli tanıyır mərd insanları,
Zəhmətinlə topla dövləti, varı.
Talan gördüm haqsız var yığanları,
İbrət al onlardan, talanma, oğul!

## YAXŞIDIR

Namərd dünyasında, bic əyyamında,
Sirrini saxlasan pünhan, yaxşıdır.
Həqiqi, düz sözlər isbata keçmir,
Namərdə söyləsən yalan, yaxşıdır.

Ağır gündə etibarsız qohumdan,
Biqeyrət qohumdan, arsız qohumdan,
Açıq-aşkar xeyir-karsız qohumdan,
Qaniçən bir qəddar düşmən yaxşıdır.

Mirzəli, axtarma həqiqət dostun,
Səsin öz qəlbindi, sədaqət dostun,
Hərcayı, saxtakar, bimərfət dostun,
Yükləsən belinə palan, yaxşıdır.

## DİLİNDƏDİR

Mərifətli, qabiliyyətli insanın,
Hər zaman layiqli söz dilindədir.
Hər kim dönüb olsa bir od, bir alov,
Özünü yandırar, köz dilindədir.

Hərcayı danışan bimürvət insan,
Hörməti, izzəti birdəfəlik qan,
Söyüşlər yağdırıb, desən də hədyan,
Onun dadı-tamı öz dilindədir.

Unutma qəlbində söz yaraşığın,
Çətindi, görəsən namərd işığın.
Mirzəliyəm, vətən sevən aşığın,
Daim güllü bahar, yaz dilindədir.

## İRƏVANDADIR

Əslimi, nəslimi soruşan qardaş,
Ömrümün növrağı İrəvandadır.
Birgə xalqı niyə iki bölürsən,
Nəslimin sorağı İrəvandadır.

Yersiz-yerli deyib, seçən xalqımın,
Dost yolunda candan keçən xalqımın,
Öz elində qərib düşən xalqımın,
Yanan çıl-çırağı İrəvandadır.

Göyçə bir mahaldır – şair oylağı,
Səs salıb, dünyaya düşüb sorağı,
Aşıq Ələsgərin qaynar bulağı,
Şeir güllü bağı İrəvandadır.

Bir cənnət bağıdır bil, Dərələyaz,
Ormanı, oylağı gül Dərələyəz,
Namusda, qeyrətdə Cul, Dərələyəz,
İgidlər yığnağı İrəvandadır.

Bir zaman gəzmişəm dağda, aranda,
Çox sinə gərmişəm qarda, boranda,
Yayın istisində bürkü vuranda,
Aranın qonağı İrəvandadır.

## EYLƏR

Yazıq kasıb comərdlikdən dəm vurar,
Varını paylayar, bir ülfət eylər.
Varlı xəsisliklə milyona çatar,
Bir varı çıxanda, bir il fət eylər.

Leyli nahar çağırıram, ay ağa,
Vətənimdə büküləydim ay ağa,
Namərd günahsızı salar ayağa,
Mərd günah bağışlar, mərhəmət eylər.

Mirzəliyəm, tükənibdi qanım az,
Nəf eylərəm, bu dünyada qanım az,
Nakəs vəzifədə qohum tanımaz,
Ömür kitabında bir qələt eylər.

**ETDİM**

Əvvəldən haqsızsan, ay qoca dünya,
Sən necə dəhşətli nahaq qan etdin.
Mərdləri eylədin namərdə möhtac,
Nakəs gədaları firavan etdin.

Haqqı gəzən, fəda edən canını,
Dağıtdın onun da xanımanını,
Şeytanların dəyişdirdin donunu,
İslam aləmində müsəlman etdin.

Könül sarayını alıbdı duman,
Aldanma fənaya, ey aqil insan,
Külli baharımı eylədin duman,
Yazıq Mirzəlini imtahan etdim.

**MƏNİ**

Varsa da ölümüm, möhlət ver, Allah,
O min bir adına bağışla məni.
Qazamatda yatan məsum bəndədi,
Özün sal yadına, bağışla məni.

Cəbrayıl da ərş üzündə dayandı,
Cavab verəmmədi, şapəri yandı.
Yetmiş il dəryada günlərin sandi,
Onun ustadına bağışla məni.

Özün sağalt Mirzəlinin yarasın,
Unuda bilmirəm imamət yasın.
O qolları kəsik Həzrət Abbasın,
Ahu-fəryadına bağışla məni.

## PAŞA QƏHRƏMANOĞLU
*(XX əsr)*

***Paşa Qəhrəman oğlu Dərələyəz mahalının Hors kəndindəndir. Bölgənin ustad sənətkarı olan Aşıq Qəhrəmanın ailəsində dünyaya gəlib. İyirminci yüzilliyin əvvəllərində anadan olub. Erkən yaşlarından saza həvəs göstərib və atasından sənətin sirlərini öyrənib. Aşıq Qəhrəmanın evi söz-sənət bilicilərinin ocağı olduğundan Aşıq Paşa ustad sənətkarların oxu ləmsini, məclis ədəb-ərkanını görüb-götürüb və bölgənin dastan söyləyiciliyinə xüsusi həssaslıq nümayiş etdirib. Yaradıcı sənətkar kimi tanınıb, müxtəlif biçimlərdə maraqlı poetik örnəklər yaradıb. Zil, məlahətli səsi olub, Zəngəzurda, Dərələyəzdə, Şərurda, Vedibasarda, Göyçədə sazı-sözü ilə tanınıb. "Koroğlu havaları"na repertuarında xüsusilə üstünlük verib. "Qul Mahmud", "Aslan şah", "Seydi və Pəri", "Əmrah", "Aşıq Qərib" dastanlarının mahir söyləyicisi kimi yaddaşlarda qalıb.***

### HÜRÜ

Bir yemişi alıb kəsdim bu yalda,
İnsaf deyil, Paşa qalsın xəyalda.
Dediyin ammanı tapdım bu yolda,
Sən də bil ki, məndə hünər var, Hürü!

Telli haqda sən öyrətdin elini,
Mənə çox işlətdin fəndi-felini,
Canına qıymaram, şirin dilini,
Ya əqrəb dişləsin, ya da mar, Hürü!

Yazıq Paşa cavanların mərdidir,
Məni öldürən sən Hürünün dərdidir.
Sən dediyin baramanın qurdudur,
Üç girvəngə tənbəkimi ver, Hürü!

## GÖYÇƏ AŞIQLARI

***"Kitabi-Dədə Qorqud" boylarında adı keçən Göyçə Azərbaycan türklüyünün ən saf bölgələrindən biri olduğu üçün, orada saz-söz sənəti həmişə güzəranın ayrılmaz tərkib hissəsi olmuş və ulusun mənəvi yaşam sistemində aparıcı mövqeyə yiyələnmişdir.***

***Göyçə aşıq mühiti Azərbaycan aşıq sənətinin təkkə ocağı əsasında intişar tapan qanadına daxildir. "Miskin Abdal ocağı" adıyla pir, ziyarətgah səviyyəsinə qalxan məşhur sufi-dərviş ocağının Göyçədə qərar tapması bunu söyləməyə tam əsas verir.***

***"Miskin Abdal ocağı"nın güclü mənəvi-ürfani zəmini, bununla belə, həm də Güney Azəbaycandan gələn Ağ Aşıq Allahverdi kimi ustadların yaratdığı sənət iqlimi ilə şəkillənən Göyçə aşıq mühitində neçə-neçə istedadlı aşıqlar yetişib. Bu mühit Azərbaycan aşıq sənətinə Məmmədhüseyn, Aşıq Alı, Aşıq Ələsgər, Aşıq Məhərrəm Alçalı, Aşıq Musa Zodlu, Şişqayalı Aşıq Aydın, Aşıq Əziz, Usta Abdulla, Əbdüləzim, Növrəs İman və başqa onlarla nəhəng sənətkar bəxş edib. Bu sıradan Ağ Aşıq Allahverdi, Aşıq Alı və Aşıq Ələsgər xətti boyundakı sənət şəcərəsi təkcə Göyçənin deyil, bütövlükdə Azərbaycan aşıqlığının inkişafında mühüm tarixi rol oynamışdır.***

***Göyçə mühiti söz yaradıcılığı ilə yanaşı bəstəçiliklə – biri-birindən gözəl və təravətli saz havaları yaratmaqla da şöhrətlənmişdir. "Göyçəgülü", "Göyçə qaragözü", "Göyçə gözəlləməsi", "Köhnə Göyçə", "Məmmədsöynü" ("Heydəri"), "Nəcəfi" və başqa bu qəbildən olan onlarla saz havası Göyçə sənətkarlarının barmaqlarından qopmuşdur. Göyçə aşıq mühitində pərvəriş tapan həmin havalar az sonra Azərbaycanın bütün aşıq mühitlərinə yayılmış və aşıqların musiqi repertuarında möhkəmlənmişdir. Bundan əlavə, digər mühitlərdə yaranan bir çox saz havalarının cilalanmasında da Göyçə aşıqları özünəməxsus sənətkarlıq məharəti göstəmişlər.***

***Göyçə aşıq mühiti 1988-ci ildə Azərbaycan türklərinin zorla dədə-baba yurdlarından çıxarılması nəticəsində dağılmaq məcburiyyəti qarşısında qalmışdır. Qaçqınlıq, didərginlik məşəqqətləri çəkən Göyçə sənətkarları pərakəndə şəkildə Gəncə, Göygöl, Şəmkir, Daşkəsən, Şamaxı, Sumqayıt və Bakı ərazilərində məskunlaşmışlar.***

## BAYATILAR

Bu bulaq nurlu bulaq,
Qüdrətdən nurlu bulaq.
Qazaxda Şingar gözəl,
Göyçədə Dürlü bulaq.

***

Eləmi, Göyçə dağı,
Ucadı Göyçə dağı.
Ölüncə gedən deyil,
Sinəmin Göyçə dağı.

***

Göyçədən gələn varmı?
Dərdini bilən varmı?
Şahdağı nalə çəkir,
Gözyaşın silən varmı?

***

Ağac dibi sərindi,
Yu dəsmalı, sər indi.
Çıxdım dağlar başına,
Göyçə gölü göründü.

***

Göyçədi elim mənim,
Çəmənim, çölüm mənim.
Göyçə desəm od tutar,
Ağzımda dilim mənim.

***

Əzizim, yola bir də,
Yamaca, yola bir də.
İçəydim Ağbulaqdan,
Çıxaydım Yala bir də.

***

Əzizim, Göyçə dağı,
Göyçəkdi Göyçə dağı.
Ölüncə gedən deyil,
Sinəmdən Göyçə dağı.





## MİSKİN ABDAL
*(XVI əsr)*

***Miskin Abdal Göyçə mahalındakı məşhur Sarıyaqub sufi-dərviş ocağının qurucusu sayılır. Gerçək adının Hüseyn olduğu söylənilir. XVI əsrdə Ərdəbildən Qafqaza gələn missioner-dərviş aşıqlardan biridir. Kəramət sahibi kimi tanınıb, aşıq tərzində şeirlər düzüb-qoşub. Onun kəramət sahibi olması Şah İsmayıl Xətayinin imzası və möhürü ilə 1515-ci ildə təsdiq olunub. Bu sənəd Miskin Abdal şəcərəsinə mənsub olan nəslin indiki nümayəndələri tərəfindən qorunmaqdadır.***

***"Miskin Abdal" rəmzi-məcazi ad-titulu ilə Səfəvi-qızılbaş dünyagörüşünü çeşidli areallarda təbliğ edən sufi şeyxi Göyçə-Gədəbəydən sonra Qazax-Şəmsəddin mahalında, daha sonra Dağıstanda missioner fəaliyyətlə məşğul olub. Onun Dağıstandan sonra Anadoluya getdiyi də rəvayət olunur. XIX əsrin ustad sənətkarlarından olan Aşıq Musa Ağkilsəli "Miskindən başlamış Abbasa qədər cəmi aşıqların kanı məndədir" - qənaətini heç də təsadüfən dilə gətirməmişdir.***

***Miskin Abdalın zəngin yaradıcılığı günümüzə qədər gəlib çatmamışdır. Aşıqların repertuarında az bir hissə özünə yer alıb.***

### YOL VERMƏDİM

Xoşbəyanlıq virdim oldu, böhtana yol vermədim,
Şirin süxən əndəlibəm, hədyana yol vermədim.
Nifrin edib, lənət dedim xainə, iblislərə,
Qəlbimi ayna saxladım, nadana yol vermədim.

Bir bəşəri incitmədim, özümü şah saymadım,
Dostun sirrini söyləyib, dildən-dilə yaymadım,
Ömür qısa, dünya əzəl, çox yaşadım, doymadım,
Dürr mətaha meydan açdım, tək cana yol vermədim.

Aşıq olub, dərs alanlar söz desin sözüm kimi,
Miskin Abdal, məğrur istə hamını özün kimi,
Arifi, mətləb qananı bilirəm gözüm kimi,
Sinəm üstən mərd yeridi, şeytana yol vermədim.

## NƏDİR?

Tərs düşüb fələyin işi,
Lil basan arxdımı, nədir?
Fani dünyanın gərdişi,
Dolanan çarxdımı, nədir?

Qalanıb küfrün kürəsi,
Yanırsan gözüm görəsi,
Tutulub yolun yörəsi,
Bir bilən yoxdurmu, nədir?

Miskin Abdal, işin xata,
Ünün gedib, ərşə çata,
On iki ay müdam yata,
Görgünən baxtdırmı, nədir?

## DAĞLAR

Məğribdən Məşriqə səf çəkib durub,
Qüdrətdən çəkibdi baş-başa dağlar.
Qoynunda mehmandı şahi-mərdanım,
Yanaşı qarıyın siz qoşa, dağlar.

Ağ çeşmən sərindən car eylər seli,
Yaşıl tirmə geyər, qurşanar beli.
Dağıstan kölgəsi, zabitə yeli,
Sərin səfalıdı həmişə dağlar.

Nəs illərdən satın aldın nəs günü,
Çağırdın dumanı, tökdün çiskini,
Gözüyaşlı qoydun cüda Miskini,
Eylə gülə-gülə tamaşa, dağlar.

## GEDƏR

Guşə-guşə yanıb, nara yaxıldım,
Cismim od-atəşə qalanıb gedər.
İmtahan eyləyər könlüm şəhrini,
Eşqi-Haqqdan qeyri talanıb gedər.

Dərviş olan getməz fitnə-feliynən,
Yandırar şamını o, öz əliynən,
Yalan peymanıynan, haça diliynən,
Könül yar yolunda allanıb gedər.

Qeylü-qaldır səhər-axşam əhvalım,
Tor görür gözlərim, qarışır halım,
Qanlı çeşmi yazıq Miskin Abdalın,
Coşğun çaya nisbət sellənib gedər.



## AŞIQ ƏLİQULU
*(XVII-XVIII əsrlər)*

***Aşıq Əliqulu XVII əsrin sonları XVIII əsrin birinci yarısında Göyçədə yaşayıb-yaratmışdır. Miskin Abdal ənənələrini davam etdirən aşıq-şair kimi tanınıb. Göyçə aşıq mühitinin inkişafında Aşıq Əliqulunun da böyük xidmətləri olub. Vaxtında toplanıb yazıya alınmadığından şeirlərinin çoxu günümüzə gəlib çatmayıb.***

### QORXURAM
*(divani)*

Qorxum yoxdur qeyri kəsdən, bir Allahdan qorxuram,
Yaranmışam, abı-atəş, xaki-baddan qorxuram.
İxtiyarım ağamdadı, məndə bu hicran qəmi,
Sığınmışam pənahına, qibləgahdan qorxuram.

Sidq ürəkdən diləyim var, dərdə eylə sən dərman,
Həm atasan, qul kafasan, hökmün aləm-fərmanı,
Xudamın aslanısan, mənəm adın qurbanı,
Pirin özünə rəhm eylə, bəd günahdan qorxuram.

Əliquluyam, axtarıram, yol-ərkan ondadı,
Bir zərrənin mən biriyəm, cismi-canım ondadı.
İsmi Heydər nökəriyəm, ruhum, qanım ondadı,
Ədalətdi kərəm kanı, nuru şahdan qorxuram.

## BİZDƏDİR
*(divani)*

Şükür olsun bir Allaha, adil divan bizdədir,
İlqar, iman, dini-məzhəb, yol-ərkanı bizdədir.
İstəmirəm, o məzhəb dindən çıxa xaric ola,
Məhəmmədə nazil olan ayə, Quran bizdədir.

İncil İsaya gəlibdi, Tövrat Musaya eydir,
Quran gəldi Məhəmmədə, gəl bir öyrən, bunu bil.
Dörd çeşmədən tonqar çıxdı, həqiqətdən oldu göl,
Girməginən, qərq olarsan, dərya-ümman bizdədir.

Göydən dörd kitab endi, Məhəmmədə Qurandı,
Şükür olsun bir Allaha, o, dardan qutarandı.
Qəm eyləmə, Əliqulu, ağan şahi-mərdandı,
Pənc əla, ali-əba, on iki imam bizdədir.



## AĞ AŞIQ
*(XVIII-XIX əsrlər)*

***Göyçə aşıq mühitində şöhrətlənmiş Ağ Aşıq XVIII əsrin ikinci yarısı XIX əsrin əvvəllərində yaşayıb. Əsl adı Allahverdi olan ustad sənətkarı rənginin ağlığına görə Ağ Aşıq adlandırmışlar. Əslən Mərənddən olduğu söylənilir. Göyçə aşıq mühitinin inkişafında müstəsna xidmətləri vardır. Aşıq Alı onun şagirdi olub. Onun həyatı xeyli dərəcədə əfsanələşib. Haqqında xalq arasında çoxlu əhvalatlar dolaşmaqdadır. Təsnif, gəraylı, qoşma, təcnis və s. çeşidli formalarda yaratdığı poetik örnəklər aşıqların repertuarında özünə yer alır. Şeirlərindən nümunələr ayrı-ayrı toplularda çap olunub, haqqında "Ağ Aşıq və Sənubər" dastanı yaranıb.***

### KƏKLİK

Baharın gülşən çağında,
Uçar daşdan-daşa kəklik.
Ovçu görsə, səkər asta,
Sinər daşdan-daşa kəklik.

Məskən salar qayalarda,
Özü göyçək boyalarda,
Gözdən iraq sayalarda
Çökər daşdan-daşa kəklik.

Süsənbərim göylər mahı,
Ağ Aşığın qibləgahı,
Əyir belim yarın ahı,
Bükər başdan-başa, kəklik.

## BELƏSİNƏ

İgid olsa elə arxa,
Can sadağa beləsinə.
Çörək verib, ala səxa,
Can sadağa beləsinə.

Dağlar başı qarlı gərək,
Bağça-bağlar barlı gərək,
İlqar özü varlı gərək,
Can sadağa beləsinə.

Göyçə gözəllik oylağı,
Güldür-çiçəkdir yaylağı,
Murğuz, Murov, Kəpəz dağı,
Can sadağa beləsinə.

## OLMAZ

Dedim, könül, bacar yaxşılıq eylə,
Həmişə əlində ixtiyar olmaz.
Çox da bel bağlama dünya malına,
Nə mala, nə mülkə etibar olmaz.

Ey nazənin, sən geydiyin nə aldır?
Yenə başındakı hansı xəyaldır?
Birisi büdrəsə qolundan qaldır,
Hər zaman dost dosta səbəbkar olmaz.

Aşıq oldun, hər ağrıya dözəsən,
Sinən üstə odlu közlər əzəsən,
Gündoğanla, günbatanı gəzəsən,
Allahverdi kimi xiridar olmaz.

## QAYITDI

Bir maral baxışlı, tərlan cilvəli,
Gəlib məni gördü, güldü, qayıtdı.
Pünhanı göstərdi gül camalını,
Buxağına şəbnəm doldu, qayıtdı.

Mən görmüşəm gözəllərin çoxunu,
Belə olmaz ancaq boyu-buxunu,
Müjganından çəkib xədəng oxunu,
Buxağına şəbnəm doldu, qayıtdı.

Gözləyərkən gözlərimə sataşdı,
Xəstə canım eşq oduna tutuşdu.
Şəhrayıdan qıya baxdı ötüşdü,
Ağ Aşığa nəzər saldı, qayıtdı.

## NƏ BİLƏR

Nadan məclisində, naşı yanında,
Ləl xırdala, gövhəri seç, nə bilər?
Bir damlanı sel anlayan qanmaza,
Bütün ümman, dəryanı keç, nə bilər?

Axtarsan da yerin yeddi qatını,
Hər kəs göstərəcək öz isbatını,
Namərdə bağışla köhlən atını,
Ya yolunda sən zəhər iç, nə bilər?

Özünü böyüdüb dağ edənlərə,
Şorunu ərinmiş yağ edənlərə,
Ağ Aşığın sözün ağ edənlərə,
Xəznədar ol, xəznəni aç, nə bilər?

## ÇƏTİNDİ

Libasnan, duruşnan, boyun-buxunnan,
İnsanı tanıyıb bilmək çətindi.
Qanannan-qanmaznan dolanmaq olar,
Yarımçığı başa salmaq çətindi.

Mətləbini söylə, mətləb qanana,
İşarə lazımdı arif olana.
Tərəqqidən tənəzzülə enənə,
Bəh-bəh deyib, qəh-qəh gülmək çətindi.

Allahverdi, işin yox fitnə-felnən,
İnsanı qarşıla şirin dilinən,
Ayrılma yoldaşnan, bir ol elinən,
El olmasa, tək ucalmaq çətindi.

## AYƏ MƏNDƏDİ

Bu gün seyraqıbdan bir söz eşitdim,
Bu, dostdan deyil, ayə, məndədi.
Dedim: Nədir sədrin, üstə bəslənən?
Dedi: Tifil ikən, ayə məndədi.

Sevdiciyim təzə geymiş buxara,
İnsafdımı, bülbül baxa bu xara,
Kəşt eylədim Bəsrə, Bağdad, Buxara,
İndi də gəlmişəm ay Yəməndədi.

Allahverdi pirdən içdi nə camı,
Nə axunddu, nə molladı, nə cami,
Nə Firdovsi, nə Hafizi, nə Cami,
Təcnis, sinədəftər, ayə məndədi.

## QIZILVƏNGLİ ALI
*(1800-1911)*

***Aşıq Alı Göyçə aşıq mühitinin ustad sənətkarlarından olub.***

***Göyçənin Kərkibaş kəndində Ağ Aşığa (Aşıq Allahverdiyə) on il şəyirdlik edib. Ərəb, fars dillərindən məlumatı olub, islam dəyərlərinə dərindən yiyələnib. Fitri istedadı, zəngin yaradıcılığı ilə aşıq ədəbiyyatına öz töhfələrini verib. Göyçənin tanınmış saz-söz ustadları onun yanında sənətin sirlərini öyrəniblər. Deyilənə görə, onun iyirmidən çox şagirdi olub. Aşıq Ələsgər kimi böyük ustad məhz onun yanında bir sənətkar kimi formalaşıb.***

***Aşıq Alı bir əsrdən çox ömür sürüb, təxminən 70-80 il çalıb-oxuyub, ağır məclislər aparıb, sazı-sözü ilə məclisləri zinətləndirib. "Aşıq Alının Osmanlı səfəri" dastan-rəvayəti dillər əzbəri olub.***

### YALVARIRAM

Sidqinən sığınmışam, sübhana yalvarıram,
Məhəmmədə tabe olub, Qurana yalvarıram.
Məzhəbimdi Cəfər Sadiq, qibləmdi Kəbəm mənim,
İlqarımda çox möhkəməm, imana yalvarıram.

Atdı şəhadət barmağın zəbun etdi Xeybəri,
Çəkəndə "Allahu-Əkbər"i qırdı yüz min ləşkəri,
Alimlərin ümidgahı, möminlərin sərvəri,
Şahi-Mərdan, Şiri-Yəzdan, mən ona yalvarıram.

Dar günümdü, dada yetiş, ədalət şahım mənim,
Ey böyük ümidgahım, sənsən pənahım mənim,
İsmimdi Aşıq Alı, çoxdur günahım mənim,
Günahkarı sən aparma divana, yalvarıram.

## OLDU

Yar yanında günahkaram,
Doğru sözüm yalan oldu.
Yeriş etdi qəm ləşkəri,
Könlüm şəhri-talan oldu.

Bax bu qaşa, bax bu gözə,
Yandı bağrım, döndü közə,
Keçən sözü çəkmə üzə,
Keçən keçdi, olan oldu.

Aşıq Alı sənə qurban,
Gəl eylə dərdimə dərman,
Əldən düşdü tülək tərlan,
Sar da kəklik alan oldu.

## OLMUR

Bizim elin gözəlinin,
Camalından doymaq olmur.
Boy-buxunu can alandı,
Ləbləri tək qaymaq olmur.

Əydi budaq bar əlindən,
Dağ zinhardı qar əlindən,
Eşq badəsin yar əlindən
Alsan, yerə qoymaq olmur.

Bir söz dedim yada, qandı,
Bu məkanda qada-qandı.
Sevmək nədi? Qadağandı,
El-obaya yaymaq olmur.

Aralıyam sirdaşımdan,
Həbibimdi ilk yaşımdan.
Alı doymur göz-qaşından,
Qeyrisinə uymaq olmur.

## GÖZÜMÜZ

Özgələrdən bizə xətər yetişməz,
Eyləməsək özümüzə özümüz.
Alışmışam öz oduma yanıram,
Qoy söykənsin gözümüzə gözümüz.

Bəhsə düşüb, əbəs yerə döyüşdük,
Qəlb sındırıb, qamət əyib öyüşdük.
Heç bilmədik, nə iş tutduq, əyişdik,
Düz gəlmədi sözümüzə sözümüz.

Qovğa günü mərd meydanda ər dini,
Alıyam, axtarram elin mərdini.
Leyli-nahar çəksin yarın dərdini,
Dürüst baxsın gözümüzə gözümüz.

## DOLANDIRIR

Ay ağalar, gəlin sizə söyləyim,
Yəqin bu dünyanı pul dolandırır.
Kəsilib məhəbbət, qalmayıb hörmət,
Dövlətli dalınca mal dolandırır.

O dünyanın şərbətindən içməyən,
Körpü salıb, üstdən karvan keçməyən,
Evdə arvadına sözü keçməyən,
Kənddə koxa olub, el dolandırır.

Aşıq Alı, halın oldu pərişan,
Ağ üzündə xalları var hər nişan.
Binamus qohumdan, namuslu düşman,
Öldürsə, qəbrimdə gül dolandırır.

## NƏ QALDI

Kəşt eylədim, bu dünyanı dolandım,
Əllini keçirdim, yüzə nə qaldı?!
Ayaq getdi, əl gətirdi, diş yedi,
Baxmaqdan savayı gözə nə qaldı?!

Ölüm haqdı, çıxmaq olmaz əmrdən,
İpək tora halqa salma dəmirdən.
Aydı, gündü gəlib keçir ömürdən,
Tələsirik, görən yaza nə qaldı?!

Hayana baxıram, hava məxşuşdu,
Gəzdiyim oylaqlar yadıma düşdü.
Bir gün eşidərsən Alı da köçdü,
Sındı telli sazı, tazanə qaldı.

## KÖÇƏCƏK

Qoca dünya çoxun yola salıbdı,
Köçən köçüb, köçməyənlər köçəcək.
Qafil, içmə bu gün əcəl şərabın,
İçən içib, içməyənlər içəcək.

Necoldu var üçün qanlar tökənlər?
Əziz canın al qumaşa bükənlər,
Unutmasın şərmü-xəta əkənlər,
Biçən biçib, biçməyənlər biçəcək.

Yazıq Alı, nə tez düşdün həvəsdən,
Sərraf olan seçər qızılı misdən.
Arif olan kəslər, yaxşını pisdən
Seçən seçib, seçməyənlər seçəcək.

## QAŞLARIN

Hilalidən sərih pürü qəmzəli,
Nədir, dürrü zəmanədi qaşların.
Tiri-xədənginə sədrim nişanə,
Bir nisbəti kamanadı qaşların.

Yanaqları parə Aya təşbehdi,
Səyyarəli bir səmaya təşbehdi,
Sərbazın dəstində yaya təşbehdi,
Səyaları hər yanadı qaşların.

Duruşu can alan çərxi-fələkdi,
Hifsində çeşmilər sanki mələkdi,
Alma canım, Alı nakamdiləkdi,
Nədən mənə kəc yanadı qaşların.

## TÜKƏZBAN

Sənsən qönçə dəhan, sərvi xuraman,
Yaraşırsan bağça, bağa, Tükəzban.
Bəyaz sinə, gözü şəhla, qaş kaman,
Müştaq oldum ay qabağa, Tükəzban.

Əsil şükufəsən on dörd yaşında,
Fəzl-fərasətsən qəlb sirdaşında,
Xəlq oldun həyalı, əqli başında,
Ürbənd salma al yanağa, Tükəzban.

Pür qəmidim qəfil qəza qədərdən,
Gördüm hüsnün, kənar oldum kədərdən,
İnsaf eylə, salma məni nəzərdən,
Yolundadı sər sədağa, Tükəzban.

Apardın əqlimi sahib simənbər,
Ahu çeşmiləri az yana döndər,
Etmə biganəlik, can əldən gedər,
Tab eyləməz yaşamağa, Tükəzban.

Yazıq Alı qəm dustağı yarandı,
Şəmsi qızmar, baqi qara arandı,
Köçhaköçdü, el yaylağa darandı,
Güzar eylə bizim dağa, Tükəzban.

## AY BELƏ SİNƏ

Sərraf eyni seyr eyləyə zibanı,
Nadan əsla bilməz ay bələsi nə?
Camalın şövqündən ay, gün xof edə,
Günəş bələsinə, ay bələsinə.

Sin içində oxumuşam ağa lam,
Yar sədrinə müqabildi ağ alam,
Əbcəd ilə qulluğunda "a" qalam,
Qul olam ilinən, ay bələsinə.

Aşıq Alı, çıx gülşənə, nərgiz dər,
Sərraf maya ağuşunda nər gizdər,
Olmaz tayı züleyxalar, nərgizdər,
Əsla yox kimsədə ay belə sinə.



## AŞIQ ƏLƏSGƏR
*(1821-1926)*

***Azərbaycan aşıq sənətinin nəhəng simalarından olan Aşıq Ələsgər 1821-ci ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olub. Dövrünün adlı-sanlı aşığı Qızılvəngli Aşıq Alıya beş il qulluq edərək ondan sənət dərsi alıb.***

***Gənclik illərindən öz mükəmməl sənəti və qüdrətli poetik istedadı ilə təkcə Göyçə mahalında deyil, Gəncə, Naxçıvan, Qarabağ, Qazax-Şəmşəddin, Borçalı-Tiflis, Dərələyəz, Çıldır-Ağbaba mahallarında da ad çıxaran Aşıq Ələsgərin saz-söz dühası hələ sağlığında ikən əfsanələşib.***

***Aşıq Ələsgər məktəb-mədrəsə təhsili almasa da, öz fitri istedadı sayəsində ərəb hürufatı və əbcəd hesabı ilə bağlı incəlikləri, Şərq poetikasına məxsus şeiriyyət qanunlarını, Qurani-Kərim və islam elminin dərinliklərini, təsəvvüf simvolikasını kifayət qədər mükəmməl şəkildə mənimsəyib. Yazı-pozu bilməsə də, şeirlərindən savad və dünyagörüşünün, fəlsəfi düşüncə tərzinin mükəmməlliyi açıq şəkildə görünməkdədir. Qüdrətli söz sərrafının gözəlləmə və ustadnamələrinin dillər əzbərinə çevrilməsində yüksək poetik sənətkarlıqla yaradılmış obrazlı canlandırma məharəti və elat danışıq koloritini əks etdirən xəlqi təqdimat manerası mühüm rola malikdir.***

***Aşıq Ələsgər 1926-cı ildə vəfat edib.***

### ENDİRİR

Ələstidən «bəli» deyən Sübhana baş endirir,
Məhəmmədə nazil olan Qurana baş endirir.
Özü birdi, adı minbir, vəhdətu əl-laşərik,
Əhli-mömin görə bilməz, pünhana baş endirir.

Ölməyincə bu sevdadan çətin dönəm, usanam,
Həqiqətdən dərs almışam, təriqətdən söz qanam.
Şahi-Mərdan sayəsində elm içində ümmanam,
Dəryaların qaydasıdır, ümmana baş endirir.

Biçarə Aşıq Ələsgər, olma elmə nabələd,
Danışanda doğru danış, sözün çıxmasın qələt.
Çox qazansan, az qazansan, beş arşın ağdı xələt,
Mal-dövlətə baş endirən əfsana baş endirir.

## YÜKÜM

Ələstidən "bəli" dedim, nə xoş kamaldı yüküm,
Beş gözəlin aşiqiyəm, vəsfi-camaldı yüküm.
Həm dərindi, həm dayazdı, həm acıdı, həm şirin,
Həmi dürdü, həmi gövhər, həm şəhdi-baldı yüküm.

Nütfəsindən əyri olan tez göstərər isbatın,
Hər ağac kökündə bitər, hər meyvə gözlər zatın.
Hərcayı hədyana sayar, naşı bilməz qıymatın,
Əhli-urfan məclisində gövhər misaldı yüküm.

Gəl ey biçarə Ələsgər, sığın şahi-Heydara,
Onun damənindən tutan yəqin ki, yanmaz nara.
Pirim özü nüsrət verdi, bu gün çıxdım bazara,
Sərrafısan, aç baxgınan, gör nə cəlaldı yüküm.

## YAYLAQ

Gözəllər seyrangahısan,
Görüm səni var ol, yaylaq!
Açılsın gülün, nərgizin,
Tamam mürğüzar ol, yaylaq!

Gözüm qaldı siyah teldə,
Bülbül öldü meyli güldə.
Kimsənəm yox qürbət eldə,
Sən mənə qəmxar ol, yaylaq!

Mən səni görəndən bəri,
Sinəm oldu qəm dəftəri.
Öldür Aşıq Ələsgəri,
Özün günahkar ol, yaylaq!

## DAĞLAR

Bir ay yarım nobahardan keçəndə,
Car olur köksündən sellərin, dağlar!
Çalxanır sonalar, çığrışır qazlar,
Zəmzəm zümzüməli göllərin, dağlar!

Hanı mən gördüyüm qurğu-büsatlar?!
Dərdiməndlər görsə, tez bağrı çatlar.
Mələşmir sürülər, kişnəşmir atlar,
Niyə pərişandı halların, dağlar?!

Necoldu köysündə yaylayan ellər,
Görəndə gözümdə car oldu illər.
Yığılmır üstünə türfə gözəllər,
Sancılmır buxağa güllərin, dağlar.

Hanı mərd iyidlər, boş qalıb yurdu?!
Səxavətdə Eldar nurəlanurdu.
Erkək kəsib, ağır məclis qururdu,
Şilən çəkilirdi malların, dağlar!

Gözəllər çeşməndən götürmür abı,
Dad vermir dəhanda kövsər şərabı.
Düşdü xaçpərəstlə bunt inqilabı,
Onunçün bağlandı yolların, dağlar.

Sarınərdən top-tüfəngin atılı,
Murov, Murğuz Şahdağına çatılı.
Bir əmliyin bir tümənə satılı,
Xəzəl oldu yenə pulların, dağlar!

Kəpəz, Murov, Qonur – gör neçə dağ var,
Üstünə nur yağsın, ay dəli Qoşqar.
Yayın ortasında yağdırırsan qar,
Səf çəkmir üstündə sərdarın, dağlar!

Elə ki, şər gəldi, qaraltdı qaşı,
Dumana qərq oldu dağların başı.
Düşəndə gürg[1] ilə kəlbin savaşı,
Uzun çəkir qeylü-qalların, dağlar!

Halıyam ellərin mən naləsindən,
Yatmırdılar bir-birinin bəhsindən.
İgid nərəsindən, güllə səsindən,
Dəyməmiş tökülür kalların, dağlar!

Həsənnənə, Həsənbaba qoşadı,
Xoşbulaq yaylağı xoş tamaşadı.
Arsız aşıq elsiz niyə yaşadı?!
Ölsün Ələsgər tək qulların, dağlar!

**DAĞLAR**

Bahar fəsli, yaz ayları gələndə,
Süsənli, sünbüllü, lalalı dağlar.
Yoxsulu, ərbabı, şahı, gədanı,
Tutmaz bir-birindən aralı dağlar.

Xəstə üçün təpəsində qar olur,
Hər cür çiçək açır, laləzar olur,
Çeşməsində abi-həyat car olur,
Dağıdır möhnəti, məlalı dağlar.

Yazın bir ayıdı, çox yaxşı çağın,
Kəsilməz çeşməndən gözəl yığnağın,
Axtarma motalın, yağın, qaymağın,
Zənbur çiçəyindən bal alı, dağlar!

Yayın əvvəlində dönürsən xana,
Son ayda bənzərsən yetkin bostana,
Payızın zəhməri qoyur virana,
Dağıdır üstündən cəlalı, dağlar!

***1. Gürg - qurd***

Gahdan çiskin tökər, gah duman eylər,
Gah gəlib-gedəni peşiman eylər,
Gahdan qeyzə gələr, nahaq qan eylər,
Dinşəməz haramı, halalı dağlar.

Ağ xalat bürünər, zərnişan geyməz,
Heç kəsi dindirib kefinə dəyməz.
Sərdara söz deməz, şaha baş əyməz,
Qüdrətdən səngərli, qalalı dağlar.

Köçər ellər, düşər səndən aralı,
Firqətindən gül-nərgizin saralı.
Ələsgər Məcnun tək yardan yaralı,
Gəzər səndə dərdli, nalalı, dağlar!

## DOLANIR

Axşam-sabah, çeşmə, sənin başına,
Bilirsənmi, necə canlar dolanır!?
Büllur buxaq, alma yanaq, ayqabaq,
Şahmar zülfü pərişanlar dolanır.

Afərin xudanın haqqı-sayına,
Camalları bənzər bayram ayına.
Belə gözəllərin xaki-payına,
Mənim kimi çox qurbanlar dolanır.

Gördüm gözəlliyin bizə bildirir,
Qaş oynadır, xəstə könlüm güldürür,
İşvəyü-nazıyla adam öldürür,
Qəmzəsində nahaq qanlar dolanır.

Məni qoca gördü, ürbəndin açdı,
Ala gözlərinə gözüm sataşdı,
Huş başımdan çıxdı, xəyalım çaşdı,
Mürği-ruhum asimanlar dolanır.

Adım Ələsgərdi, Göyçə mahalım,
Dolanım başına, mən dərdin alım,
Hüsnün şöləsinə xəstə xəyalım,
Pərvanədi, şəmistanlar dolanır.

## GÜLƏNDAM

Səni gördüm, əl götürdüm dünyadan,
Ala gözlü, qələm qaşlı, Güləndam!
Alma yanağına, bal dodağına,
Baxan kimi ağlım çaşdı, Güləndam!

Tovuz kimi şüx bəzənib durubsan,
Ala gözə siyah sürmə vurubsan,
Sağ ol səni, yaxşı dövran qurubsan,
Bu dünyanın sonu puçdu, Güləndam!

Heç demirsən Ələsgərim hardadı?
Səbəb nədi, gülün meyli xardadı?
Mənim gözüm qoynundakı nardadı,
Aşığa lütf etsən, xoşdu, Güləndam!

## SARIKÖYNƏK

Cilvələnib nə qarşımda durubsan,
Anam sənə qurban, ay Sarıköynək!
Mələksən, çıxıbsan cənnət bağından,
Heç kim olmaz sənə tay, Sarıköynək!

Doymaq olmur işvəsindən, nazından,
Fərə kəklik kimi xoş avazından,
Yel vurdu, ürbəndi atdı üzündən,
Elə bildim doğdu Ay, Sarıköynək!

Gözəlsən, tərifin düşüb mahala,
Zər kəmər yaraşır qaməti-dala,

Ləb qönçə, diş inci, yanağın lala,
Çəkilib qaşların yay, Sarıköynək!

Gərdənə yaraşır qızıl həmayıl,
Görənin ağlını eyləyir zayıl,
Həsrətin çəkənlər olubdu sayıl,
Yığır qapılardan pay, Sarıköynək!

Tuti dilli, sərvi boylu Salatın!
Yoxdu mərhəməti bu səltənətin,
Göndər gəlsin Ələsgərin xələtin,
Eyləmə əməyin zay, Sarıköynək!

## DÜŞDÜ

Çərşənbə günündə, çeşmə başında,
Gözüm bir alagöz xanıma düşdü.
Atdı müjgan oxun, keçdi sinəmdən,
Cadu-qəmzələri qanıma düşdü.

İşarət eylədim, dərdimi bildi,
Gördüm həm gözəldi, həm əhli dildi.
Başını buladı, gözündən güldü,
Güləndə qadası canıma düşdü.

Ələsgərəm, hər elmdən halıyam,
Dedim: sən dərdlisən, mən yaralıyam,
Dedi: nişanlıyam, özgə malıyam,
Sındı qol-qanadım, yanıma düşdü.

## KÖYNƏYİNƏ

Güləbatın qıyı tər sinən üstə,
Nə gözəl yaraşır, qız, köynəyinə.
Sinən Kəbə, köynək Kəbə örtüyü,
İzin versən, sürtəm üz köynəyinə.

Gözəl yaranıbsan qali-bəladan,
Yanağın göyçəkdi güldən, laladan,
Zərgər gül doğrasın zərin tiladan,
Əlindən gəldikcə düz köynəyinə.

Ələsgər də dost yolunda  sürünür,
Sinən üstə dərdə dərman görünür,
O köynəyə nar məmələr bürünür,
Onçu  qurban olluq biz köynəyinə.

## GƏRƏKDİ

Aşıq olub tərki-vətən olanın,
Əzəl başdan pür kamalı gərəkdi.
Oturub-durmaqda ədəbin bilə,
Mərifət elmində dolu gərəkdi.

Xalqa həqiqətdən mətləb qandıra,
Şeytanı öldürə, nəfsin yandıra,
El içində pak otura, pak dura,
Dalısınca xoş sədalı gərəkdi.

Danışdığı sözün qiymətin bilə,
Kəlməsindən ləlü-gövhər süzülə,
Məcazi danışa, məcazi gülə,
Tamam sözü müəmmalı gərəkdi.

Arif ola, eyhamından söz qana,
Naməhrəmdən şərm eyləyə, utana,
Saat kimi meyli Haqqa dolana,
Doğru qəlbi, doğru yolu gərəkdi.

Ələsgər haqq sözün isbatın verə,
Əməlin mələklər yaza dəftərə.
Hər yanı istəsə, baxanda görə,
Təriqətdə bu sevdalı gərəkdi.

## ARASINDA

Təzə aşnalıqla köhnə dostluğun
Fərqi var qış ilə yaz arasında.
Namərddə qaydadı: kəsər basdığın,
Hər kəs hesab çəksin öz arasında.

Qüdrətdən ucalan zülm ilə enməz,
Haqdan yanan çıraq bad ilə sönməz.
Dost dostdan inciyər, qəlbində dönməz,
Olar bir az ərki naz arasında.

Ələsgərəm, qəmü-möhnətdi yüküm,
Fil çəkməz bu dərdi mən necə çəkim?!
Haqq ilə nahaqqı axtaran hakim,
Tapar qulaq ilə göz arasında.

## DƏYMƏMİŞ

Dad sənin əlindən, a qanlı fələk,
Könül həsrət qaldı yara dəyməmiş.
Köhnə yaram qövr eylədi təzədən,
Təbib neştər vurdu yara dəyməmiş.

Gözüm qaldı "əlif", "bey"də, "yasin"də,
Yaradanım, kömək eylə ya sində.
Qaldım səməndər tək qəm dəryasında,
Yandı balü pərim nara dəyməmiş.

Ələsgər, üsyanın çıxıbdı sandan,
Öldürsən zənburu, əl çəkməz şandan.
Hərcayıdan, müxənnəsdən, nadandan,
Nə söz qaldı sənətkara dəyməmiş.

## EYLƏR

"Can" deməklə candan can əskik olmaz,
Məhəbbət artırar, mehriban eylər.
"Çor" deyənin nəfi nədi dünyada,
Abad könlü yıxar, pərişan eylər.

Nakəs adam danışıqda saz olar,
Kərəmdən kəm, səxavətdən az olar.
Nütfədən qarışan şeyitbaz olar,
Mərd də sığışdırmaz, nahaq qan eylər.

Bir gün Mansır qalxar, gələr toxmaq-yay,
Dağları atmağa eylər haqq-say.
Seçilməz məhşərdə nə şah, nə gəday,
Xaliqi-ləmyəzəl Haqq divan eylər.

Məzəmmət eyləmə mən binəvanı,
Sahibi-səltənət, ey gövhər kanı.
Mənim sözüm yoldan çıxan mollanı,
İnşallah, qaytarar, müsəlman eylər.

Mən istərəm, alim, mömin yüz ola,
Meyli Haqqa doğru, yolu düz ola,
Diliylə zəbanı üzbəüz ola,
Ələsgər yolunda can qurban eylər.

## HEYİFSƏN

Danışdıq, barışdıq mərhəmət ilə,
İnciklik araya qatma, heyifsən!
Sən tacir olmazsan bir manat ilə,
Namusu, qeyrəti atma, heyifsən!

Mövlam məni nəzərindən salmayıb,
Huşum cəmdi, ağlım heç azalmayıb,

Fani dünya Süleymana qalmayıb,
Oyan bu qəflətdən, yatma, heyifsən!

Siz təlaş edərsiz iynə-biz ilə,
Bizimki də gəlib gedər söz ilə.
Əyri ol əyriylə, düz ol düz ilə,
Hər yetəni sən aldatma, heyifsən!

Düşəndə məclisə, ağır yığnağa,
Mənə hörmət qoyur irəncbər, ağa,
Söz uzansa, həcv çıxar qurşağa,
Sözün dalın çox uzatma, hayıfsan!

Qəsəm[1] olsun xudkeşlərin sərinə,
Yalan söz igidi salar dərinə,
Köhnə dağarcığı tumaş yerinə,
Aşıq Ələsgərə satma, hayıfsan!

## QOCA BAXTIM

Nə sevda tapıbsan, nəyə talıbsan?
Hansı qəflətdəsən, gəl, qoca baxtım!
Ya məndən küsübsən, ya qocalıbsan,
Bu sınıq könlümü al, qoca baxtım!

Çəkilib pünhana, deyirsən: "Sən döz!"
Qiyamət odundan pisdi tənə söz.
Gümüşüm tunc oldu, zəri-zibam bez,
Qəlp çıxır aldığım mal, qoca baxtım!

Özüm aşıq oldum, oğlum gülləçi,
Bildim ki, qalacaq dövlətin üçü.
Qırıldı mal-qoyun, qalmadı keçi,
İndi də yıxılıb kal, qoca baxtım!

*1. Qəsəm olsun – and olsun*

Mərdan şirə çəkib, daşdan keçərdin,
Dəryalardan ləlü-gövhər seçərdin,
Pərvazlanıb Qafdan  Qafa uçardın,
Keçən günü yada sal, qoca baxtım!

Təqdir üçün yaxşı deyil bu adət:
Gah çox sevir, gah eyləyir xəcalət.
İyidlər at vermir, gözəllər xələt,
Gəlmir tənbəkiynən bal, qoca baxtım!

Səksəni, doxsanı ötübdü yaşım,
Gor deyə tərpənir bəlalı başım.
Əzrayıl həmdəmim, məzar yoldaşım,
Daha köç təblini çal, qoca baxtım!

Ələsgər kəsilib səbrü-aramdan,
Oxlayıbsan, qanlar axır yaramdan.
Haqq ilə qıl sövdə, əl çək haramdan,
Halaldan mətləbin al, qoca baxtım!

## YAXŞI HÖRMƏT İLƏ,
## TƏMİZ AD İLƏ

Yaxşı hörmət ilə, təmiz ad ilə
Mən dolandım bu Qafqazın elini.
Pirə ata dedim, cavana – qardaş,
Ana-bacı bildim qızı, gəlini.

Hər kəs bu dünyanı fani bilməsə,
Həm savabı, həm üsyanı bilməsə,
Namusu gözləyib, nanı bilməsə,
Əli Zülfüqarı kəssin belini!

Bədəsildən hərgiz olmaz heç əsil,
Lənət sana gəlsin, pis soy, pis nəsil!

Firib-fəsad ondan qalxar müttəsil,
Ölüncə tərgitməz öz əməlini.

Yaxşı tanı, dağıtmaynan huşunu,
Dostun oğraşısan, qandım işini,
Badkeş bənd eləmə, çək qəmişini,
Nəzmə cəzm eyləmə şeytan felini!

Yazıq Ələsgərəm, bir kəminə qul,
Əysik sözü hərgiz etmərəm qəbul.
Bəndeyi-xudayam, ümməti-Rəsul,
Dost tutmuşam Şahi-Mərdan Əlini.

## AYAĞA QARQAR

Var olsun Qarabağ, əcəb səfadı,
Başa Xaçın axar, ayağa – Qarqar.
Göyçə qar əlindən zara gəlibdi,
Muğan həsrət çəkir: a yağa qar, qar.

Ahən gəzər, səngə verər mər dana,
Mərd oğulun qəhrin çəkər mərd ana,
Mərd iyid meydanda durar mərdana,
Müxənnət yapışar ayağa, qarqar.

Ələsgəri çəkməyinən ala sən,
Geyinibsən, yar, qəddinə ala sən,
Lazımdı ki, qərib könlü alasan,
İncidərsən, sənə ay ağa qarqar.

## A YƏMƏNDƏDİ

Ahəngar deyiləm, naşı bəzirgan,
Gözüm dürdanədə, a yəməndədi.
Sinəmdədi eşqin şirin çeşməsi,
Ləzzəti meyl edib, ay əməndədi.

Bir sazım var – nə pərdəsi, nə simi[1],
Kim çalıb, tərpədər de, nə simi?
Füzuli, Firdovsi, Hafiz, Nəsimi,
Onların yazdığı aya, məndədi.

Kişi gərək zəhmət çəksin, dər salsın[2],
Ad qazansın, süfrə salsın, dər salsın.
Dərsi azlar Ələsgərdən dərs alsın,
Altı min altı yüz ayə məndədi.

## DAL-DALA

Gözəllər sultanı, mələklər şahı,
Şahmar zülfün nə tökmüsən dal-dala.
Boyun sərv üstündə budağa bənzər,
Murğu ruhun uçar qonar dal-dala.

Geydin qəm libasın yasin içində,
Gələcək nəkrəyün ya sin içində.
Doxsan min kəlmədə, Yasin içində
Neçə yerdə müttəsildi "dal-dala".

Dərs almışam, oxumuşam hər ayə,
Bayram ayı demək olmaz hər aya.
Şahlar şahı, özün yetiş haraya,
Mən yalqızam, düşmən verib dal-dala.

Bil, ehtiyac deyil sənə mal indi,
Geyibsən qəddinə, sənəm, al indi.
Can alansan, canım, Sənəm, al indi,
Əzrailin çəngəlindən dal-dala.

---

*1. Hansı simi*
*2. Tər töksün*

Ələsgər, əlindən getdi buta yar,
Huşum gedib, ağlım olmaz buta yar.
Sinəm qoydun müjganına buta yar,
Əsirgəmə, at oxların dal-dala.

## NARIN ÜZ

Könül, sən ki, düşdün eşqin bəhrinə,
Narın çalxan, narın silkin, narın üz!
Dost səni bağına mehman eyləsə,
Almasın dər, gülün iylə, narın üz!

Tikdiribsən qəsr, eyvan, oda sən,
O nökərin, o sevdiyin, o da sən,
Qıya baxdın, məni saldın oda sən,
İnsaf eylə, gəl könlümü narın üz!

Aşıq olan sözün deməz tərsinə,
Tər gəzən dünyada gedər tər sinə.
Tər sinəyə qismət olsun tər sinə,
Narın üzə qoy söykənsin narın üz!

Ürüsxət ver, sözüm deyim, Qayım ağa!
Yuyar qəssal qəddim, bükər qayım ağa.
Ləzzət verər bal qatanda qaymağa,
Onlardan da ləziz olar narın üz.

Tərlansan, ovlatma sarı, dur gedək,
Bu sınıq könlümü sarı, dur gedək!
Ələsgərəm, bizə sarı dur gedək!
Bir dərdimi eyləyibsən, Narın, yüz!

## ÇATA-ÇAT
### *(dodaqdəyməz təcnis)*

El yeridi, yalqız qaldıq səhrada,
Çək şütürün[1] çal çatığın çata-çat.
Hərcayılar səni saldı irağa,
Həsrət əlin yar əlinə çata-çat.

Qışda dağlar ağ geyinər, yaz – qara,
Sağ dəstinlə ağ kağıza yaz qara.
Əsər yellər, qəhr eyləyər yaz qara,
Daşar çaylar, gələr daşlar çata-çat.

Ələsgərin xətti çıxdı çal indi,
"Hey"i "yey"ə, "dal"ı "rey"ə çal indi[2],
Hərcayının kəlləsindən çal indi,
Çal çəngəlin, çək ciyərin çata-çat.

## ÜZHAÜZ

Mərifət bəhrinə qəvvasam deyən,
Gir dərin dəryada çalxan, üz ha üz.
Mən aşığam, yüz ha yüz,
Sonam, göldə üz ha üz.
Bivəfadan yar olmaz –
Ömür üzsən yüz ha yüz.
Qarı düşmən bir də gəlib dost olmaz,
Əlin tutub, yalvarasan yüz ha yüz.

Dərviş olan gedər gəzər dərində,
Yelkən açar dayazlarda, dərində.
Mən aşığam, dərində,
Dayazında, dərində.
Qul olasan, qalasan
Nazlı yarın dərində.

***1. Şütür – dəvə***
***2. "Heydər" - ərəb hürufatı ilə Həzrət Əlini nəzərdə tutur***

Əl açasan ərənlərin dərində,
Calayasan sınıx könül yüz ha yüz.

Ələsgərəm, ağlayasan, güləsən,
Bülbül kimi aşıq idin gülə sən.
Mən aşığam, güləsən,
Danışasan, güləsən.
Bağban öldü, bağ soldu,
Həsrət qaldın gülə sən.
Naşı bağban, əl uzatma gülə sən,
Çək əlini qızılgüldən yüz ha yüz.

## GÖZƏLƏ

Canımı qurban eylərəm,
bir belə tərlan gözələ;
Hal bilən, şirin gülən,
dosta mehriban gözələ:
Boy uca, gərdən mina,
zülfü pərişan gözələ;
Dolanıb mürği-ruhum,
olubdu mehman gözələ;
Xəstəyəm, yalvarıram,
həkimi-loğman gözələ.

Gözəl xanım cilvələnib,
gözəllərin xası kimi;
Görəni Məcnun eylər,
Leylinin sevdası kimi;
Ala gözlər şölə çəkir,
göyün sürəyyası kimi;
Çəpgəni hər rəng çalır,
tovuzun cığası kimi;
Baratdı, behiştdən gəlib,
geydirib qılman gözələ.

Gözəl kəklik al geyinib,
gözəllər xasından gözəl;
Silkinir, gərdən çəkir,
göllər sonasından gözəl;
Qabiliyyət, mərifət tapıb
ata-anasından gözəl;
Libas əndamına layiq,
əndam libasından gözəl;
Gözəlliyi cəm veribdi
xaliqi-sübhan gözələ.

Gör necə xələt verib,
məlul könlüm aşdı gözəl;
Arifsən, əhli-ruhsan,
can sənə peşkaşdı, gözəl;
Ay qabaq şölə verir,
qaşın göyçək qaşdı, gözəl;
Nə qədər gözəl görmüşəm,
hamısından başdı gözəl;
Cavanşir gözəllərinin
cəmisi qurban gözələ!

Fələkdən gileyliyəm,
mənə günü qara verib;
Mömini zəlil eyləyib,
suru günahkara verib;
Tərlanı sara yazıb,
tər qönçəni xara verib;
Ələsgər Məcnun olub,
meylini dağlara verib;
Tərk edib ibadəti
bağlayıb dastan gözələ.

## KİMİ

Dəli Alı bir sədd açıb,
Şah Abbas dövranı kimi;
Yanında yoldaşları var,
Azərbaycan xanı kimi;
Zeynalabdın bəy bəzənib,
Misirin sultanı kimi;
Hər yana kağız dağıldı,
Süleyman fərmanı kimi;
Yetmiş iki millət gəldi,
ərəsət divanı kimi.

Neçə çinovniklər gəldi,
çox ağır keçdi yığnağı;
Bir yanı Qanıq, Qavrı,
bir yanı Qoşqarın dağı;
Aləm çırağvan göründü,
xoddandı çehilçırağı;
Şəmkirdən düyüsü gəldi,
Sarıyaldan gəldi yağı;
Hər yana qəflə işlədi,
xotkar bəzirganı kimi.

Günün günorta vaxtında,
gəldi Alının dəstəsi;
Hər birisi bir igiddi,
bir qoşunun sərkərdəsi;
Gördüm asimana dayanıb,
"öldürrəm", "öldürrəm" səsi;
Yaponyadan tüfəng gəlib,
yeddi ağac vurur gülləsi;
Zərbinnən dağlar titrəyir,
bərgin diraxşanı kimi.

İyidliyin səbəbinə,
ona deyirlər "Dəli Alı";

Sücaətdə Qəhrəmandı,
Loğmana bənzər kamalı;
Barilahim, irəhm eylə,
pozulmasın bu cəlalı;
Bir sərkarda camışı var,
üç sərkarda qoynu-malı;
Mehtərdə qırx atın gördüm,
Calalın türkmanı kimi.

Alı kimi iyid yoxdu,
onu tək doğub anası;
Süzən əldə, ətək beldə,
var iyidlik nişanası.
Vallahiləzim, belədi,
açıq, sözün mərdanası.
On beş gün şülən çəkildi,
işlədi aşpazxanası;
Erkək yan-yana kəsildi,
Minanın qurbanı kimi.

Alı məclisə gələndə,
mətəl qaldım işlərinə;
Atanın sərdar oğludu,
sərim qurbandı sərinə.
Səxavətdə əla gördüm,
yazdım Hatəm dəftərinə;
Şavaşa beşlik qızıllar,
işlədi qəpik yerinə;
Neçə mücrülər açıldı,
sərrafın tükanı kimi.

İyidlikdə yox əvəzi,
afərin dedim Aslana;
Dağıstan formu geyinib,
təmkini qızılbaşyana;
Süzən tüfəng cingildəyir,

patronu işləyir qana;
Koroğlu tək nərə çəkir,
coşub girəndə meydana;
Tüf dağıdır, ordu pozur,
qüdrətin aslanı kimi.

Ata-baba iyiddilər,
bəyənmişəm əsli-zatın;
Doğruluğun səbəbinə,
Mövlam veribdi baratın;
Əli kəmərbəstəsidi,
cəm eyləyib hər büsatın;
Fürsəti düşmana verməz,
əldən qoymaz ehtiyatın;
Kəpəzdə ovun gözləyir,
Alvızın tərlanı kimi.

Cəfər ağa bir igiddi,
girəndə meydan içinə;
Yalavıyır şimşək kimi,
bələnir al qan içinə;
Zərrəcən gəlməz eyninə,
düşsə yüz düşman içinə;
İsgəndər tək səddi çıxıb,
yeddi Dağıstan içinə;
Şəninə dastan yazıram,
Rüstəmin dastanı kimi.

İçlərində bir Seyid var,
onlara rəhbər kimidi;
O ki Məşədi Məhəmməddi,
bir nər oğlu nər kimidi;
Qızılhajılı Allahverdi,
Maliki-Əjdər kimidi;
Min yaşasın İsmayılı,
nərəsi Heydər kimidi;

Xanbulaxda meydan açdı,
Koroğlu meydanı kimi.

Orucu çox bəyənmişəm,
məhəbbətim var Qəfərə;
Qasımı mərdana gördüm,
vəsfini yazdım dəftərə;
O kişilik, o səltənət
halal olsun İsgəndərə;
Unudub dünya cifəsin,
tabe olub peyğəmbərə;
İbadəti var məscidin,
Qareyi-Quranı kimi.

Beş min manat pul yığıldı,
dalda qalanın bilmədim;
Yüz erkək-öyəc kəsildi,
toğlunun sanın bilmədim;
Xərcindən bərxurd olmadım,
nəfin, ziyanın bilmədim;
Nisyə qalan xələtlərin,
doğru, yalanın bilmədim;
Nağdıdan mətləbim verdi,
kişi kərəm kanı kimi.

Biçarə Aşıq Ələsgər,
gəldin, getdin hər nə isə;
Haqq səni sərraf yaradıb,
qiymət qoy yaxşı, pisə;
Tatoğlu, Bala Məşədi,
onlar gələndə məclisə;
Hamıdan çox pul verdilər,
qızıl ilə doldu kisə;
Aşıqlar güzəran tapdı,
bəylər güzaranı kimi.

## MƏHƏRRƏM ALÇALI
*(1825-1910)*

***Göyçə aşıq mühitinin on doqquzuncu əsrdə yetişdirdiyi saz-söz sənətkarlarındandır. Təxminən 1825-ci ildə Göyçə mahalının Alçalı kəndində anadan olub. Xalq arasında Alçalı Məhərrəm kimi tanınıb.***

***Səsi, söz düzüb-qoşmaq bacarığı, təbi ilə diqqəti cəlb edib, Qızılvəngli Aşıq Alının yanında şəyird olub, ondan sənətin sirlərini mükəmməl mənimsəyib, ustad aşıqların sənət yükünü, dastanları sinədəftər eləyib. Bir müddət Aşıq Alı ilə birgə məclislər aparıb, sonra müstəqil şəkildə aşqlığa başlayıb.***

***Məhərrəm Alçalı yaradıcı aşıq olub. Təəssüf ki, onun zəngin ədəbi irsi bizə tam olaraq gəlib çatmayıb. Əsərlərinin böyük bir hissəsi unudulub. Əlimizə gəlib çatanlar isə ustadların repertuarından yazıya alınıb.***

***Ustadnamələri, gəraylı, qoşma, müxəmməs, divani və s. nümunələri onun yüksək yaradıcı təbinin göstəricisidir.***

***Məhərrəm Alçalı 1910-cu ildə vəfat edib.***

### GƏLMƏDİ

Ey gözəl, sənin təhrində huri-qılman gəlmədi,
Yıxdın könlümün evini, oldu viran, gəlmədi.
Açılsın mah camalın, qoy olsun bayram günü,
Cümlə cahan həsrət çəkir, mahi-ruhan gəlmədi.

Düşdü eşqin ataşına, yandı səməndər kimi,
Söz sinədə cuşə gəldi, cəm oldu dəftər kimi,
Heç mahalda ustad yoxdu Aşıq Ələsgər kimi,
Yüz yerdən qətrə oynadı, belə ümman gəlmədi.

Məhərrəməm, əzbərimdi Sirri-sübhan ibtida,
Ondan münkir olan kimsə məhşərdə tapmaz cada.
Müxənnətə bel bağladım, zəhmətim getdi bada,
Bağlandı namərd kisəsi, daha dövran gəlmədi.

## NƏDİR

Barilahim, divan budur, yetişən dada nədir?
Müxənnəs Haqqı unudub, heç salmır yada, nədir?
Girmə nadan məclisinə, qədirbilən olmasa,
Hərcayi hədyan söyləyər, bəy nədir, gəda nədir?

Əsli-zatı halal olan çaşqın olmaz binadan,
Mətləbinə tez yetirər yeri-göyü yaradan.
Tərk eyləyən sovmü-salat əlin çəksin üqbadan,
Titrəyər dizi Siratda, heç tapmaz cara nədir.

Ey Məhərrəm, dosta yetir, dostdan dosta al olmaz,
Həqiqətdən dərs almayan təriqətdən hal olmaz,
Şəriətdə kamil olan yetkin olar, kal olmaz,
Gəşt eyləyər dəryalarda, çay nədir, ada nədir.

## BULAQLAR

Mən bilirəm, zimistanın qəhrindən
Ağ niqab örtübsən üzə, bulaqlar!
Yaşılbaş sonalar tərk olub səndən,
Həsrətsən gəlinə, qıza, bulaqlar!

Cənnətül-məvadan olmusan təyyar,
Üstündə gəşt eylər cümlə ərənlər.
Sənə bəxş eyləyib bir pərvərdigar
Qüdrət yeygisindən təzə, bulaqlar!

Üstündə cəm olur türfə gözəllər,
Ağ sürüynən ətrafını bəzərlər.
Mərd iyidlər ağır xonlar düzərlər,
Xanlar mehman gələr sizə, bulaqlar!

Qarlı dağlar alçaqlanmaz, ucalmaz,
Ləşgər çəkib, xotkar ondan bac almaz.

Səndən içən hicran çəkib qocalmaz,
Yetirsə də sinin yüzə, bulaqlar!

Məhərrəm arzular, gəlsin baharın,
Ərisin girmələr, tökülsün qarın,
Dad versin dəhanda Abi-Kövsərin,
Olsun içənlərə məzə, bulaqlar!

## TƏRSİ-TƏRSİNƏ

Dağlar al geyinib, ellər qırmızı,
Hüsnün zinət verir tərsi-tərsinə.
    Aşıq deyər, qəddi tər,
    Libası tər, qəddi tər.
    Bu gün bir hikmət gördüm –
    Mürdəsində qədd itər.
Qoy söykənsin köynəyinə qəddi tər,
Sinən tərdi, köynək tərsi-tərsinə.

Mərd igidlər çörək verər, hey alı,
Namərd sənsən, çörək səndən həyalı.
    Aşıq deyər, həyalı,
    Gözəl gəzər həyalı.
    Bədəsil əsil olmaz,
    Əsil olan həyalı.
Yorğun maral otlar, gəzər hey yalı,
Ülkər ovçusundan tərsi-tərsinə.

Məhərrəm, aç gözün həyat içində,
Dolan, gəz cahanı həyat içində.
    Aşıq, həyat içində,
    Xalın həyat içində.
    Bir canlıdı, bir cansız,
    On baş həyat içində.
Qapısız-bacasız həyat içində,
Götürüb qoyarlar: tərsi-tərsinə.

## YANA-YANA

Bir üzügülməzin, bəxtiküskünün,
Ağladım dərdinə ha yana-yana.
        Aşıq deyər, ha yana,
        Qəlbin oda ha yana.
        Yaxşı dostu unutma,
        Canın oda ha yana.
Çəksən də zəhmətin qədirbilməzin,
Axırda qalarsan ha yana-yana.

Ağanın hökmü ilə dərya dayandı,
Suya qərq olana dərya da yandı.
        Aşıq deyər, nə yandı,
        Nə yandırdı, nə yandı.
        Kərəm oldu eşq əhli,
        Axır oda nə yandı.
Məcnunu öldürdü Leyli həsrəti,
Eşqi sinəsində ha yana-yana.

Məhərrəm, qəlbini üzən nə qandı?
Düşünməzlər bu dünyadan nə qandı?
        Aşıq deyər, nə qandı,
        Nə yaradı, nə qandı.
        Ağıllı yüz ad dedi,
        Qanmaz ondan nə qandı?
Bir gün olar bu dünyadan köçərsən,
Ağlıyar dostların ha yana-yana.



## AŞIQ ƏZİZ
***(1825-1918)***

***Aşıq Əziz təxminən 1825-ci ildə Göyçə mahalının Böyük Məzrə kəndində yoxsul bir ailədə dünyaya gəlmişdir. Aşıqlığa maraq göstərən Əziz bu sənətə dərindən yiyələnmiş və şeir qoşmağa başlamışdır.***

***Aşıq Əzizin yaradıcılığından əldə edilən bir-iki nümunə göstərir ki, aşığın ictimai quruluşa, onun haqsızlıqlarına qarşı ciddi etirazı olmuşdur. O, dövrünün ədalətsizliklərini yarızarafat ifadələrlə kəskin şəkildə söyləmişdir. Görünür ki, elə bu kimi səbəblərə görə o, dəfələrlə həbs edilmiş, sürgünə göndərilmiş, saz çalmağı qadağan olunmuşdur.***

### OLUB

Ay ağalar, gəlin sizə söyləyim,
Gecə-gündüz işim ahü zar olub.
Bərəkət kəsilib, urza gödəlib,
Müxtəsəri, dünya çox bekar olub.

Heç iyidin işi düşməsin dara,
Dara düşən olar işdən avara.
İşləməklə versə, verər Cabbara,
Çalışmaqdan qulaqları kar olub.

Doğrudumu gör Əzizin dediyi,
Allah qırmaz yaratdığı bəndiyi.
Hacı Bədəl qoyub bu məzəndiyi:
Onçu arpa pulnan barabar olub.

## YOXDU

Ay ağalar, sizdən sual eylərəm:
Mən niyə kasıbam, dövlətim yoxdu?
Düşmənin diləyi gəlib yerinə,
Qız külfəti basıb, öylətim yoxdu.

İllah da ki, kasıblığın azarı,
Alıbdı canımı, qalmayıb yarı.
Qılıncım əlimdən gedəndən bəri,
Kəsilif urvatım, hörmətim yoxdu.

Aşıq Əziz deyər, düşə dəstimə,
Kor yapalaq nə giribdi qəsdimə!?
Çox tülkülər baş qaldırıb üstümə,
Patronum, tüfəngim, qüvvətim yoxdu.



## AŞIQ AYDIN
## *(1825-1915)*

***Şişqayalı Aşıq Aydın kimi tanınan Aydın Ramazan oğlu 1825-ci ildə Göyçə mahalının Şişqaya kəndində anadan olub. Gözəl səsi və dastançılıq qabiliyyəti ilə el arasında sevilən bir sənətkar olmuşdur. Gənc yaşlarından həm də şeir – əsasən həcv və satirik şeirlər yazmağa başlayıb. Qoşma və gəraylıları, xüsusən də gözəlləmələri Göyçə aşıqlarının repertuarında geniş yer alıb. Başına gələn əhvalatlar, sərgüzəşt və hekayətlər xalq arasında geniş yayılıb. Ömrünün çox hissəsini sürgündə keçirib.***

***Aşıq Aydın 1915-ci ildə vəfat edib.***

### YARALIDIR

İki dağın arasından
Bir cüt maral endi.
Biri eşqin havasından,
Biri yardan yaralı endi.

Xına vurub əllərinə,
Şana vurub tellərinə,
Gümüş kəmər bellərinə,
Heyif, məndən aralı endi.

Əsmə, badi-səba, əsmə,
Yarın meylin məndən kəsmə.
Biri Dursun, biri Məsmə,
Aydın deyər, bunlar endi.

## DÜŞDÜ

Ay ağalar, gəlin sizə söyləyim,
Yaxşı dostlar bizdən aralı düşdü.
Aylar naçağıydım, illər xəstəsi,
Bayqu kimi, sinəm yaralı düşdü.

Bəsləyirdi sinəsində, döşündə,
Oynadırdı kirpiyində, qaşında.
Səhər-səhər tər çeşəmlər başında,
Yadıma dağların maralı düşdü.

Bizim dağlar zimistandı, qarlıdı,
Dostun bağı heyvalıdı, narlıdı.
Aşıq Aydın, könlün nə qubarlıdı,
Bizim dağlar bu il qoralı düşdü.



## MUSA AĞKİLSƏLİ (SƏFƏROĞLU)
*(1830-1912)*

***Aşıq Musa Səfəroğlu Göyçə mühitinin istedadlı saz şairlərindən olub. Aşıq Ələsgərlə bir kənddə yaşayan Musa ona böyük ehtiram göstərib, şeirlərinə nəzirələr qoşub. "Koroğlu havaları"nı zamanında onun qədər ustalıqla heç kəs oxuya bilməyib. Bu səbəbdən də onu "Koroğluxan" adlandırıblar.***

***Aşıq sənətinə erkən yaşlarından böyük maraq göstərib, saz havalarını, dastanları, ustadların yaradıcılığını mükəmməl mənimsəyib. Aşıq şeirinin çeşidli formalarında şeirlər qoşub. Həyatının çox hissəsini səfərlərdə keçirib, Türkiyəyə, İrana səfərlər edib. "Nə günahı telli sazın", "Bir gün", "Kəklik", "Gülə-gülə", "İndi", "Dilbər", "Biri yaz", "Var", "Olmaz", "Ay üzə-üzə", "Ağlar", "Mənnən" və s. qoşma, gəraylı və təcnisləri bu gün də xalq arasında məşhurdur.***

### MƏRD

Xaliq özü Məhəmmədə göndərdi Quranı mərd,
Yüz on dörd əziz surəni, otuz cüz ayanı mərd.
Heç kimsədən bakım yoxdu, sığınmışam Sübhana,
Pədərimin mərd oğluyam, gəzirəm meydanı mərd.

Hər kimə ki, mən can dedim, canı canda görmədim,
Xudada olan kərəmi bəni-insanda görmədim,
Atasına kəc baxanı bir məkanda görmədim,
Nəzər saldım sağa, sola, dolandım hər yanı mərd.

Qafil olma Aşıq Musa, kim qalacaq dünyada,
Uca könlün alçaq saxla, havalanma ziyada,
Cəhənnəmin maliklərin gündə yüz yol sal yada,
Bağışlanar günahların, gəl eylə tobanı mərd.

## NƏ GÜNAHI TELLİ SAZIN

Məclisləri abad eylər,
Nə günahı telli sazın?!
Məlul könülü şad eylər,
Nə günahı telli sazın?!

Yeki şəcər, yeki dəmir,
Ara vurmur, yalan demir,
Qazı kimi rüşvət yemir,
Nə günahı telli sazın?!

Fikrini vermir qələmə,
Zülm eyləmir aləmə,
Pulunu vermir sələmə,
Nə günahı telli sazın?!

Yoldan çıxıb, yolun azmır,
İblis kimi ara pozmur,
Molla kimi cadu yazmır,
Nə günahı telli sazın?!

Musa vəsfin söylər saza,
Ruh verir gəlinə, qıza,
Oxşamayır şeytanbaza,
Nə günahı telli sazın?!

## BİR GÜN

Könül, ara dostlarını,
O da səni gəzər bir gün.
İki mirqəzəb əyləşib,
Xeyir-şəri yazar bir gün.

Ey, yükü tunc olan kimsə,
Nağdısı vec olan kimsə,

Nütfədən kəc olan kimsə
Doğru yoldan azar bir gün.

Yazıq Musa eylər dilək,
Bu qəm bizi qoymaz gülək.
Demədimmi, çərxi-fələk
Bu dövranı pozar bir gün.

**KƏKLİK**

Baharın gülşən çağında
Nə oxursan, sona Kəklik!
Avazın gəldi xoşuma,
Yaşayasan sən, a Kəklik!

Kəklik məskən salıb daşa,
Sürmə çəkib gözə, qaşa.
Bu dövranın yetməz başa,
Ovçu gəldi, sin, a Kəklik!

Musa söz deyər, bəsinən,
Kəklik ötür həvəsinən.
Elə oxudun səsinən,
Cuşa gəldi sinə, Kəklik!

**SULTANIM**

Bir bivəfa yar ucundan
Yetişdim cana, sultanım.
Du çeşmi-xumar ucundan
Düşdüm zindana, sultanım.

Üzündə qoşa xalını,
Əmim ləblərin balını.
Bir də görsəm camalını,
Gəlləm imana, sultanım.

Mən olmuşam bəxtiqara,
Gül meylini verməz xara.
Rəhmin gəlsin, yetir yara, –
Yazıq Musana sultanım.

## DİLİM

Dilim, sənə bir nəsihət deyirəm,
Dünyanın malına sarışma, dilim!
Yəqin eylə, ölüm haqdı qabaqda,
Qiyamət oduna alışma, dilim!

Mənim sözlərimi saxla əmanət,
Haqqınan dost olan tez tapar nicat.
İstəyirsən sərin ola salamat,
Ağlına gələni danışma, dilim!

Sən uyma namərdə, gördüm səxasın,
İçməynən, zəhr olur mey piyaləsin,
Hər kəs çəkər öz ağlının bəlasın,
Fitnəvü-şərlərə qarışma, dilim!

Bir məclisə vardım, sən ol nöqtə hal ,
Eşidənlər səndən dərk etsin kamal,
Dindirsələr, dillən, yoxsa da ol lal,
Hərcayi danışıb gülüşmə, dilim!

Musa eşqə alışmayıb, nə lazım,
Bivəfaynan qonuşmayıb, nə lazım,
Allah özü sirr açmayıb, nə lazım,
Sən bildiyin sirri gəl açma, dilim!

## DƏLİ KÖNÜL, SƏNDƏ NƏLƏR DOLANIR

Dəli könül, səndə nələr dolanır,
Biri qışdır, biri payız, biri yaz.
Üç əlamət gözəllərin nişanı,
Biri işvə, biri qəmzə, biri naz.

Coşqun çaylar kimi qaynadım, doldum,
Heyva tək saraldım, gül kimi soldum,
Gedər ikən üç gözələ tuş oldum,
Biri qarı, biri gəlin, biri qız.

Qürbət eldə kimdi halım soruşan,
Ağ üzündə qoşa xal verir nişan,
Üç şeydir ki, bu otağa yaraşan,
Biri Musa, biri söhbət, biri saz.

## AY ÜZƏ-ÜZƏ

Ay ağalar, çeşmim yaşı sel oldu,
Çalxanır sonalar ay üzə-üzə.
Mərd sözünü deyər mərdü-mərdana,
Namərd saxlar sözün ay üzə-üzə.

Nazlı dilbər əldə tutub nə sağı,
Dərd çəkənin nə bimarı, nə sağı,
Ala gözlər mənə eylər nasağı,
Kəc baxar ömrümü ay üzə-üzə.

Aşıq Musa deyər, yetibdi dərdim,
Məni bu qürbətə atıbdı dərdim,
Səksəni, doxsanı ötübdü dərdim,
İndi də yetişib a yüzə, yüzə.

## DE BİR ÜZ, BİR ÜZ

Arif olan, diqqət eylə, fəhm eylə,
Qövr eylədi yaram de bir üz, bir üz.
Fələk saldı məni hicran xəstəsi,
Yatıram yan yerdə, de, bir üz, bir üz.

Yaralıyam, çətin qalam bu yaza,
Ərz eyliyəm, dərdi-dilim bu yaza.
Yetir xəbərimi gərdən bəyaza,
Görünsün gözümə de bir üz, bir üz.

Aşıq Musa, səni dərd az alımı?
Görüm, düçar olsun dərdə zalımı.
Dərmansız xəstədən dərd azalımı?
Loğman tək deyirəm, de bir üz, bir üz.

## DAĞLAR

Kəmənd əldə, səyyad ov bərəsində,
Ovçusu da ağlar, maral da ağlar.
Oxun sədasından, güllə səsindən,
Ürküdüb əyləməz maralı dağlar.

Mənim dərdim budu, öz balasına,
Gözəl məni saldı öz bəlasına,
Yaradan qıyarmı öz balasına,
Ox dəysə tiflinə, mar alı dağlar.

Musa, nə dərdin var yara mən, dedi,
Ləzzəti gözəlin yar əməndədi,
Təzə, köhnə nə var, yara məndədi,
Zənbur tək sinəmdə mar alı dağlar.

## GÖYÇƏNİN

Siz eşidin, vəsfi-halın söyləyim,
Yaxşı camaatdı eli Göyçənin.
Adamları saf məhəbbət əhlidi,
Cənnətdi çəməni, çölü Göyçənin.

Hər yerdə söylənir Göyçənin adı,
Səfalı yaylağı, qurğu-busatı.
Sürüynən erkəyi, ilxıynan atı,
Nə çoxdu dövləti, malı Göyçənin.

Hər dağdan ucadı Çalmalı dağı,
Car olub köysündən Qumlu bulağı.
Əziz saxlayırlar gələn qonağı,
Dad verir dahana balı Göyçənin.

Musanın sözlərin eyləyin əzbər,
Yazılsın kitablar, cəm olsun dəftər.
Gəzəsən kənbəkənd, şəhərbəşəhər,
Deyəsən, necədi halı Göyçənin.

## DAĞLAR

Mən gedirəm, halallaşaq, ayrılaq,
Görmüşəm sizlərdə vəfanı, dağlar!
Gəzdim, gəşt eylədim çəməngahını,
Sürdüm çox zövq ilə səfanı, dağlar!

Üç ay köysünüzdə yaylayır ellər,
Oxuyur kəkliklər, ötür bülbüllər.
Açılır min cürə ətirli güllər,
Xəstə burda tapar şəfanı, dağlar!

Musanın qürbətə bu gedən çağı,
Göründü gözünə Çalmalı dağı.
Gözəllər yığnağı Sandıq bulağı,
İçənin bal dadır dahanı, dağlar!

## MƏNDƏN

Vaxt dolandı, gəldi keçdi zamana,
Niyə əl çəkmədin a yara, məndən?
Nə əcəl gəlmədi, yetmişəm cana,
Nə xəbər getmədi, a yara məndən.

Can deyən Fərhaddı, Şirin də hana,
Ləblərin də söylər şirin dəhana,
Gəlibdi ləblərin şirin dəhana,
Görmüşəm ləzzətin a yar əmənnən.

Musa qələm çalır, nə xoş səf adı,
Nə nizam yoxumdu, nə xoş səf adı.
Pərişan xəyalım nə xoş səfadı,
Xain bəd qandırar a yara məndən.

## ƏYƏR-ƏYƏR
***(dodaqdəyməz çığalı təcnis)***

Çən gəlsə dağlara, yellər əsdirər,
Qış da çətin gəlsə, dal əyər-əyər.
    Aşıq deyər, Əyərdən,
    Nə gətirdin Əyərdən.
    Laçın getdi şikara,
    Gətirərsə əyər dən.
Elin səsin qayalardan kəsdilər,
Eşitsə, qəddini dal əyər-əyər.

Yəqin kəsər zəhri zəhrin salsalı,
Qəza cana zəhrin zəhri sal salı.
    Aşıq gəzər sal salı,
    Yar qəddinə sal salı.
    Canan canı nəzərdən
    Əyər yaxşı slasalı.
İçində qardaşı zəhrin salsalı,
Səslərdi dilində dal əyər-əyər.

Yazıx cana canan gətdin əyanə,
Danışsan dərdini, salsan əyanə.
Aşıq gəzər əyanə,
Dilin eşqə əyanə,
Xain nədən qaralı,
Gəzir eldən əyanə.
Musa istər cahan gəzə əyanə,
Yaralı sinəsin dal əyər-əyər.

## YÜKÜM

Usatadımdan dərs almışam,
Mim, əlif, daldı yüküm.
Dürrü qumaş çəm etmişəm,
Yaşıldı, aldı yüküm.
Mətahım eyi mətahdı,
Neylim, yoxdu bazarı,
Əgər söz isbata keçsə,
Xeyli iqbaldı yüküm.

Yığılsın mərdanələr
Məclisi xoş eyləsin.
Mərd gərək mərdin yolunda
Sərin peşkaş eyləsin.
Bu gün saqi məclisidi,
İstəyən nuş eyləsin;
Abi-kövsərdən götürmüşəm,
Eyni zülaldı yüküm.

Həqiqətdən dərsim aldım,
Mərifətdən halıyam;
Təriqətdən dərs almışam,
Şəriəti tanıyam.
İsmimdi Aşıq Musa,
Şahi-Mərdan quluyam.
Xirdarı var sərf eyləsin,
Gör nə cəlaldı yüküm.

## QALMADI

Ay fələk, sənin cövründən,
Köçdü, insan qalmadı;
Neçələr nakam öldü,
getdi, cavan qalmadı,
Yar yarından ayrı düşdü,
əhdü-peyman qalmadı.
Kəlmənə bəli söyləyib,
mətləb qanan qalmadı.
Nə xəstələr şəfa buldu,
nə də loğman qalmadı.

Beş gün xoşbəxt olanların
sonun bimar eylədin;
Neçə-neçə Süleymanın
taxtın tarmar eylədin;
Baislikdə ülfət qıldın,
belə bazar eylədin;
Hər kimə ki, şərbət verdin,
tez zəhrimar eylədin;
Pozuldu bağçalar, bağlar,
soldu gülşən, qalmadı.

Kim ilə dostluq elədin,
söylə görüm başa-baş?
Qəzəbindən xof eylədim,
didəm verdi qanlı yaş,
Sümüyümə lərzə düşdü,
cismimdə yandı ataş;
Zəhmətini mən çəkməkdən
qara bağrım oldu daş,
Qəhrinə baş əyməkdən
Musada can qalmadı.

## AŞIQ ŞİRİN
*(1847-1940)*

***Aşıq Şirin 1847-ci ildə Göyçə mahalının Zərkənd kəndində anadan olub. Yaradıcı aşıq kimi tanınıb. Bu el sənətkarının ədəbi irsi vaxtında toplanıb yazıya alınmadığından şeirlərinin çoxu itib-batıb.***

***Aşıq Şirin 1940-cı ildə Göyçədə vəfat edib.***

### DAĞLAR

Kişilər, ağalar, ər oğlu ərlər,
Qarışdı, əridi dumana, dağlar.
İnsafın yoxdumu, niyə söz verdin,
Yağıya, murdara, yamana, dağlar.

Sinəmdə dağ-düyün yaşın bu vaxtı,
Mərdin günü keçdi, çevrildi taxtı.
Fələyin alovu yandırdı, yaxdı,
Gəlmişəm əlindən amana, dağlar.

Əyləşib bir yerdə qala bilmirəm,
Söz ilə təsəlli ala bilmirəm.
Şirinəm, sazımı çala bilmirəm,
Sən gətir bir məni imana, dağlar.

## ŞİRİNDİ

Tablamazsan vallah bağrın çatlayar,
Dünənki çağalar olub şir indi.
Ağlın itib, yoxsa huşun azalıb?
Qoru öz canını, can ki şirindi.

Boş danışma, salma cana azarı,
Yönsüz, qanmaz yolun-izin azarı.
Tökmə üzdən az abırı, az arı,
Tülkü olan, bil ki, meydan şirindi.

Yaxşı anla, kəl yanında danasan,
Durma daha, vaxt-vədəni danasan?
Gözlə, bəlkə, adını da danasan,
Qarşındakı ustad aşıq Şirindi.



## ÇOBAN MƏHƏMMƏD
*(1857-1937)*

***Çoban Məhəmməd 1857-ci ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olub. "Şair Məhəmməd" və ya "Çoban Məhəmməd" təxəllüsü ilə tanınıb. Babası Allahverdi, atası Alməmməd, qardaşları Ələsgər, Salah, Xəlil kimi, onun da bədahətən şeir qoşmaq istedadı olub, bir neçə dastan da yaradıb. Bunlardan "Məhəmməd və Sərv Xuraman" ("Məhəmmədin Qars səfəri" də deyirlər) daha çox yayılıb.***

***Göyçə mühitində və mühitdən kənarda şeirləri geniş yayılıb. Ustad sənətkarların repertuarında onun saysız-hesabsız nümunələri dillər əzbəri olub. Müxtəlif toplularda yer alan poetik örnəkləri onun istedadının, sənət bacarığının nümunəsi kimi geniş əks-səda doğurub. Gəraylı, qoşma, təcnis, ustadnamə, divani və müxəmməsləri mühitin sənət ənənəsini öyrənmək üçün mühüm qaynaqdır.***

***Çoban Məhəmməd 1937-ci ildə vəfat edib.***

### FƏLƏK

Dürüst fəhm eylə, gör məni salıbsan nə hala, fələk!
Qarşıdırıbsan başımı olmaz qeylü-qala, fələk!
İki əlim olub, bir başım, düşmüşəm mahala, fələk!
Əlimə zurna veribsən, qaldım çala-çala, fələk!

Yaş yaşayıb boy çəkəli, dolu görmüşdük anbarı,
Deyirdik, nəyə lazımdı arpaynan dareqan, darı,
O qədər azdı əməlimiz, bəyənmədik kərdiyarı,
İndi ayranınan pencər dönüb bizə bala, fələk!

Ağ lavaşı bəyənməyən indi hamı ayran içir,
Ah çəkir, boyun bükür, güzəranı belə keçir,
Ac qalır, əcəl gəlir, fanidən üqbaya köçür,
Gora kəfənsiz qoyulur, buyurur risala, fələk!

Gicitkanınnan unnuca yaxşı saxlardı adamı,
Əgər ki onlar olmasa, məxluqat batardı hamı.

Şükür Allah kəreminə, görmədim ata-anamı;
Çox oğlanlar atasına çöndəribdi dal, a fələk!

Laladibi, nazikbədən onlar böyük ad elədi,
Ac qarınlar doydurdu, çox könüllər şad elədi.
Deyim, əvəlik, dübərxdən mahala imdad elədi,
Şahpencəri yaddan çıxıb, heç gəlmir xəyala, fələk!

Gözümüz yollarda qalıb, karvan havaxt yük gətirir,
Kiminin baxtı dolu, kimininki pük gətirir.
Bənadəm cəngəl yeməkdən heyvan kimi tük gətirir,
Hamısı löyündən çıxıb, dönüb arıq mala, fələk!

İngilisdən gələn şalon  Göyçəni qoydu virana,
Öləni öldü, qaçanı dağlarda düşdü borana,
Ac qaldı uşaq, ağlaşdı, hamı yön tutduq arana,
Çiynimizə xurcun verdin, döndərdin hambala, fələk!

Üzüqara olmuş bahalıq neçə nahaq qan eylədi,
Mollalar dəftərə yazdı, aşıqlar dastan eylədi,
Göyərdi gözəl qırxbuğum, mahal güzəran eylədi,
Görənlər qəhqəhə çəkdi, güldü bu əhvala, fələk!

Getdi əldən var, güzəran, Məhəmmədəm, qaldım naçar,
İyidin varı olmasa, enişə-yoxuşa qaçar.
Çağırıram Şahi-mərdanı, əlbət, bir xeyir qapı açar,
Sidqinən sığınmışam müşküli-həllala, fələk!

## BİRDİ

Vəfalı dost tək-tək olar,
İnsanlarda yüzdə birdi.
Sən arzula cansağlığı,
Çox da birdi, az da birdi.

Kəklik ötər qış keçəndə,
Ovçu yanar boş keçəndə,

Güzəranın xoş keçəndə,
Qış da birdi, yaz da birdi.

Bir söz deyim, tapa bilsən,
Sınıq könlü yapa bilsən,
Sevdiyini öpə bilsən,
Qaş da birdi, göz də birdi.

Məhəmmədəm, düşdüm xəstə,
Canım qurban yaxşı dosta.
Eşqin olsa, sinən üstə
Tar da birdi, saz da birdi.

## GÖRDÜM

Gedirdim, güzarım düşdü bulağa,
Ovçu bərəsində maralı gördüm.
Yatıb inildəyir, durub boylanır,
Kəslibdi səbri-qəralı gördüm.

Zalım ovçu alıb onu nişana,
Dəlib ürəyini, boyamış qana.
Yıxılıb çevrilir o yan-bu yana,
Bir neçə yerindən yaralı gördüm.

Təbib olsam, yaraların bağlaram,
Sinəm üstün düyünlərəm, dağlaram.
Məhəmmədəm, çaylar kimi çağlaram,
Ananı baladan aralı gördüm.

## DAĞLAR

Yaz olanda, gözəl dağlar,
Car olur sellərin sənin.
Dönəndə payız fəslinə,
Qayıdır ellərin sənin.

Yayda çiçəyin qaynaşır,
Üstündə bulud oynaşır,
Payız dərdin həddən aşır,
Solanda güllərin sənin.

Hanı o boyu şahbazlar,
Bir-birinə edər nazlar,
Üzüşmür sonalar, qazlar,
Donubdu göllərin sənin.

Gələndə qışın sərbəsər,
Görəni eylər dəngəsər,
Boran gədikləri kəsər,
Bağlanar yolların sənin.

Başında qurdlar ulaşır,
Məhəmmədin ağlı çaşır,
Sümükləri sızıldaşır,
Əsəndə yellərin sənin.

## SALDIN

Qulun ollam, vəfalı yar,
Məni gözdən nədən saldın?
Dərdə dərman bilməz idin,
Məni gözdən nədən saldın?

Bağında gül bəyaz olmaz,
Olsa da, yar rəngi solmaz,
Hərcayının andı olmaz,
Məni gözdən nədən saldın?

Ağ üzündə xaldan ötrü,
Ləbindəki baldan ötrü,
Şirin-şəkər dildən ötrü,
Məni gözdən nədən saldın?

Məhəmməd der, dərdim çoxdu,
Sinəmə vurduğun oxdu,
Səndən qeyri yarım yoxdu,
Məni gözdən nədən saldın?

## VERƏM

Dostum məndən bir əmanət istəyib,
Ümidvaram, yaxın zamana verəm.
İxtiyarım ola, qüdrətim çata,
Yaxşının dərdini yamana verəm.

Divan olsam, nainsafam, çox pəsəm,
İsbat olan cinayətə tək bəsəm,
Qanmazın ömründən qayçıyla kəsəm,
Götürəm aşkara, qanana verəm.

Məhəmmədəm, halal etdim qanımı,
Eşqə düşən mənim kimi yanımı?
Əzizliklə saxladığım canımı,
İnsafdımı, indi canana verəm.

## MƏN

Aran çox istidi, yaylaq sərindi,
Bilmirəm qalmayım, yoxsa, qalım mən?!
Könül bir gözələ aşiq olubdu,
Bilmirəm almayım, yoxsa, alım mən?!

Çox ziba gözəldi, gözəllər xası,
Əyninə geyinib əlvan libası,
Görünür gözümə eşqin dəryası,
Bilmirəm dalmayım, yoxsa, dalım mən?!

Məhəmmədəm, ağlım başdan azalıb,
Zimistan zəhmərin əldən yaz alıb,
Dəli könlüm altmışında saz çalıb,
Bilmirəm çalmayım, yoxsa, çalım mən?!

## BU DAĞLAR MƏNİM

Yayda yaylağımdı, qışda oylağım,
Yazda seyrangahım bu dağlar mənim.
Köçürüb ellərin payız ayları,
Gözüm görüb, könlüm budu, ağlar mənim.

Bir yaqut yanaqlı, yasəmən xallım,
Dəhanı kövsərlim, ləbləri ballım,
İlə ilqar verib Leyli misallım,
Onçu məskənimdi bu dağlar mənim.

Kamil ovçu itirəndə maralı,
Kəsilər aramı, səbri, qəralı,
Məhəmmədəm, düşdüm yardan aralı,
Çəkildi sinəmə bu dağlar mənim.

## AĞLASIN

Çeşmim yaşı axdı, döndü sellərə,
Yoxdu bu dərdimi qanan, ağlasın.
Sığışmır ki, dərdim deyəm dillərə,
Mənim tək alışan, yanan ağlasın.

Yerbəyerdən sızıldar mənim yaram,
Bu dərdimə yoxdu mümkünüm, çaram.
Gedən yoxdu, şaha kağız göndərəm,
Məni yada salan, anan ağlasın.

Məhəmməd, kimin var gələ dayağa?
Qanımı boyadım əlvan boyağa,
Zimistan çəkirəm başdan ayağa,
Mənim tək şaxtada donan ağlasın.

## ARTIQDI

Bir gözəl gördüm bu gün,
canlarda candan artıqdı;
Qaməti sərv ağacı,
zülfü reyhandan artıqdı;
Qabağı ayna kimi,
qaşı kamandan artıqdı;
Dodağı qaymaq təhər,
dəhanı şandan artıqdı;
Gözləri dan ulduzu,
şöləsi şamdan artıqdı.

Qoşulub üç gözələ,
bağları seyran eləyir;
Birisi sağında gedir,
söhbəti hər yan eləyir;
Birisi solunda durub,
canını qurban eləyir;
Dalınca bir özgəsi
əmrinə fərman eləyir;
Özü rəiyyət balası,
hökmü sultandan artıqdı.

Şah kimi divan qurdurub,
gözəllərə cərmə kəsər;
Yanaqlar lalə kimi,
çöhrəsində tellər əsər;
Durna tək sığallanıb,
ürəyimi dardan asar;
Ağlımı başdan alıb,
ciyərimə dağlar basar;
Buxaqda filfil kimi,
xalı mərcandan artıqdı.

Çevrilib, dörd yanına,
deyərsən ki, tərlan baxar;
Çalmasın əyri çalıb,
telləri altından çıxır;
Zülfünə şanə çəkib,
gözlərinə sürmə yaxır;
Qoynu cənnət bağıdı,
müşk ilə ənbər qoxur;
Buyu[1] xoş bənövşədən,
ətri süsəndən artıqdı.

Yeridikcə ikram edir,
zərli corab gül başmağa;
Hər tərəf yaxapulu,
adət edib oynaşmağa.
Ləbləri məzələnib,
daldalanıb zər yaşmağa;
Mələklər həya elər
üzbəsurət danışmağa;
Görmədim bərabərin,
deyəm ki, bundan artıqdı.

Tovuz kimi sığallanıb,
zər-ziba, əlbət, geyinib;
Hər zaman bəzəkli gəzir,
eyləyib adət, geyinib;
Gümüş kəmər incə belə
qurşayıb, rahət geyinib;
Qənövüzdən dizliyi var,
ipəkdən xələt geyinib;
Tərifi düşüb ellərə,
şuru cahandan artıqdı.

Gül üzə ayna tutub,
qələm qaşı əymələdi;

***1. Buyu - ətiri***

Tellərinə şanə çəkib,
gözlərini sürmələdi;
Açılmışdı ağ sinəsi,
məni görüb düymələdi;
İstədim, irəli gedim,
yoldaşları hərbələdi;
Dedilər: "yaraşmazsan,
bu xanım səndən artıqdı".

Çəkəndə dəstəsini,
yeriyəndə xanasına,
Zülf dəyir topuğuna
oxşar göllər sonasına;
Qızıl üzük xub yaraşır
ağ əllərin xınasına;
Məhəmməd "afərin" söylər,
bu gözəlin anasına;
Doğubdu insan deyin,
huri-qılmandan artıqdı.

## GÖYÇƏNİN

Hər mahalda dastan olub,
söylənir halı Göyçənin;
Qəhr eylədi çərxi-fələk,
döndü iqbalı Göyçənin;
Dağıldı ağır sürüsü,
talandı malı Göyçənin;
Pozuldu qurğu-büsatı,
şəni, cəlalı Göyçənin;
Suyu saf, havası xoş,
cənnət misalı Göyçənin.

Çarxı-qəzanın qədəri
Göyçəni eylədi talan;
Qaçan dağlarda qırıldı,

əsir oldu dalda qalan.
Aman Allah, nə gün çəkdi
qürbət eldə qaçqın olan;
Nə qədər doğru danışdıq,
dedilər, söyləmə yalan,
Biz ki, bilirdik əzəldən
azdı kamalı Göyçənin.

Ah çəkməkdən qürbət eldə
qara bağrım qana dönüb;
Çarx dolanıb, iqbal qaçıb,
baxt yatıb, zamana dönüb.
Görün qəzanın qədərin
tülkülər aslana dönüb;
Cacıq yeyib, çaşır satan
hərəsi bir xana dönüb;
Həcv eləyib, deyir bizə:
"bəddi amalı Göyçənin".

Göyçənin şəhəridi
Basarkeçərinən Kəvər,
Neçə iyidlər var idi,
bir-birindən mötəbər.
Dava düşdü, el qırıldı,
olduq vətəndən dərbədər;
Dedilər, alveri kəsilib,
gələn, gedən etdi xəbər;
Heç yandan xırıd gəlmədi,
bağlandı yolu Göyçənin.

Göyçəni abad elədi,
yaşasın divan, hökuməti!
Ayağının sayəsində
Göyçə tapdı bərəkəti;
Hər şəhərə tel vurdular,
gəldi güclü inayəti;

Həftədə bir payladılar,
yaxşı saxladı milləti;
Qaldırıldı ortalıqdan
dərdü-məlalı Göyçənin.

Məhəmmədəm, duaçıyam:
iyidlər ölkəsi yaşasın!
Artsın şanı, şöhrəti,
ucalsın səsi, yaşasın!
Hər mahalda səddi düşüb,
söylənir bəhsi, yaşasın!
Qəniminə qan ağladır,
alır qisası, yaşasın!
Halal olsun yoldaşlara
əmliyi, balı Göyçənin!

## GƏLİR

Dilbərim aşığını,
sallanıb görməyə gəlir.
Tuti tək dili fəsih,
danışıb gülməyə gəlir.
Həsrətindən dərdə düşdüm,
dərdimi bilməyə gəlir.
Dərdimdən qan ağlaram,
yaşım silməyə gəlir.
Bilmirəm nə var könlümdə,
yar özü bilməyə gəlir.

Yaradan bu cavanı,
gör neçə candan eylədi.
Yanaqları lalə kimi,
qönçələri gülşən eylədi.
Kəkili sünbül cığalar,
zülfü pərişan eylədi.
Qaşları ox atıban,

sinəmi şan-şan eylədi.
Şahi-kamandara dönüb,
bağrımı tikməyə gəlir.

Ağ ceyran quzusudur,
çıxıb çölə, düzdə durur.
Cığalar qıvrılıban,
mahi-taban üzdə durur.
Qaşlara vəsmə yaxıb,
sürmə ala gözdə durur.
Hurilər xidmətində,
mələklər pişvazda durur.
Bir belə şahi-tuban
təvazə qılmağa gəlir.

Məclisi səf-səf edib,
yığnağı əlvan bəzəyib.
Qızıl, gümüş şamdanların,
çırağı əlvan bəzəyib.
Doldurub gətirir qədəh,
bir saqi əlvan bəzəyib.
Döşəyin xalı, gəbə,
otağı əlvan bəzəyib.
Bəlkə də, mehman olub
bir gecə qalmağa gəlir.

Məhəmmədəm, yara müştaq,
olmağımı siz də bilin.
Başıma gələcəyi
bilməyimi, siz də bilin.
Saralıb heyva təki,
solmağımı siz də bilin.
Ey bidad, Allah aman,
ölməyimi siz də bilin.
Cəlladı-xunxar olub,
canımı almağa gəlir.

## NƏCƏF DAŞKƏNDLİ
*(1876-1919)*

***Aşıq Nəcəf Allahverdi oğlu 1876-cı ildə Göyçə mahalının Daşkənd kəndində anadan olub. Nəcəf olduqca yaraşıqlı, boylu-buxunlu, qəddi-qamətli adamıymış.***

***Mükəmməl bilik, dərin hafizə, möcüzəli səs sahibi olan Aşıq Nəcəf səliqə-səhmanı, ədəb-ərkanı ilə həmişə diqqəti çəkər; aşıqdan çox bəyə, bəyzadələrə oxşayarmış.***

***Aşıq Nəcəf ustadı Aşıq Ələsgərə on il şəyirdlik edib, onunla ağır məclislər yola salıb. O, Dədə Ələsgərin ən çox sevdiyi şəyirdlərindən olub. Onun səsi Aşıq Əsədin səsi ilə uyğun gəldiyindən hər ikisinə məsləhət görərmiş ki, siz daim bir yerdə olun, bir yerdə çalıb-oxuyun. Yüksək səs tembrinə görə, Aşıq Nəcəflə Aşıq Əsəd otuzluq lampanı dəfələrlə toy məclislərində söndürərmişlər. Aşıq Nəcəflə Aşıq Əsəd 1910-cu ildə İran səfərində olarkən Təbriz aşıqlarının ustadı onlara hörmət və ehtiram əlaməti olaraq hər birinə ontelli saz bağışlamışdır. Bu saza "Xətayi sazı" da deyilir, qolunun içi boşdur.***

***Aşıq Nəcəfin Şəmistan, Şəmiddin, Mikayıl, Astan və İsmayıl adında beş oğlu olub. 1919-cu ildə ermənilərin Göyçə mahalına silahlı basqını zamanı Nəcəf əsir düşüb, "Küllü təpə" deyilən ərazidə ermənilər onun belinə odlu samovar bağlayaraq beş oğlu ilə birlikdə vəhşicəsinə öldürüblər.***

### BAX

Ay insafsız, qatil olma, göz aç girdikara bax,
Yeri-göyü yaradana, bir pərvərdigara bax!
Zülm edirsən, qan tökürsən, yerə-göyə sığışmaz,
Aldanıb dünya malına, olma üzüqara, bax!

Yaranmış hamı öləcək, hərənin bir vaxtı var,
Sorğu-sual, polu-sirat, qabaqdadı, haqdı, var.
Haqqın özü divan edər, ədalət bir təxti var,
Seçərlər günahkarları, yandırarlar nara, bax!

Axtarır həsrət gözlərim, qohum-qardaş hardadı,
Ala gözlü nazlı yarım indi ahu-zardadı.
Yet dadıma, Şahı Mərdan, yazıq Nəcəf dardadı,
Kərəm eylə, tut dəstindən, sən çıxar kənara bax!

## QARDAŞ

Ağız vermə, qurumsağa, sarsağa,
Aldığı nəfəs də yalandı, qardaş.
Həyasız qadınlar naməhrəm olar,
Keçmə ətrafına ilandı, qardaş.

Yaltağın ürəyi dumandı, sisdi,
Paxılın ürəyi qurumdu, hisdi.
Aşığın dıydığı lotudan pisdi,
Mollanın dıydığı şeytandı, qardaş.

Eliynən ağlayıb əgər gülürsə,
Haqqın ayağına əgər gəlirsə,
Yaxşını yamandan seçə bilirsə,
Deməli, Nəcəf tək insandı, qardaş.

## KƏLMƏSİN

Oyandım yuxudan azan səsinə,
Təkrarladım "Allah, Əkbər" kəlməsin.
Allahın məsəli, – Əla Məhəmməd,
Rəsulu ol Əkrəm Muxtar kəlməsin.

Qulfəllahu Əhəd öyrəndim, dedim,
Həm Allahus Səməd öyrəndim, dedim,
İləm, vələm, yuləd öyrəndim, dedim,
Söylədim: yet dada Qəhhar kəlməsin.

Aşıq Nəcəf Haqdan umur mərhəmət,
O kərəm sahibi verəndi nüsrət.
Salmaram dilimdən: Allah, Məhəmməd,
Həsən, Hüseyn, Fatma, Heydər kəlməsin.

## ƏRZİM VAR

Gedən, getmə, mən də gəlim yetirim,
Sən getdiyin Kərbəlaya ərzim var.
Düldülün sahibi, Qəmbər ağası,
Şiri Yəzdan Mürtəzaya ərzim var.

Sənətkartək gəzdim neçə elləri,
Tapdamadım çiçəkləri, gülləri.
Fərat kənarında düşən qolları,
Həzrət Abbas binəvaya ərzim var.

Nəcəf deyər, özüm qaldım hədəfdə,
Ha çalışdım, açılmadı kələf də.
Arzum idi, gedəm qalam Nəcəfdə,
Səcdəgahım, bir Xudaya ərzim var.

## VARIYDI

Yatmışdım qəflətdə, gördüm Heydəri,
Cəmi xublar məclisində varıydı.
Özü Şiri-Yəzdan, aləm sərvəri,
Mübarək dəstində Zülfüqarıydı.

Bir insan Heydərdi – Qəşəmşəm adı,
Darda qalanların odur fəryadı.
Şahi Mərdan ilə on bir övladı,
Qəmbər qabağında qulamkarıydı.

Biçarə Nəcəfin Haqdır gümanı,
O pənc əl-əbadır dini, imanı.
İçlərində bir Kərbəla sultanı,
Əlil Fəzil Abbas əlamdarıydı.

## BİR XƏBƏR GƏTİR

Könül quşu, uç get Vətən elinə,
Mənə o ellərdən bir xəbər gətir.
Yetir əhvalımı nər igidlərə,
Qasımı, Ziyadı birtəhər gətir.

Görsən nələr çəkir çarəsiz ana,
Deginən, ömürü getdi bəd-fəna.
Düşmənin gülləsi dəyməsin mana,
Daşkənddən içməyə bir zəhər gətir.

Nəcəf bilmir, harda qaldı Gülüstan,
Şəmsəddin, Şəmistan, Mikayıl, Astan.
İsmayıl körpəydi, çıxmadı yasdan,
Xudam, sən üzünə xoş səhər gətir.

## MƏN

Gecə də, gündüz də yalvarışdayam,
Tutmuşam Tanrının ətəyindən mən.
Hay verən tapılmır, hey püfləyirəm,
Hələ ki, düzlüyün tütəyindən mən.

Hayıf, nadan üçün tökdüm gözyaşı,
Bedasıl yolunda ağartdım başı.
Ayıra bilmədim qohum-qardaşı,
Şər-böhtan, kin-küdrət ətəyindən mən.

Nəcəf çox sınadı mənəm deyəni,
Hey yıxılan gördüm özün öyəni.
Nadan qamçısıyla döysə yüz məni,
Ayrılmaram Haqqın pətəyindən mən.

## YETİR[1]

Kainatı, yeri, göyü yaradan,
Dərdlərə dərman ver, bir ayə yetir.
Ağbirçək analar fəğan eyləyir,
Bax aha, amana, haraya yetir.

Dolanır tərsinə dünya gərdişi,
Pozulmaz olubdu millətin işi.
Mehracda, Hatifdə danışan kişi,
Özün kərəm eylə, buraya yetir.

Qurtar bu milləti əzabdan, dardan,
Nəcəf ayrı düşüb qohumdan, yardan.
Sidq ilə çağırram: Ya Şahı Mərdan!
Bağışla yüz on dörd surəyə, yetir.

## AĞLASIN[2]

Kəblə Rəhim, söylə Aşıq Əsədə,
Mənim əhvalıma qalsın, ağlasın.
Arif məclisində, alim yanında,
Həmişə yadına salsın, ağlasın.

***1. Bu şeiri aşıq Nəcəf belinə qaynar samovar bağlanıb işgəncə ilə öldürülərkən bədahətən demişdir.***
***2. Bu şeiri də Aşıq Nəcəf belinə qaynar samovar bağlanıb işgəncə ilə öldürülərkən bədahətən demişdir.***

Özüm zindandayam, qəlbim uzaqda,
Fələk məni nakam qoydu bu vaxtda,
Gəncədə, Şəmkirdə, Tovuz, Qazaxda,
Yaralı "Dilqəmi" çalsın, ağlasın.

Daşnak qış eylədi bahar-yazımı,
Eşidən sızlayar xoş avazımı,
Sinəsi sədəfli telli sazımı,
Ələsə[1] deginən, çalsın, ağlasın.

Gün kimi dağlardan aşıb gedirəm,
Daşqın çaylar kimi daşıb gedirəm,
Göyçəm, sənlə vidalaşıb gedirəm,
Lalən, tər çiçəyin solsun, ağlasın.

Köhlən at belində gəzdiyim dağlar,
Dumana, çisginə dözdüyüm dağlar,
Nəcəfəm, əlimi üzdüyüm dağlar,
Məni eldən xəbər alsın, ağlasın.



***1. Bozalqanlı Aşıq Ələs Nəcəfin yaxın dostu olmuşdur.***

## USTA ABDULLA
*(1865-1943)*

***Usta Abdulla 1865-ci ildə Göyçə mahalının Zod kəndində anadan olub. Ömrünün çox hissəsini doğma obasında keçirib. Onun atası dülgər olub, sazbəndliyi də bacarıb. Abdulla da atasından dülgərlik peşəsini, saz düzəltməyi öyrənib, eyni zamanda aşıq sənətinə də yiyələnib. Sazda yüksək səviyyədə havaları ifa etməyi, məlahətli səslə oxumağı bacarıb.***

***Aşıq Ələsgər "ustalıqda mən də gördüm bir dənə Zodlu Abdullanın kamalına baş", - deyə ona xüsusi dəyər verib. Gəraylı, qoşma, təcnis, müxəmməs və deyişmələri onun zəngin yaradıcı təbinin olmasını göstərir. Daha çox təcnis ustası kimi tanınıb. Zəngin yaradıcı təbi, sazbəndliyi, aşıq havalarını məharətlə çalması, ifa qabiliyyəti onun mühitdə tanınmasına əsas olub.***

***Göyçədən köçən aşıq (1930) bir müddət Azərbaycanın ayrı-ayrı kəndlərində yaşayıb, sonra Gəncədə məskunlaşıb, 1943-cü ildə burada vəfat edib. Qəbri İmamzadə qəbiristanlığındadır.***

### NEYNİM

Ay ağalar, ay qazılar,
Mən bu dərdə dözüm, neynim?
Düşdüm qəmin dəryasına,
Qəvvas olum üzüm, neynim?

Dərdim olubdur ziyada,
Bir yetən yoxdur fəryada,
Arsız, qəmli bu dünyada,
Heç bilmirəm gəzim, neynim?

Abdulla düşüb azara,
Dərdi yetib səd-hazara,
Qoyan yoxdur bir məzara,
Öz əlimlə qazım, neynim?

## MƏNƏM

Arif məclisində, qanan yanında,
Hər sözü dillərdə yayılan mənəm.
Eşqin atəşidi yanan canımda,
Qəza qamçısilə döyülən mənəm.

Taqət olmaz qəriblərin dizində,
Mürvət olar mərd igidin özündə.
Səksənində, doxsanında, yüzündə,
Qəflət yuxusundan ayılan mənəm.

Yatmış idim, baxtım məni oyatdı,
Qəzanın qədəri kəməndin atdı,
Mahalım Göyçədi, sakinim Zoddu,
Sənətkar Abdulla deyilən mənəm.

## NİŞANASI

Duman, çiskin qalxdı ərşi-səmaya,
Görünmür gözümə dağ nişanası.
Əcəl gəlib, ömür gedib fənaya,
Yoxdur bu yerlərdə ağ  nişanası.

Duman, çisgin məni qara yetirdi,
Çəkdi, Mənsur kimi dara yetirdi,
Müxənnət cismimə yara yetirdi,
Yoxdu bədənimin sağ nişanası.

Fələk bəhrəm etdi, pozdu növrağı,
Dağ üstən çəkibdi sinəmə dağı,
Bülbül fəğan edər, dolanar bağı,
Görəndə gül üstə zağ nişanası.

Dastan olub, necə düşüm dillərə,
Məcnun kimi, fələk saldı çöllərə,
Yandı qara bağrım, döndü küllərə,
Yoxdu ürəyimdə yağ nişanası.

Abdullayam, əlim əldən üzüldü,
Seyraqublar dörd yanıma düzüldü,
Fələk vurdu, novrağımız pozuldu,
Yoxdu gülşənimdə bağ nişanası.

## QARIŞAR

Mərdlərin içindən seçin namərdi,
İlqarsızdı, gedib elə qarışar.
Kökündən çıxardın qara tikanı,
Heyifdi, ətirli gülə qarışar.

Alçaq adam qarışdırar aranı,
Bayquşda adətdi, sevər viranı.
Odun sayma qarağanı, turanı,
Yandırsan, köz olmaz, külə qarışar.

Ağac bəlli olar yaxşı barından,
İgidlər seçilər düz ilqarından,
Abdulla, qala qurma dağlar qarından,
Yazda gün əridər, selə qarışar.

## HARDA MƏN

İnsan odur, fikirləşə düz seçə,
Kimnən gəzim, necə gəzim, harda mən.
Uyğun ola yoldaşlarım özümə,
Danışanda utanmayam orda mən.

Gələndə məclisə, biləm yerimi,
Niyə duram, görən kimi birini.
Ya danışam, ya da verəm sirrimi,
Cəhli düşə, məğlub olam zorda mən.

Gərək hörmət edəm özüm-özümə,
Danışanda sərhəd qoyam sözümə.
Uzanmaya qoşa barmaq gözümə,
Çırpınmayam balıq kimi torda mən.

Abdullayam, hər hesabı qanmışam,
Haqsızlığa alışmışam, yanmışam.
Çoxlarını candan əziz sanmışam,
Heç görmədim yaxın gələn darda mən.

## OLMAZ-OLMAZ

Yaxşıya bəd demə, düz demə nəsə,
Çalış, toxunmasın sözün bir kəsə.
Kökü yerdə olub, Günəş görməsə,
Hər bitən ağacda bar olmaz-olmaz.

Şirə döşürsən də sən ətək-ətək,
Arı bal toplamaz, olmasa pətək.
Uca ağaclarda bar olmayantək,
Namussuz sifətdə ar olmaz-olmaz,

Sənətkar, sözün yaz, durma fəth eylə,
Gəzib yaylaqları sən gülə-gülə,
Fəqət, bağlanmasan obaya-elə,
Bil, sözün dillərdə car olmaz-olmaz.

## YARALA MƏNİ

Bir ərzim var qulluğuna, rəfiqim,
Gör necə çəkibdir yar ala məni.
Od tutub cismimdə yanar atəşlər,
Seyraqublar qoymur yar ala məni.

Eyləyibsən gül rəngimi sarı sən,
Tərlan oylağına qoyma sarı, sən.
Təbibimsən, qollarımı sarı sən,
Demədim, neştər vur, yarala məni.

İyidin varıdı üz ağı, gördüm,
Qəvvas, dəryalarda üz, ağı gördüm,
Abdullayam, yaxın-uzağı gördüm,
Görmədim tifil tək yar ala məni.

## LEYLİNİ YAZDI

Bihudə dolandım, əfsanə gəzdim,
Canım dost yolunda Leylini yazdı.
Etibar kəsilib, ilqar pozulub,
Əvvəlki məhəbbət, Leyli, niyə azdı?

Qəmər qan ağladı, neştər yeridi,
Yaram sızıldayır, neştər yeridi,
Leylinin qoluna neştər yeridi,
Məcnun qanı çöldə Leylini yazdı.

Dost olan dostunu çəkməzdi dara,
Al şananı, siyah zülfün di dara.
Həsrət qoymaginən didar-didara,
Görən dost rahindən bəs niyə azdı.

Həya çəkib daldalanma sən ara,
Həqiqi dostunam, kəsmə sən ara,
Abdullanın xəyalını sən ara,
Gəzir şəmsi təki Leylini yaz di!

## YAY İNDİ

Ovçusan, durubsan ov bərəsində,
Qur xədəngin, maral keçdi, yayındı.
Əlif qəddin, Ay qabağın, gül üzün,
Cəllad qaşın çəkilibdi yay indi.

Ərş üzündə Günəş daim üzərmiş,
Müxənnətin dolandığı üzərmiş.
Dərdin məni incidərmiş, üzərmiş,
Ya bu gündü, ya sabahdı, ya indi.

Abdullayam, mail oldum a yaza,
Katib gərək mənim dərdim a yaza.
Zimistanda ilqar verdin a yaza,
A bimürvət, gözləyirəm yay indi.



## QURBAN GÖYÇƏLİ
*(1870-1915)*

***Aşıq Ələsgər ocağının istedadlı nümayəndələrindən olan Aşıq Qurban Aşıq Ələsgərin qardaşı Məşədi Salahın oğludur, 1870-ci ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olub. Gözəl səsi və bədahətən şeir deyə bilmək qabiliyyəti ilə sayılıb seçilib. Daşkəndli Aşıq Nəcəf və Aşıq Əsədlə birgə məclislər aparıb. O, Aşıq Ələsgərin ən sevimli şagirdlərindən olub. Qurban həm də Aşıq Ələsgərin qızı ilə evli olub. Deyilənə görə, Aşıq Ələsgər onun vəfatından sonra əlinə saz almayıb.***

***Aşıq Qurbanın şeirlərinin böyük bir hissəsi unudulub. Aşıqların repertuarında, ayrı-ayrı toplularda şeirləri bu gün də özünə yer almaqdadır. Göyçədə və ətraf bölgələrdə (Dərələyəz, Dərəçiçək, İrəvan, Gəncəbasar və s.) sazı-sözü ilə tanınıb.***

***Aşıq Qurban 1915-ci ildə vəfat edib.***

### GETMƏSƏM, OLMAZ

Ata, vallah bu dərd məni yandırar,
Verdiyim ilqara getməsəm, olmaz.
Seyraqublar gedər yaman qandırar,
Ollam üzüqara, getməsəm, olmaz.

Huri, qılman olmaz yarın təhrində,
Mən yanıram qəm odunun qəhrində,
Əgər Mansır kimi Hələb şəhrində,
Çəksələr də dara, getməsəm, olmaz.

Mən Qurbanam, öz canımdan doymuşam,
Xəncər alıb, bağrım başın oymuşam,
Öz dilimdən doğru ilqar qoymuşam,
Həsrət, intizara getməsəm, olmaz.

## YETİRSİN

Aşıq gərək məşuqundan dönməsin,
Vədə versə, düz ilqara yetirsin.
Qasid yoxdu, mən bir namə göndərim,
Ərzi-halım nazlı yara yetirsin.

İlqar saxlamışam iman içində,
Ümid bəsləmişəm güman içində,
Gövhər qalıb dərya, ümman içində,
Qəvvas gərək bir kənara yetirsin.

Yazıq Qurban sirrin əyan eyləsin,
İstəkli dostuna bəyan eyləsin,
Dost gərək dostuna dərman eyləsin,
Nə ki, zülm əliynən yara yetirsin.

## AY ANA DÜŞƏR
### *(təcnis)*

Qürbət eldə baş yastığa gələndə,
Qəribəm, yadıma ay ana düşər.
Əcəl yetirəndə, vaxt tən olanda,
Ona Haqq rizası əyana düşər.

Könlüm sim axtarar, nə zərə gələr,
Pərdəli gəzməyən nəzərə gələr,
Elə ki, Əzrayıl nəzərə gələr,
Boşalar qolların, a yana düşər.

Mən xəstəyəm, gəl əlinə hal əli,
Sərraf gözüm xub tanıyır ha ləli,
Yazıq Qurban, ha sızılda, ha ləli,
Gərək ki, əlinə, ayə, nə düşər.

## YARAŞIR

Qiyasbəyov Həsən bəyə
Bir yaxşı dastan yaraşır.
Qurşasın kəmərini,
Ol Şahi-Mərdan, yaraşır.
Şəninə şikar alan
Alıcı tərlan yaraşır.
Səxavətdə Hatəm kimi,
Hökmü Süleyman yaraşır,
Layiqdi bu oğlana,
Qafqaza sultan yaraşır.

Atası Səməd ağanı
Eşidib hər yan, bilirəm.
Kəlməsinin qiyməti yox,
Bağlayıb çox qan, bilirəm.
Çoxunu dardan qurtarıb,
Eyləyib ehsan, bilirəm.
Peyğəmbər bərat eyləsin,
Cənnəti-Rizvan, yaraşır.

Qaynayır samovarı,
Yanında ağır yığnağı.
Gümüş qab, xas istəkanı
Dəstində gəzdirir sağı.
Erkək kəsir, şülən çəkir,
Quburnat, sərdar qonağı.
Təmkini padşahyana,
Müxtəsəri, sözün sağı,
Günbəgündən artıq olsun
Bu qurğu, dövran, yaraşır.

Ata-babadan tanıram,
Kişinin əsli, zatı var.
Çiynində süzən tüfəng,

Altında köhlən atı var.
Padişahdan talğası,
İlahidən baratı var.
Qırantlar, mərmər daşında,
Behişt kimi büsatı var.
Mehman otağa layiqdi,
Otağa mehman yaraşır.

Cəmi bəylərin bəyidi,
Yüz yaşasın Həsən ağa!
Aşıq gördüyünü deyər,
Dilinə yoxdu qadağa.
Bir belə mərd iyidin
Yolunda sərim sadağa.
Kəlməsinə onluq verir,
Aşığı gəlir damağa.
Qulluğunda söhbət açır,
Eyləyir dövran, yaraşır.

Yetiyəm xəsyətinə,
Yaxşıdı halı, söylərəm.
Dürrü-gövhər kəlməsi var,
Ləldən bahalı, söylərəm.
Zəfəranlı ağ plovu,
Əmliyi, balı, söylərəm.
Hər yerdə bəhsin salıb,
Gəzib mahalı, söylərəm.
Vəsfini dastan eyləyib,
Bu yazıq Qurban, yaraşır.



## AŞIQ TALIB
*(1877-1979)*

***Aşıq Talıb Aşıq Ələsgərin sonbeşik oğludur, 1877-ci ildə anadan olub. Uşaqlıqdan aşıqlığa maraq göstərib, sənətin sirlərini atasından öyrənib. Güclü hafizəyə malik olub, klassik aşıqların yaradıcılığını, dastanları, saz havalarını mükəmməl mənimsəyib. Yazıb-oxumağı bacarmasa da, Aşıq Ələsgərin ədəbi irsinin toplanmasında onun xidmətləri əvəzsizdir.***

***Aşıq Talıb 1918-ci ildə ermənilərin törətdiyi qırğınlar nəticəsində ailəsi ilə birlikdə Kəlbəcər rayonunun Qanlıkənd (Qalaboyu) kəndinə köçüb və üç il burada yaşayıb. Sonra yenidən doğma yurda qayıdıb.***

***Göyçə aşıq mühitinin ayrı-ayrı sənətkarlarının yaradıcılığından nümunələrin yazıya alınmasında da onun xüsusi əməyi olub. Ağ Aşıq, Aşıq Alı, Şair Məmmədhüseyn, Alçalı Məhərrəm, Aşıq Musa, Şair Aydın, Mirzə Bəylər və s. sənətkarların ədəbi irsinin mühüm bir hissəsi onun yaddaşından, ifasından yazıya alınıb.***

***Göyçə mühitində işlənən saz havalarının da haqqında bilgilərin mühüm qismi onun vasitəsilə geniş auditoriyaya təqdim edilib. Bir sıra mübahisəli məsələlər, söyləmələr də Aşıq Talıb vasitəsilə dəqiqləşdirilmişdir.***

***Aşıq Talıb 1979-cu ildə vəfat edib.***

### DURUR

Həcvü-hədyan nə lazımdır, qarşıda insan durur,
Həqiqətə aç zəbanın, arif var, qanan durur.
Əzəl gündən sığınmışam Haqqın min bir adına,
Batində verib dərsimi, görünmür, pünhan durur.

Bu dünyada mənəm deyən Rüstəmi-Zal hanı?!
Cəm eylədi Şəhri-Zəri, ol Dal ibni-Dal hanı?!
Şəddat hanı, Nəmrud hanı, Fironu Salsal hanı?!
Onlar qalmadı dünyada, aləmi quran durur.

Aşıq Talıb, sidqi-dilnən çağır şahlar şahını,
Müşkül işi həll eyləyən mərdlərin pənahını.
Zaval yoxdu o şəxsə ki, tutub Haqq pənahını,
Əyri gedən kimsələrə nar durur, niran durur.

## GÖRMÜŞƏM
*(divani)*

Bu günkü səfərimdə gözəl bir insan görmüşəm,
Gözləri canlar alır, qəmzəsində qan görmüşəm.
Sanki Misir bazarında Yusifi-Kənan görmüşəm;
Kamalı camalından göyçək, Züleyxanişan görmüşəm.

Bilirəm, Əslidən ötrü oda düşdü, yandı Kərəm,
Mən gördüm, dözə bilmədim, bəs necə dayandı Kərəm?!
Dəhanından atəş qalxdı, alışdı, odlandı Kərəm,
Bu gün mən də öz qəlbimi alışıb yanan görmüşəm.

İşıq salıbdı hər yana  aynaqabaq aydı gözəl;
Bəşərə bənzətmək olmaz, mələklərə taydı gözəl?
Şükür haqqın kəraminə, kimə yazan paydı gözəl?
Ləblərinin busəsini Talıba dərman görmüşəm.

## ÜSTÜNDƏN

Sərt havada yolum düşdü,
Yenə bu dağlar üstündən.
Xəzan vurub, güllər solub,
Tökülübdü xar üstündən.

Görsənir payızın qarı,
Yığılır bağların barı,
El tərk edib yaylaqları,
Köçüb bulaqlar üstündən.

Dağda qalıb keçi, təkə,
Kəklik gəzir səkə-səkə,
Birdən ovçu gəldi, bəlkə,
Çəhlim düşüb qar üstündən.

Talıb, axtardığın hanı?
Boş qalıb mərdin meydanı,
Müxənnət tutub dünyanı,
Açıbdı bazar üstündən.

## QADAN ALIM

A bimürvət, vədə verdin, gəlmədin,
Düzüldü yollara köç, qadan alım.
İşarədən dərdi-dilim bilmədin,
Əgər ki, sərrafsan seç, qadan alım.

Huş dağılıb, ağıl gedibdi sərdən,
Soruş əhvalımı görəndə hərdən.
Günahım olsa da, salma nəzərdən,
Mənim təqsirimdən keç, qadan alım.

İnsafdırmı, dost dostundan yan gedə,
Zülüm olar, cəsəd qala, can gedə,
Layıq deyil sana mal qurban gedə,
Talıb qurban verir baş, qadan alım.

## BİLİN

Camaat içində, eldə, obada,
Hər kişinin öz məqamı var, bilin.
Laçın kimi dövr elədim havada,
Alammadı şikarımı sar, bilin.

Qaçdım, tay-tuşumdan geri qalmadım,
Qaçdıqca ucaldım, heç alçalmadım,
Öz sazımdan qeyri sazı çalmadım,
Nə bir bəla çəkdim, nə azar, bilin.

Talıb deyər, məqsədimə inandım,
Oduma yananın oduna yandım,
Gün keçirdim, yüz yaşıma dayandım,
Vermədim əlimdən ixtiyar, bilin.

## AY AĞASINA

Ağa nökərini yaxşı saxlasa,
Nökər can yandırar ay ağasına.
Ürəkdə təpər yox, dizdə taqət yox,
Az qalır qalxanda ayağa, sına.

Ha çağırram, cavab vermir ayarım,
Deyən məni gözdən salıb a yarım.
Saxlamışam qeyrət, namus, ay arım,
Salmaram heç yerdə, ay ağa, sına.

Bahar olcaq dağda bitər lala hey,
Qumru dillər qismət oldu lala hey.
Mail olub gözlərinə, Lala, hey,
Talıb dəxil düşüb ay ağasına.

## NƏ YAZIM İNDİ

Nə huşum düşgündü, nə fikrim cəmdi,
Bilmirəm nə deyim, nə yazım indi?
Dahanım davatdı, dilim qələmdi,
Nə savadım yoxdu, nə yazım indi.

Yetimin sevgisi, ayə, yaxşıdı,
Zikr eylə dilində ayə, yaxşıdı.
Var Quranda əziz ayə, yaxşıdı,
Əlif birdi, ayrı nə yazı mindi?

Yapılıb dağların qala sərində,
Sər odu, deyilən qala sərində.
Biçarə Talıbın qal əsərində,
Əzəldən yazılıb, nə yazım indi.

## GÖRMÜRƏM

Kəpəz, Murov, Muşov, Murğuz, Sarınər...
Nə müddətdi, o dağları görmürəm.
Daşgələn, Qaraxaç, Yalyurd baxarı
Ağır elli yaylaqları görmürəm.

Gədikləri, bələnləri aşardım,
Cığırların bəzisini çaşardım,
Görüşüb, öpüşüb, qucaqlaşardım,
Həsrətiyəm, o dostları görmürəm.

Bir zaman ellərdə gəzdim sərəfraz,
Dilimdə nəğmələr, sinəm üstə saz,
Hərlənirdi dörd yanımda quba-qaz,
Yaşılbaşlı sonaları görmürəm.

Çağırram, haraya yetişmir qardaş,
Bu dərdə dözürəm, mən bağırı daş.
Ürəkdən yanıram, görünmür ataş,
Keyvir sulu bulaqları görmürəm.

Talıbam, gəzirəm dəstimdə çəlik,
Can ağrısı fələk verib üstəlik.
Öz-özümü girləyirəm hələlik,
Gözüm kəsmir, uzaqları görmürəm.

## YOL VER, DAĞLAR, KÖNÜL VƏTƏN ARZULAR

Bir yanım dumandı, bir yanım qardı,
Yol ver, dağlar, könül Vətən arzular.
Bir yanım gədikdi, bir yanım qardı,
Yol ver, dağlar, könül Vətən arzular.

Bəd ürüzgar məni bəndə salıbdı,
Qara qayğı ürəyimi alıbdı.
Qohum-qardaş gözü yolda qalıbdı,
Yol ver, dağlar, könül Vətən arzular.

Talıb qürbət eldə düşdü zindana,
Boran qeyzə gəlib, səyriyir qana.
Sizi and verirəm Şahi-Mərdana,
Yol ver, dağlar, könül Vətən arzular.



## MEHDİ İSGƏNDƏROV
*(1880-1968)*

***Aşıq Mehdi –Mehdi Qəhrəman oğlu İsgəndərov 1880-ci ildə aşıqlar ocağı kimi tanınan Qanlı kəndində anadan olub. Gənc yaşlarından aşıq sənətinə xüsusi maraq göstərib, Aşıq Alının yetirməsi olan Aşıq Qulunun yanında şagirdlik edib. Güclü yaddaşa, gözəl səsə malik olan Mehdi ustadı Aşıq Quludan klassik aşıqların yaradıcılığını, dastanları, saz havalarını mükəmməl mənimsəyə bilib.***

***Qərbi Azərbaycandan soydaşlarımızın 1948-ci il deportasiyası zamnaı Göyçədən Ucar rayonunun Məlikballı kəndinə köçürülüb. Lakin yeni məskunlaşdığı ərazinin təbiəti ona düşmədiyindən az sonra yenidən Göyçəyə, anadan olduğu Qanlı kəndinə qayıdıb. Ömrünün sonuna qədər orada yaşayıb.***

***Aşıq Mehdi yaradıcı aşıq olub, onun yaratdığı qoşma, təcnis, ustadnamə, divani və müxəmməsləri bölgə sənətkarlarının repertuarında özünə yer alıb. "Miskin Mehdi" təxəllüsündən istifadə edib, şeirləri ayrı-ayrı toplularda çap olunub.***

***Aşıq Mehdi 1968-ci ildə vəfat edib.***

### GÖRMƏDİM

Dünya, sənin gərdişində doğru canan görmədim,
Can deyib, can eşidən, canı yanan görmədim.
Bivəfaya can deməkdən canımda can qalmadı,
Əməyim zayə getdi, doğru insan görmədim.

Söyüddən sandal olmaz, bəsləsən, əfsanadı,
Nakəsdən mömin olmaz, qibləsi meyxanadı.
Məkəsdən dövlət olmaz, mənzil biyabanadı,
Kəlbdən sürü bağlana, qurddan çoban görmədim.

Gəl, biçara Aşıq Mehdi, neylərsən dünya sirrin,
Sən ki qəvvas deyilsən, axtarma dayaz, dərin.
Nakəsdə mürvət olmaz, çağır mərdlərin pirin,
Başı ərşə bülənd olsa, gədadan xan görmədim.

## DƏYMƏMİŞ

Bağbanlar bağ bəslər, xoryadlar dərər,
Həsrət bağban əli nara dəyməmiş.
Üç ay zimistanda gülün qəhrini,
Bülbül həsrət çəkər xara dəyməmiş.

Məcnun "Leyli" – deyib, bu dağı gəzər,
Xəstə meyl eyləyər, budağı gəzər,
Nakamil bostançı tağından üzər,
Bostanda şamama, xıra dəyməmiş.

Çoxunun qəlbindən keçir xocalıq,
Mehdinin qəddini əyir qocalıq.
Arada qalıbdı bircə gecəlik,
Astaca aralan, ara dəyməmiş.

## GƏRƏK

Yük bağlayıb bir diyara gedəndə,
Mətahın satmağa bir bazar gərək.
Naşı sərraf qiymətinə yetirməz,
Gövhəri seçməyə xiridar gərək.

Nə uyma qəflətə, yuxuda yatma,
Ov keçib bərədən, oxunu atma.
Hər yetəni sən özünə dost tutma,
Dostun arasında düz ilqar gərək.

Mehdi, qocalırsan, vaxtın keçəcək,
Əcəl şərbətini hamı içəcək,
Bu dünya fanidi, gələn köçəcək,
Ustaddan şəyirdə yadigar gərək.

## OLMAZ, OLMAZ

Mərifət insanın özündə gərək,
Kənardan deməklə ay olmaz, olmaz.
Binadan olmasa, kökdən olmasa,
Hər axar bulaqdan çay olmaz, olmaz.

Hərənin yüz fikri, min xəyalı var,
Bir kimsə yerində tutarmı qərar?!
Namərdin gülləsi qəlbində olar,
Mərdin ömrü-günü zay olmaz, olmaz.

Mehdi az görmədi dünyada nə var,
Laçına tay olmaz yapalaq, nə sar.
İnsandan insana nəsihət olar,
Ağıldan ağıla pay olmaz, olmaz.

## İÇİNDƏ

Aldanma dünyanın simuzərinə,
İnsan ol bu qədər insan içində.
Çalış, səndən sonra təmiz ad qazan,
Günəş kimi parla duman içində.

Həmişə yaxşı ol, yamandan seçil,
Zülmə kəfən olma, Haqqa don biçil,
Özündən böyüklər görəndə kiçil,
Qətrə bil özünü ümman içində.

Miskin Mehdi, meyli yara bağla sən,
Məhəbbət arzunu yara bağla sən,
Dosta yara vurma, yara bağla sən,
Ömrü bada vermə güman içində.

## ÇƏKMƏYƏ

İnsan xəlq olanda yüzə yetirə,
Bu dünyada intizarı çəkməyə.
Yükləyə qatarı ləlü-gövhərdən,
Sarvan olub, qəm qatarı çəkməyə.

Yaşaya dünyada xoş iqbalınan,
Övladınan, dövlətinən, malınan,
Qaysava, qayğanaq, yağü-balınan,
Xəstə olub, dərd-azarı çəkməyə.

Mehdiyəm, çağırram: Ya Şahi-Heydər,
Həmişə dilimdə eylərəm əzbər,
Sin içində, bəlkə, ola irəhbər,
Canım cəhənnəmdə narı çəkməyə.

## VƏDƏSİNDƏ

Cəhd elə, evindən çıxma kənara,
Yolların dumanlı, toz vədəsində.
Axtarma, çillədə çiyələk olmaz,
Hər şeyi dərərlər öz vədəsində.

Sevmə, gəl, dünyada vəfasız yarı,
Düz çıxmaz ilqarı, nə etibarı.
Qardan qala yapsan, buzdan hasarı,
Əriyər, tez gedər yaz vədəsində.

Mehdi, bu sözlərin yadigar qalar,
Dünyada qəhərdən daş da qocalar.
Hər sözü yerində demək düz olar,
Kəsərli olmazmı söz vədəsində!?

## ZODLU AŞIQ AĞAYAR
***(1880-1978)***

***Zodlu Ağayar (Ağayar Xəlil oğlu Xəlilov) 1880-ci ildə Göyçə mahalının Zod kəndində anadan olub. O, Aşıq Ələsgərin son şəyirdlərindən olaraq onun bütün yaradıcılığına bələd olub. Özünəməxsus oxu tərzi və şirin danışığı ilə seçilən Ağayar Xəlil oğlu həm də dastanlarımızın bilicisi və mahir ifaçısı kimi  şöhrət qazanıb.***

***1964-cü ildə oğlu Hüseyn vəfat etdikdən sonra o, bir daha əlinə saz götürməyib. Sinəsi söz kürəsi olan Aşıq Ağayar özü də şeirlər yazıb.***

***Zodlu Ağayar 1978-ci ildə vəfat edib.***

### SİNƏMDƏ GETDİ

Aşıq Ələsgərin söz dəryasının,
Ləl-gövhər qiyməti sinəmdə getdi.
Ölçüyə sığışmaz, çəkiyə gəlməz,
Möhnəti, hikməti sinəmdə getdi.

Bir neçə aşığa mən oldum ustad,
Qəmli könülləri çox eylədim şad,
Görüm, səni olnan, ey dünya, bərbad,
Elin məhəbbəti sinəmdə getdi.

Həmişə söylənir dillərdə adım,
Daha qocalmışam, yoxdu imdadım.
Mən ölsəm, ağlayar qohumum, yadım,
Yurdumun ülfəti sinəmdə getdi.

Aşıq Ağayaram, mən sinədəftər,
Ötmədi günlərim, mənasız, hədər,
Novrəstə İmannan çox etdim səfər,
Onun sədaqəti sinəmdə getdi.

## AŞIQ SAVAD
*(1885-1970)*

***Aşıq Savad Axund Şəfi qızı Nəsibova 1885-ci ildə Göyçə mahalının Daşkənd kəndində anadan olub. Əmisi Molla Şabandan, atası Axund Şəfidən, qardaşları Hacı Rəhimdən və Molla Mehdidən ruhani təhsili alıb.***

***Tanıyıb sevmədiyi, Göyçə mahalının Sarıyaqub kənd sakini Temir adlı birisinə ərə verilib. Temirdən saz havalarını çalmağı öyrənib və aşıqlıq edib. Toylarda, el şənliklərində özünün və xüsusən də ustad aşıqların dillər əzbəri olan sözlərini çalıb-oxuyub.***

***Aşıq Savad 1970-ci ildə Gədəbəy rayonunun Qumlu kəndində vəfat edib və orada da dəfn olunub.***

### GÖTÜR

Dərd ağırdı, tək çəkilməz,
Bacım, məni yoldaş götür.
Ağır yola, ağır günə,
Dözmək üçün sirdaş götür.

Pöhrələndi qəmdə, qəmin,
Şaxələndi bəd sitəmin.
Quruyubsa gözdə nəmin,
Gözlərimdən gəl, yaş götür.

Savadam, günlər sayıram,
Qəm yükünü daşıyıram.
Elsiz, günsüz yaşıyıram,
Sal başıma, bir daş götür.

## OLARMI

Canı kabab, qanı şərab eylədin,
Candan kabab, qandan şərab olarmı?
Yarından ayrılan candan ayrılar,
Eşq əhlinin könlündə tab olarmı?

Məni xab içində bilmə, ey nadan,
Didəmdə həsrətdi hər sökülən dan.
Mən ki, dərd əhliyəm əzəl binadan,
Dərd əhlinin gözündə xab olarmı?!

Bir ov itirmişəm, çətin ki, tapam,
Versin sorağımı bu el, bu obam.
Savadam, zarıncı, qəmxar, bitabam,
Qəm-hicran çəkməyən bitab olarmı?!



## MAHMUD ARDANIŞLI
*(1889-1969)*

***Mahmud Məşədi Alı oğlu Əliyev 1889-cu ildə Göyçə mahalının Ardanış kəndində anadan olub. Ağ Aşığın, Dilqəmin, Xəstə Qasımın, Aşıq Alının, Dədə Ələsgərin, daşkəndli şair Məmmədhüseynin yaradıcılığına yaxından bələd olub və şeirlərinin əksəriyyətini əzbərdən bilib, özü də el arasında aşıq və şair kimi tanınıb.***

***Şair Mahmudun 1924-cü il təvəllüdlü oğlu Kərim də qaynar təbli şair olub, Kərim Sinədəftər təxəllüsü ilə şeirlər yazıb. İkinci dünya müharibəsində cəbhəyə yolanıb və döyüşlərdə həlak olub.***

***Şair Mahmud 1969-cu ildə Ardanış kəndində vəfat edib.***

### İNANMAYIN

Mərd igidlər, məndən sizə əmanət,
Hər yetən gözələ mayıl olmayın.
Əzəlin şad edər, sonunu bərbad,
Siz ağıl ucundan zayıl olmayın.

Qayda budur, gül dibini xar tutar,
Tərlan uçar, oylağını sar tutar,
Sizi qoyub, qeyri yerdən yar tutar,
Hər yetən gözələ siz inanmayın.

Mahmudun sözünü saxla yadında,
Canın qoyma bivəfanın yolunda.
Bir dürr idim, qaldım gövhər kanında,
Bivəfa and içsə, siz inanmayın.

## OLA BİLMƏZ
***(Şair Mahmudun oğlu Kərim Sinədəftərlə deyişməsi)***

Mahmud:

Sən çocuqsan, mənlə hənək başlama,
Cöngələr hambalda kal ola bilməz.
Sərraf dəmir seçər polad içindən,
Yüz sikkə vursan da, pul ola bilməz.

Kərim:

Öz-özünə deyib, sən də öyünmə,
Sənin kimiləri kal ola bilməz.
Küllükdə yığılan çürük cunalar,
Gəlib yaşıl ilə al ola bilməz.

Mahmud:

Doqquz dəstə məleykənin yanında,
Heç bir şəkkim yoxdur, islam qanında,
Hər arvadın doğduğu oğul yanında.
Günahkar bəndədə dil ola bilməz.

Kərim:

Günahkar bəndələr, ağam, – deməsin,
Söyüd ağacları, bağam, – deməsin.
Gəl, çox da öyünüb, dağam, – demə sən,
Dağ olsan, təpəndə qar ola bilməz.

Mahmud:

Mahmud deyər, dünya mana dar oldu,
Mart ayında yağan yağış qar oldu.
Atan kamil ustad, dayın sar oldu,
Daysı sar olanda dil ola bilməz.

Kərim:

Kərim, hər igidin olarsa zatı,
Əsli bədoy döysə, minməyin atı.
Həkimlər dağlardan toplayar otu,
Yüz iyi olsa da, gül ola bilməz.

## İSLAM YUSİFOV
*(1893-1968)*

***İslam Qara oğlu Yusifov 1893-cü ildə Göyçə mahalının Hüseynquluağalı kəndində anadan olub, 12 yaşından aşıq sənətini öyrənməyə başlayıb. Bir neçə il görkəmli aşıqların şagirdi olub. 1916-cı ildə isə Şəmkir rayonuna gəlib, burada Hüseyn Şəmkirlinin oğlu Aşıq Çoban Hüseynoğlundan çox şey öyrənib.***

***Aşıq İslam 1928-ci ildə Bakıda Azərbaycan aşıqlarının birinci qurultayında iştirak edib. Onun birinci Zaqafqaziya Xalq incəsənəti və birinci Azərbaycan Kənd bədii özfəaliyyət olimpialarındakı (1934) müvəffəqiyyətli çıxışları haqqında da məlumat var.***

***Respublikada ilk aşıq xorunun təşkili İslam Yusifovun adı ilə bağlıdır. Onun təşəbbüsü ilə 1937-ci ildə Gəncə şəhərində aşıqlar ansamblı yaradılıb.***

***İslam Yusifov Moskvada keçirilən birinci Azərbaycan Ədəbiyyatı və incəsənəti ongünlüyünün iştirakçısı olub, 1939-cu ildə Moskva Ümumittifaq kənd təsərrüfatı sərgisinin açılışında çıxış edib. 1940-cı ildə II Azərbaycan Xalq yaradıcılığı olimpiadasında müvəffəqiyyət qazanmış, tərifnamə, təşəkkür və pul mükafatı almışdır.***

***Aşq İslam Yusifov 1940-cı ildə "Əməkdar incəsənət xadimi" fəxri adına layiq görülüb. SSRİ Yazıçılar İttifaqına üzv qəbul olunub, "Qırmızı Əmək Bayrağı" ordeni və bir neçə medalla təltif edilib.***

***Aşıq İslam Yusifov 1968-ci il dekabırın 6-da Gəncədə vəfat edib.***

### GƏTİRDİN

"Divani", "Təcnisi" çalan zamanda,
Ələsgər, İmanı dilə gətirdin.
Ellər şairləri, böyük ustadlar,
Onların mahnısın elə gətirdin.

Bozalqanlı Hüseyn söz xiridarıdı,
Elin sənətkarı, iftixarıdı,
Bütün aşıqların ümidvarıdı,
Aşıqlar havasın elə gətirdin.

Böyük sənətkarsan Azərbaycanda,
Adın əzbər olub dildə, cahanda.
Sədəfli sazını hərdən çalanda,
Sevməyə, bülbülü gülə gətirdin.

Şəmkirli Hüseyni tanıyır hamı,
Sözləri hər qəlbə verir ilhamı.
Bu əziz gününə Aşıq İslamı,
Çox şad edib, gülə-gülə gətirdin.

**ƏSƏD**
***(Aşıq Əsədə)***

Kamil Ələsgərdən dərsini alan,
Söz ilə, saz ilə ad alan Əsəd.
Köhnə ustadlardan nişana qalan,
Ağızlar içində dad olan Əsəd.

Sən bizim ölkədə tək aşıq idin,
Ellər arasında yaraşıq idin,
Şadlıq aşiqiydin, bar aşıqiydin,
Sevib sənətini, şad olan Əsəd.

Qəzanın işiydi, büküldün ağa,
İslamın sinəsi dözmədi dağa,
Bu ölüm bizlərdən saldı uzağa,
Axırda bizlərdən yad olan Əsəd.

## YADIMA DÜŞDÜ

Könül arzuladı, gəldim Göyçəyə,
Xoş hava olması yadıma düşdü.
Mərd igidlər Ağbulağın üstündə
Alaçıq qurması, yadıma düşdü.

Alaçıq quruldu dərmə bağınan,
Gözəllər yığnağı ləbi-balınnan.
Aşıq yığnağından, xoş avazınan,
Sorub-soruşması yadıma düşdü.

Soruşdum Ağdağı, çoxdur yığnağı,
Ellərim edirlər işrətli çağı.
Gəzirlər, yeyirlər yağı-qaymağı,
Köçün qayıtması yadıma düşdü.

Gözümdən keçirdim sayılar onu,
Sarınər qatara laçınlar qonu.
Gəlib yetişibdir ömrümün sonu,
Karvanın düşməsi yadıma düşdü.

Beşdaşlar dağların seyrangahıdır,
Göyçə şairlərin bol yığnağıdır.
Aşıq İslam yazır, el qonağıdır,
Əsədin oxuması yadıma düşdü.



## İDRİS MƏHƏRRƏMOV
*(1894-1942)*

***İdris Şirin oğlu Məhərrəmov 1894-cü ildə Göyçə mahalının Zərkənd kəndində Aşıq Şirinin ailəsində dünyaya gəlib. O, on iki yaşından atası Aşıq Şirindən dərs alıb, aşıq sənətinin sirlərinə vaqif olub.***

***Aşıq İdris otuz beş dastanı sinədən bilib, ağır yığnaqlar keçirib.***

***Aşıq İdris Məhərrəmov II Dünya müharibəsi zamanı cəbhəyə yollanıb və geri qayıtmayıb.***

### BELƏ

Saxla əllərini, zalım zülümkar,
Çəkmə sinəm üstə şallağı belə.
Füqəranın ahı tutar səni, bil,
Quruyubdur dili-dodağı belə!

Alma əlimizdən varı görəndə,
Dərmə bağçamızdan barı görəndə.
Yoxsul sən tək canavarı görəndə,
Tutulur əlləri, ayağı belə!

İdrisi salma sən bəndə, cəliyə,
Lənət olsun mərdiməzar dəliyə.
Sormaqda bənzəyirsən zəliyə,
Vurursan əjdaha sayağı belə!

## AZARIM

Mənim əziz dostum, istəkli qardaş,
İndi yaman artıb dərdim, azarım.
Ağlaram gözlərim tökər qanlı yaş,
Şanı boşdu, bal gətirmir az arım.

Baharım gül açdı, nə qara düşdü,
Ağ olan qəlbimə nə qara düşdü.
Ləl üçün püşkümə nə qara düşdü,
Niyə olsun az qeyrətim, az arım.

Yandırıb sinəmi necə dağlaram,
Dərdi-qəm böyüdüb necə dağlaram.
İdrisəm, ah çəkib necə ağlaram,
Yetişməzmi guşinizə azarım.

## MƏNİM

Zərnişanım, gözlə, gözlə yolumu,
Səndən üzülməmiş gümanım mənim.
Oğul əmanəti, qız əmanəti,
Yaxşı saxla, dinim-imanım mənim.

Qoyma ürəyimdə arzu pasdana,
Gözyaşından tər yanağın isdana.
Dikilsin yoluma gözün mastana,
İstəkli sevgili, cananım mənim.

Uzaqdan-uzağa sən məni dinlə,
Ucalır avazım hey pillə-pillə.
Yayınmır düşmənə atdığım güllə,
Əyilməz ərlərdir həyanım mənim.

## DOLANA BİLMƏZSƏN

Aşıqsan, dədə tək dillən, söhbət aç,
Könül bulandırıb qatma aranı.
Kükrəmə boş yerə yaydı, ay kişi,
Tökmə başımıza qarı-boranı.

Saza heyfin gəlsin, sözə fikir ver,
Ayağın altından niyə qaçır yer?
Səninki odur ki, yıx, dağıt, devir,
Cəmləşdir əlində pulu-paranı.

Belə aşıq olmaz eldə-obada,
İnsafı, mürvəti veribsən bada.
İdrislə öcəşmə, deyilsən xata,
Dolana bilməzsən dağı-aranı.

## BİR GÜN

Kasıbın başına ələmə odu,
Fələyin badına gələrsən bir gün.
Vallah, belə qalmaz, dönər zamana,
Etdiyin-tutduğun bilərsən bir gün.

O yoğun boynuna zəncir salınar,
Yazığın-yuzuğun öcü alınar.
Kəndlərdə adına zurna çalınar,
Xəlvətdə gözyaşın silərsən bir gün.

İdrisin sözləri boşuna deyil,
"Böyüklük" kimsəyə qalmaz, yaxşı bil.
Qəza gəlsə, səni edər zir-zibil,
Düşər vəzifədən, ölərsən bir gün.

## NƏCƏF AĞKİLSƏLİ
*(1900-1968)*

***Aşıq Ələsgərin qardaşı Xəlilin oğludur. Mollaxanada təhsil alıb, aşıq sənətinə böyük marağı olub. Aşıq Ələsgərdən sənətin sirlərini öyrənib, 1925-ci ildən aşıqlığa başlayıb. Güclü yaradıcı təbi olub. Aşıq havalarının, aşıq şeirlərinin bilicisi kimi tanınıb. Aşıq şeirinin ən çətin şəkillərində mükəmməl nümunələr yaradıb.***

***Rəngarəng mövzularda yaratdığı divani, gəraylı, qoşma, təcnis, müxəmməs və s. şeirləri Göyçə aşıqlarının repertuarında geniş yer alıb. Şeirləri toplanaraq 2000-ci ildə kitab şəklində çap olunub.***

***Ermənilərin törətdikləri qırğınlar səbəbindən ailəsi ilə birgə (iki bacısı, qardaşı və anası) Kəlbəcərə köçüb və 1921-ci ilə qədər burada yaşayıb.***

***Göyçədə, Gəncəbasarda, Qarabağda, Dərəçiçək və s. bölgələrdə məclislər aparıb. Onun dörd yüz iyirmiyə qədər şeiri məlumdur. 1930-cu illərdən müxtəlif mətbu orqanlarda şeirləri çap olunub.***

***Aşıq Nəcəlf 1968-ci ildə Ağkilsə kəndində vəfat edib.***

### BAX

Sən şəyirdsən, bir ustaddan dərsini al, sözə bax,
Qəbul eylə dediyimi, nəsyət olsun sizə, bax.
Yəqin bil ki, el içində dolanmaq asan deyil,
Aşıqlıq ağır sənətdi, sanmagınan məzə, bax.

Öz-özünə mənəm deyib, itirməynən sərini,
Məndən sənə müştəri olmaz, axtar, tap müştərini.
Əbəs yerə pərvazlanıb yandırmaynan pərini,
Pərvana olub atəşə, vurma özünü közə, bax.

İsmimdi Aşıq Nəcəf, el içində sadəyəm,
Aləm bilir, eşq əhliyəm, Haqdan dolu badəyəm.
Sağalmazsan tutsam səni, bir qurtarmaz qadayam,
Fəhmin olsun, kənar dolan, toxunmaynan bizə, bax.

## BİR GÜN

Aldanma qurğu-büsata,
Eyləyərsən hazar bir gün.
Çox güvənmə köhlən ata,
Yıxar, səni əzər bir gün.

Sən çatıbsan xoş muraza,
Bir bu qədər gəlmə naza,
Yəqin bil ki, qəhri-qəza,
Tapar səni, gəzər, bir gün.

Gəl, eşit Nəcəfin sözün,
Yaxşı tanı Haqqın özün.
İnanıram, açar gözün,
Bizə salar nəzər bir gün.

## DAĞLAR

Mürvət eylə, insafa gəl,
Yol ver, səndən aşım, dağlar!
Çox çəkmişəm cövrü-cəfa,
Qovğalıdı başım, dağlar!

Zirvə, gədiklərin qardı,
Mən çəkdiyim ahu-zardı,
Gözüyolda, intizarda,
Gözləyir yoldaşım, dağlar!

Güzarım düşübdü səndən,
Üzünü döndərmə məndən,
Xeyli müddətdi Vətəndən,
Atılıbdı daşım, dağlar!

Harda qalıb vəfalı yar,
Gülərüzlü nazlı nigar,
Leysan kimi olubdu car,
Axar gözdən yaşım, dağlar!

Qəza kəməndini atıb,
Hər yandan Nəcəfi tutub,
İqbal dönüb, baxtım yatıb,
Düz gətirmir, işim, dağlar!

**KƏNARINDA**

Dedim, könül, namərdlərdən kənar gəz,
Gəşt eylə həmişə mərd kənarında.
Müxənnət soruşub dərdini bilməz,
Yüz də dolanasan dörd kənarında.

Gövhər sözüm məclislərdə oxuna,
Arif qana, nəsyət ola çoxuna.
İqbal üz döndərib, gəlmir yaxına,
Çəkilib durubdu sərt kənarında.

Bivəfa üzündən çox çəkdim bəla,
Heç zaman dilimdən kəsilməz nala.
Yığılıbdı qat-qat, olubdu qala,
Şikəstə Nəcəfin dərd kənarında.

## AŞİQ OLMUŞAM
*(qoşayarpaq)*

Bir vəfalı yara, zülfü şahmara,
Dü çeşmi xunxara aşiq olmuşam.
Olsam da sədpara, gəldim qərara:
Çəksələr də dara, aşiq olmuşam.

Qalmışam avara, mən bəxti qara,
Könlüm olub yara, gəlmişəm zara.
Rəhm et intizara, getmə kanara,
Qız, qoynunda nara aşiq olmuşam.

Təbibimsən, ara, eylə bir çara,
Gəzdim vara-vara sizin diyara.
Gözləri xumara, səntək dildara,
Nəcəfəm, aşkara aşiq olmuşam.

## YARAŞIR

Yaşasın bağbanı, genişdi bağı,
Bağ bağbana, bağban bağa yaraşır.
İşləyib hər yana qolu, budağı,
Budaq qola, qol budağa yaraşır.

Səs salır hər yana bağın bülbülü,
Şirindi ləhcəsi, şirindi dili,
Gözəldi yarpağı, gözəldi gülü,
Yarpaq gülə, gül yarpağa yaraşır.

Düşübdü aləmə bu bağın səsi,
Görənlərin gəlir şövqü həvəsi.
Dadlıdı dahanda tağın meyvəsi,
Tağ meyvəyə, meyvə tağa yaraşır.

Baxdıqca bağbanın bağı gözəldi,
Silinib qarası, ağı gözəldi,
Səfalı, işrətli çağı gözəldi,
Çağ işrətə, işrət çağa yaraşır.

Nəcəf deyər, heç solmasın bu bağı,
Yayılıb hər yana çatıb sorağı,
Həmdəm eyləyibdi aranı, dağı,
Dağ arana, aran dağa yaraşır.

**ALDI**

Fələk məni tərki-vətən eylədi,
Həsrət gözüm yolda ay ilə qaldı.
Hicrandan yük tutdu, qəm şələlədi,
Çəkdiyim qovğadı, ay ilə, qaldı.

Qoy boynuma təqsirimi, budara,
Günahkaram, çəkdir məni bu dara.
Yaxın ikən uzaq düşdü, budu, ara,
Daha görüşümüz ay-ilə qaldı.
Aldı sinəm üstün yara, gəlmədi,
Təbib neştər vurdu, yara gəlmədi.
Nə dedin, ay Nəcəf, yara, gəlmədi,
Gözlərim yolunda ayilə qaldı.

## UZAĞAM İNDİ

Vəfalı dostuma yalan satmaram,
İlqara doğruyam, üzağam indi.
Əmanət eylədim köhlən atımı,
Nainsaf aldatdı, uzağa mindi.

Yar qəddinə geyinibdi sağ alı,
Layiq deyil, qurma mənə sağ alı.
Şəfa tapar, yaralarım sağalı,
Qoysan üzüm üstə üz, ağam indi.

Ömür bağın demək olmaz dər, yada,
Eynim yaşın eyləyibsən dərya da.
Qıya baxıb, qərq edirsən dəryada,
Deyirsən Nəcəfə üz, ağam indi.

## BİR İNCƏSİNƏ

Xublar məclisinə güzar eylədim,
Göründü gözümə bir incə sinə.
Dərd tüğyan eylədi, həddini aşdı,
Könül mayil oldu bir incəsinə.

Bağ salıb becərdim, ayə, nə dərdim?
Kimsəm yox, gətirəm əyanə dərdim.
Artıbdı canımda, ay ana, dərdim,
Olubdu dağların birincə sinə.

Çox eylər Nəcəfə, ay ağa, bu kar,
Olmaya əzəldən, ay ağa, bu kar?
Yuyar qəssal qəddim, ay ağa bükər,
Aparıb qoyarlar bir incə sinə.

## BƏHMƏN NƏRİMANLI
*(1901-1980)*

***Bəhmən İbrahim oğlu Qarayev 1901-ci ildə Göyşə mahalının Hüseynquluağalı (Nərimanlı) kəndində anadan olub. Beş yaşında atasını itirib. Məlahətli səsi və qabiliyyəti onu aşıqlığa gətirib çıxarıb, 1928-ci ildən aşıqlığa başlayıb.***

***O, yaradıcı aşıqlardandır. Aşıq şeirinin, demək olar, bütün növlərində nümunələr yaradıb. Rəngarəng şəkillərdə yazdığı şeirləri mövzu baxımından da nəzər-diqqəti cəlb edir. İctimai-siyasi motivli poetik örnəkləri məhz o dövrdə baş verənlərə münasibətin ifadəsi olaraq səciyyələnir.***

***Saz havalarını özünəməxsus əlavələri ilə zənginləşdirib. Xalq arasında "Şair Bəhmən" adı ilə də tanınıb. Ayrı-ayrı toplularda, "Sazlı-sözlü Göyçə" kitabında şeirlərindən nümunələr verilib.***

***Aşıq Bəhmən 1980-ci ildə vəfat edib.***

### DEYİRƏM

Bu sinəmdə təb coşanda sözü peydər deyirəm,
Həqiqətdən, nəsihətdən gör nə qədər deyirəm.
Anlayana mətahımdı, ləli-gövhər simuzər,
Əgər ki, alan olmasa, onda hədər deyirəm.

Bu dünyanın qapısını əzəldən açandı söz!
Əhli-ürfan məclisində bil, ləli-mərcandı söz!
Anlamaz nadan yanında bir çuval samandı söz!
Bu misalla  tut hesabı, gəlib-gedər, deyirəm.

İnsanlığa qiymət verən elmdir ki, var olar,
Elmsizlər ah-vay çəkər, dərdə giriftar olar,
Bəhmən, sən də qəm eyləmə,  sözlərin aşkar olar,
Bu dünyada çəkmə dərdi, etmə kədər, deyirəm.

## GETDİ

Dünya, sən nə bivəfasan,
Qoydun belə adət, getdi.
Bu yolda karvan əylənməz,
Gələnlər nabələd getdi.

Kimi olar, kimi ölər,
Kimi ağlar, kimi gülər,
Kimi bilməz, kimi bilər,
Kimi aşkar, xəlvət getdi.

Dünyanın işi qolaydı,
Kimi dərviş, kimi baydı,
Kimi gəldi günün saydı,
Kimi çəkdi ləzzət, getdi.

Dillərdə söylənən adı,
Söhbəti dil-dəhandadı,
Cəmi aşıqlar ustadı,
Heyif, aşıq Əsəd getdi.

Yatıbsan, yoxsa oyaqsan?
Gələnə, gedənə baxsan,
Bəhmən, sən də bir qonaqsan,
Eyləsə də xiffət, getdi.

## ƏVƏZİNDƏ

Ala gözlüm, şanə əyib zülfünü,
Qoy əsim telində yel əvəzində.
Gecə-gündüz mən çəkirəm ahü-zar,
Xəzan dəyib, soldum gül əvəzində.

Eşqin bu sinəmə çəkibdi dağı,
Mah camalın olub  cahan çırağı,

Lalə tək qırmızı, gülgəz yanağı,
Nə geysən yaraşır, al əvəzində.

Bəhmən qoyub canın yolunda niyaz,
O gizlin dərdini sən də mənə yaz.
Ölsəm, məzarımı sən özün gəl qaz,
Ayaq bas sinəmə  yol əvəzində.

## GÖZLƏRİN

Qafil bir ox atdı bağrım başına,
Süzülüb baxanda ala gözlərin.
Baxcağın canımı üzüb apardı,
Olubdu başıma bəla gözlərin.

Pünhan, yan qıyqacı dönüb baxanda,
Yüz min nəzakətlə kirpik çaxanda,
Müjgan oxun sinəm üstə çaxanda,
Az qaldı, canımı ala gözlərin.

Bəhmənəm, olmuşam mən sənə mayıl,
Gözlərin ağlımı eylədi zayıl,
Hər nə ki, buyursan, olaram qayıl,
Salıb məni min xəyala gözlərin.

## AY ÜZƏ-ÜZƏ

Qəm bəhrindən çıxa bilməm kənara,
Gəzirəm hər yana ay üzə-üzə.
Dərdim çoxdu, sən təbibsən, sən ara,
Əlli də yetirdi a yüzə, yüzə.

İstəyirəm dərdü-qəmdən azalım,
Dil çox dedi, mən deyirəm az alım.
A bimürvət, a nainsaf, a zalım,
Alırsan canımı a üzə-üzə.

Bəhmənəm, ürəyim düylü o dağda,
Məcnuna nisbətəm, Leyli o dağda.
Bəd əsə, qorxuram zülfü o dağda,
Pərişan tökülüb ay üzə, üzə.

## BİR ÜZÜM, ÜZÜM

Payızda yetişən meyvə içində,
Dəhanda ləzzətli bir üzüm, üzüm.
Bəslənər bir boyda, bəstə biçimdə,
İstədim, bu bağdan bir üzüm üzüm.

Könlümün xanəsin bağın ə dərdi?
Naşı bağban, yolçu bağdan nə dərdi?
Sevgi çatsa sevgisinə, nə dərdi,
Dəymədi canana bir üzüm, üzüm.

Bəhmənə açılar bağlı dər indi,
Kamil bağban, meyvə dəydi, dər indi,
Eşqin bəhri, mən gəzmişəm, dərindi,
Qəvvasıyam, indi bir üzüm, üzüm.

## A YARA MƏNİ

Dərdi-qəm əlindən cana gəlmişəm,
Sən də incidirsən, a yara, məni.
İşrətli çağında istəkli dosta,
Dar gündə ha dedim, ay ara məni.

Bu qəm, küdrət mənə çoxdan yaradı,
Ha gəlmir guşimə çoxdan yar adı,
Cəsəd şan-şan oldu, çoxdan yaradı,
Bir təbib gərəkdi a yara məni.

Bəhmənə eyləmə sən də naz arı,
Həmişə olubdu səndə nazarı,
Namərdə nə yalvar, sən də nə zarı,
Qoymadı yetirəm o yara məni.

## NÖVRƏS İMAN
*(1903-1953)*

***Növrəs İman 1903-cü ildə anadan olub, Aşıq Ələsgərin qardaşı Məşədi Salahın oğludur. O, dini elmlərə kifayət qədər dərindən bələd olub, bədii və tarixi kitabları mütaliə yolu ilə zəngin bilik əldə edib. Gənc yaşlarından mühitdə istedadlı şair kimi tanınıb, 1925-ci ildən aşıqlıq etməyə başlayıb.***

***Növrəs İman 1930-cu ildə Göyçədən Azərbaycana gəlib və 1932-ci ildən taleyi naməlumdur. Ehtimal olunur ki, 1953-cü ildə Ərdəbildə vəfat edib.***

***Onun şeirlərinin bir hissəsi yaddaşlarda qalıb. Son dövrlərdə - 1970-ci ildə Tovuz rayonunun Aşağı Əyyublu kəndində Məşədi Qədim adlı şair təbiətli bir kişidən İmanın öz xətti ilə yazdığı bir dəftər tapılıb. Burada onun min misradan artıq poetik irsi vardır.***

***Xalq arasında haqqında rəngarəng əhvalatlar, rəvayətlər danışılır. Onların bir qismi folklorşünaslar tərəfindən yazıya alınıb. Aşıq Ələsgər, Aşıq Əsəd, Aşıq Nəsəf, Usta Abdulla və s. sənətkarlarla əlaqələri haqqında olan hekayətlər bunun örnəyidir.***

***Növrəs İmanın şeirləri 1930-cu illərdən ayrı-ayrı toplularda işıq üzü görmüşdür. "Seçilmiş əsərləri" 2004-cü çap olunub.***

### GƏRƏK

Kişi üçün əzəl günnən başda çox kamal gərək,
Sərf etməyə doğru yolda əzəldən zülal gərək.
Həqiqətdən əxz eyləyə, mərifətdən annaya,
Məhşər günü olmayacaq, onda dövlət mal-gərək.

Kimi alar hökmranlıq, ədalətdən danışar,
Mərdin əli açıq olar, səxavətdən danışar.
Kimi məlul-müşgül gəzər, şikayətdən danışar,
Bu işlərə qərəl qoyan həyyi-layəzal gərək.

Mala, mülkə bel bağlayıb, kiminin var həvəsi,
Həcv eyləyib yoxsulla, tutma ac ilə bəhsi.

Cəhənnəmnən betər olub bu dünyanın tənəsi,
Qurulanda Haqq divanı, verə bir macal gərək.

Növrəs İman, cəfa çəkmə, bu dünyadı bivəfa,
Vaxt yetişsə, mələk əl-mot bircə gəlməz insafa.
Açıq söylə kəlmələrin, sat mətahın sərrafa,
Qədirbilən qiymət qoyub ala dalbadal gərək.

## GÖRMƏDİM

Dünya, sənin gərdişindən bir kam alan görmədim,
Neçə bağban bağ bəslədi, gülün dərən görmədim.
Süfrə üstdə nan yeyənlər hamı sənə can deyir,
Yaxşı dostu dar günündə yada salan görmədim.

Haqq yolunda Yahya getdi, canı verdi qurbana,
Eyyub oldu cannan bezar, Yusif düşdü zindana,
Leyli-Məcnun, Şirin-Fərhad – kim yetişdi kamına?
Onlar yandı, külə döndü, bir kam alan görmədim.

Növrəs İman, dərsin azdı, qulluq eylə ustada,
Məhşər günü Şahı-Mərdan özü yetişsin dada.
Məlul gəldim, müşkül getdim, gün keçirdim səhrada,
Mənim kimi qəm yükündə köhlən yoran görmədim.

## VAR

Yaralı gəlmişəm fani dünyaya,
Mənim sağalmağa dərmanımmı var?
Əzrayıl gələcək canım almağa,
Onu verməməyə fərmanımmı var?

Sana qurban olum, a mehribanım,
Bu qəmü-möhnətə necə dayanım?
Kim çəkər keşiyim, kim kəsər yanım,
Mənim Ələsgərim, Qurbanımmı var?

Mənim ahım ərzü-səmanı tutar,
Sən məni eylədin Sənandan betər.
Bu hicran odundan İmanı qurtar,
Yolunda sadağa bir canımmı var?

## GÖRÜNÜR

Həyat bir dövrandı, ikiüzlüdü,
Qarası görünür, ağı görünür.
Hər sözün, söhbətin öz məqamı var,
Çürüyü görünür, sağı görünür.

Bir barlı bağçaydım, barım kəsildi,
Vaxtsız xəzan əsdi, karım kəsildi,
Vətənimdən etibarım kəsildi,
Qürbət ellər mənə yağı görünür.

Novrəs İman Haqdan istər payını,
Dərdə düşsün müxənnəti, xayını.
Yemə çörəyini, içmə çayını,
Namərd süfrəsində ağı görünür.

## AĞLARAM YOLUNDA, ŞƏHRİ-LƏNKƏRAN

Ağlaram yolunda, şəhri-Lənkaran,
Bura qürbət eldi, bizim el deyil.
Baharın fəslində  çox olur boran,
Dəryadı gözlərim, axar sel deyil.

Bülbüləm bağında, güllər bitməmiş,
Rəhm eyləyin üstən fəsil ötməmiş.
Bir qərib cavanam, kama yetməmiş,
İstərəm ki, yetəm bu, o yol deyil.

Sahibi əvvəlim, həm axrı sənsən,
Lafeyi-ənbiya hökmü dərinsən.
İnni-cinni ağası, bəhri bərisən,
Görünür ki, İman sənə qul deyil.

## AY MARAL

Çarxı-fələk məni yaman oxlayıb,
Axır yaralardan qanım, ay Maral!
Mən də sənin kimi yaman dərdliyəm,
İnildəmə, çıxdı canım, ay Maral!

Tifil ikən ustad oldum dünyada,
Bir Şirinə Fərhad oldum dünyada,
Çöl-biyaban, səhra oldum dünyada,
Yoxdu elim, nə məkanım, ay Maral!

Göyçə sakiniyəm, adımdı İman,
Könlüm çox sınaqda, halım pərişan.
Hər nə ki sirrim var, eylədim bəyan,
Dedim sana hər nişanı, ay Maral!

## ÇƏTİNDİ

Gəldi Məhərrəmlik, kəsdi qabağı,
Çıxmaq olmaz bir kənara, çətindi.
İstəkli qohumlar, vəfalı dostlar,
Sizdən uzaq düşsə ara, çətindi.

Məlul könlüm düşüb qəm dəryasına,
Əridir cismimi nar havasına.
Gərəkdi, əyləşəm Əkbər yasına,
Ağlamasam Ələmdara, çətindi.

Hər an zikrimdədi ol şahi-əbrar,
Bahar buludutək yaş eylərəm car.

Həsrətin çəkirəm, bir səfərim var,
Orda olmaq üzüqara, çətindi.

Mətahım dürrüdü, alan yox, satam,
Hüseyni-şəhidin matəmin tutam.
Oğul yolu gözlər binəva atam,
Həsrət çəkir o biçara, çətindi.

Bu dünyanı görən, özün öyməsin,
Yaralı qəlbimə ellər dəyməsin.
Tanrı heç kimsədən nəzər əyməsin,
Düşsə İman kimi dara, çətindi.

## DEYƏRSİZ

Hələ qəflətdəsiz, yatmısız belə,
Sayıb məni bir divana deyərsiz.
Cəfanız çox olar, yəqin il-ilə,
Dərdinizi ruhi-cana deyərsiz.

Sərsəri fənada qırılar canlar,
Tökülər yaxandan çox nahaq qanlar.
Seçilməz haqq-nahaqq yolu qananlar,
Məəttəlik bu divana, deyərsiz.

Ucalar dillərdə ah ilə fəryad,
Bir tərəfdən olmaz eyləyən imdad.
İstəkli dost dostun etməyəcək yad,
Kəc dolanıb bu zamana,  deyirsiz.

Yanmaz, gecə, çox çıraqlar qaralar,
Gərdiş eli bir-birindən aralar.
Pozular bağçalar, güllər saralar,
Səfər edib biyabana deyərsiz.

Ömrə vəfa yoxdu, çoxdu cəfası,
Bəhrəm olsun bu dövranın əsası.
Novrəs İmandakı dərdin binası
Qurulubdu doğru yana, deyirsiz.

## DƏRD ÜZ VERİB,
## NİTQİM SÖYLƏR KƏLAMI

Dərd üz verib, nitqim söylər kəlamı,
Bəlkə, sözüm yatanları oyada.
Səs gəlsə guşuna, alar salamı,
Kişi gərək baxsın dost ilə yada.

Qəlbi doğru olan keçəmməz üzdən,
İnsan çox inciyər tənəli sözdən.
Biqeyrət oğuldan, binamus qızdan
Sonsuzluq yaxşıdı fani dünyada.

Tərbiyə gərəkdi ata-anadan,
Mərifət lazımdı əvvəl binadan.
Yüz də cəhd eyləsən, olarsan nadan,
Xidmətin olmasa kamil ustada.

Özgə zəhmətindən dövlət, var olmaz,
Kimsəyə bir zərrə xeyir-kar olmaz,
Kasıblığı kişi üçün ar olmaz,
Bu şərt ilə doğru çıxa üqbada.

Arif olan, huş ver sən bu sözlərə,
Namərd hər bəlanı gətirər sərə.
Kimdi, səyyah olub düşə çöllərə,
İman kimi gəzə dərin dəryada.

## DOYUNCA

Əziz ata, itgin gedən fərzəndin
Ağla, hey düşəndə yada, doyunca.
Mənim gərdənimdə çərxin kəməndi,
Dolandırır bu dünyada doyunca.

Məndən dost-qohuma azca gileylə,
Nə qarğa dalımca, nə hədyan söylə.
Əl götür duaya, minacat eylə,
Bəlkə, yetəm bir murada doyunca.

Halal qıl İmanı, qohum-qardaşım,
Çeşmim ağlar, qaranlıqdı Günəşim.
Əgər bir ilahi düzəltsə işim,
Şad olaram Kərbəlada doyunca.

## VAR

Ey mələk simalım, qəddi minalım,
O sərxoş baxışda əlamətin var.
İsgəndər cəlallım, Hatəm səxalım,
Eşqindən başımda qiyamətin var.

Dilimin kəlməsi – Ayeyi-Quran,
Telinə sadağa varımdı bir can.
Yaraşır şəninə bu külli-cahan,
Yusifi-Kənana şəbahətin var.

Dəhanın çeşmeyi-Abi Səlsəbil,
Verib qüdrətindən cəbbarü-cəlil.
Ədalətdə sənsən, söyləsən dəlil,
Məhşərdə möminə şəfaətim var.

Yüz desəm vəsfini, gəlməz hesaba,
Cəbinin təşbehdi qövseyniqaba.

Qədəmindən öpən batar savaba,
Yazılmış sinəmdə, hekayətin var.

Səni xəlq eləyib qadiri-sübhan,
Cəmi gözəlliyin nişanbanişan.
Pərtövü cəmalın şövkəti-rizvan,
İmantək quluna hidayətin var.

## OLA

Könül bağlayanda bir şux gözələ,
Baxtın kəsə, bir istəkli yar ola.
Əndazədən düzgün, ağılda kamil,
Dinməmiş könüldən xəbərdar ola.

Açıla gül üzü nobahar kimi,
Sinəsi dağlara yağan qar kimi,
Dikələ məməsi təzə bar kimi,
Necə ki, budaqda yetkin nar ola.

Gülərüzlü, şirin dilli, xoşqabaq,
Dolana başına pərvanə sayaq,
Qismət et, ilahi, qoyma sən uzaq,
Bəlkə, İmana da xidmətkar ola.

## GÖZƏLDİ

Bir dilbəri bəsləyibdi anası,
Vəsfi düşüb bu cahana, gözəldi.
Canana tay olmaz gölün sonası,
Bəzək verib cismü-cana, gözəldi.

Savalan qarıdı onun sinəsi,
Gövhərdi kalamı, ləldi kəlməsi,
Dinəndə insana xoş gəlir səsi,
Şəkər əzib dil-dahana, gözəldi.

Gözdən qoymaq olmaz belə sirdaşı,
Nə gözəl çəkilib, qaradı qaşı,
Tərlan tamaşalı, xubların başı,
Dəyişmərəm ol qılmana, gözəldi.

Mahalda, obada heç tayı yoxdu,
Qəmzələri neştər, kirpiyi oxdu,
Bu dünya üzündə gözəllər çoxdu,
Doğrudan da bu bir dana gözəldi.

Xəstəyəm, dərdimə ləbləri şəfa,
Bir kərə gəlmədi mürvət, insafa,
Hər zaman yolunda çəkirəm cəfa,
Cövrü sitəm bu İmana gözəldi.

## YARA DƏRMANI

Ağalar ağası, şahların şahı,
Qadir Sübhan verir yara dərmanı.
İmamlar sərdarı, ellər pənahı,
Şahi-Mərdan verir yara dərmanı.

Salam alır Cəbrayıldan, gerçəkdən,
Mən ölürəm, yaralıyam bir cəngdən,
Lalədən, nərgizdən, güldən, çiçəkdən,
Eləyib gülüstan yara dərmanı.

Mən qurbanam belə həkim-loğmana,
Ömrümün sevdası dönübdür qana,
Görən rəhm elərmi qərib mehmana,
Bulacaqmı İman yara dərmanı.

## YASİNƏM AĞLAR

Mənim kor taleyim, bu kəc iqbalım,
Pozulan könlümün yasinəm ağlar.
Günbəgün qarışıq keçən əhvalım,
Dilimdə oxunan "Yasin"əm, ağlar.

Qəhrim çoxdu, sən də qurma ayalar,
Əcəl gəlsə, vaxtsız canım ay alar.
Düşəndə yadıma əziz, ayalar,
Ah çəkər gözlərim, ya sinəm ağlar.

Növrəs İman, könlün alsa yar alı,
Geydirib qəddinə qəmdən yar, alı.
Maral südlü, vaxtsız, ovçu yaralı,
Dəyər vaxtı gözlə yasinəm ağlar.

## BAX
***(cığalı müxəmməs)***

Bu duran şux gözəlin
mahu ruxsarına bax.
Boy çəkir yüz nazınnan,
hüsnü dindarına bax.
Gözləri aldı canım,
dilbər dildarına bax.
Aşiqəm camalına,
muşdağam xətt xalına,
Çəkir xəyalım arzu,
yetəcəm vüsalına.

Özü bir alma tağı,
qoynudu cənnət bağı,
Öpüm o gül yanağı,
qoysan bimürvət yağı,

Qaşların afat,
Ləblərin xəyyat,
Al məni bircə,
Qoynuna sən yat.
Dil deyir, qolboyun ol,
əm dodaq, ləzzət elə.
Aç yaxa düyməsini,
sədri üsdə nara bax.

Qəddinə nəqş olunub,
sərv-sənubər kimidi.
Gərdəni tovuz təki,
sinə mərmər kimidi.
Danışa kəlmə verə,
ləbi şəkər kimidi.

Qurbanam cavana mən,
olmuşam divana mən,
Gör onun nəzakətin,
qaldım yana-yana mən.
Qədəm qoyanda hərdən,
qıya baxanda birdən,
Könül deyir ilahi,
ola mən ilə həmdəm.
Xoşdu görüşmək,
Alış-verişmək.
Bir oynamaxnan,
Gözəl öpüşmək.
Siz görün, ay camaat,
var yeri sözlərimin.
Bigünah can alanın,
bir o gülzarına bax.

Əyləşib naz ilə bu,
qumru tək avaz eylər.
Gah bizə baxır gülür,

Gah da qışı yaz eylər,
Gah mənə qəmzə satır,
ağlımı da az eylər.

Bu təki gözəl hanı,
gəzdim xeyli dünyanı.
Gör necə intizardı,
sevsin Növrəs İmanı.
Ay qız gəl insaf eylə,
doğru dil ilə söylə.
Al məni bir qucağa,
istəklicə qul eylə.
    Canım-canannan,
    Getməm yanınnan.
    Əmim şərabı,
    Ver püstanınnan.
Qolumu boynuna sal,
qat canımı sən cana.
Gör şəfa, eylə vəfa,
işrət rüzgarına bax.



## MUSA AĞKİLSƏLİ
*(1909-1948)*

***Aşıq Musa 1909-cu ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olub, Aşıq Ələsgərin qardaşı Məşədi Salahın kiçik oğludur.***

***Aşıq Musa mahir ifaçılığı ilə xalq arasında şöhrət qazanıb. Bir çoxları, o cümlədən Aşıq Hüseyn Cavan bir neçə il Aşıq Musaya şəyirdlik edib, saz havalarının incəliklərini ondan öyrənib.***

***Aşıq Musa 1948-ci ilin yayında avtomobil qəzası nəticəsində dünyasını dəyişib.***

### QARDAŞ

Qəlbim qan ağlayır, didəm yaş tökür,
Gözlərəm yolunu, gələrmi qardaş?!
Həsrəti, möhnəti bu canım çəkir,
Bəs, dərdi olan da gülərmi, qardaş?!

Əzizim, sənsizəm, olmuşam xəstə,
Gözüm yollardadı, qulağım səsdə.
Üzünü görəydim bu son nəfəsdə,
Daha özgə dilək dilərmi qardaş?!

İtirmişəm, axtarıram maralı,
Ovçu bərəsindən getdi yaralı.
Qəm çəkənlər mənim kimi saralı,
Təbib olsa, dərdim bilərmi, qardaş?!

Çağır, şahlar şahı yetişsin dada,
Qüssə-kədər olsa həddən ziyada.
Fələk məni ağlar qoydu dünyada,
Gözümün yaşını silərmi, qardaş?!

Musa məhbəsdədi, yoxdu həyanı,
Neylədin İmanı, ay kərəm kanı?!
Mən onsuz dünyada neylərəm canı,
Tükənməz dərdimi bölərmi qardaş?!

## AY AĞA, SİNƏ

Ömür istəmirəm, xudaya, səndən,
Yetir Haqq evinə, ay ağa, sinə.
Fələk bu zülmünü almadı məndən,
İnsaf deyil, yaxşı, ay ağa, sinə.

Səndə bir etibar haşa, görmədim,
Qəza qəhrin həddən aşa, görmədim.
Kimlər dövran sürdü başa, görmədim,
Çoxları yalvardı ay ağasına.

Musanın da dərdi Sinayə qaldı,
Yetmədi mürdələr, sin, ayə, qaldı.
Oxudu dərsini, "sin" ayə qaldı,
Qoymadın yetişə, ay ağa, "sin"ə.



## İSLAM YARPIZLI
***(1910-1943)***

***İslam Yarpızlı – İslam Məhəmmədəli oğlu Əmirzadayev 1910-cu ildə Göyçə mahalının Basarkeçər rayonunun Yarpızlı kəndində anadan olub.***

***1943-cü ildə Aşıq İslam İkinci Dünya müharibəsinə səfərbər olunub və cəbhədən geri qayıtmayıb.***

***Aşıq İslam Yarpızlı Daşkənd kəndindən Aşıq Abbasəli Xəlilov və Aşıq Abbasəli Nəzərovun ustadı olub, onların aşıq kimi yetişməsində əvəzsiz rol oynayıb.***

### YOX
***(bağlama)***

Bir ağacda beş budaq var,
İksinin meyvəsi yox.
Üç budaqda altı nar var,
O narın dənəsi yox.
Üç budaqda yetmiş iki
Haçasın aydın gördüm.
Doxsan altı bülbüldü,
Heç birinin nəfəsi yox.

Hər bülbüldə bir almaz var,
Əl vurma, dəsdin kəsər,
Hər budaqda bir yarpaq var,
Gecə-gündüz hey əsər;
Otuz cansız zərif gördüm,
Budaqları hey bəzər.
Hər budaqda şah əyləşib,
O şahın libası yox.

O şahları görmək üçün,
İki yüz on altı yolu var.
Hər yolun da bir haramı,

Haramın qannan xalı var;
Vəsf eyliyir Cavan İslam,
Budaqların qeyl-qalı var.
Pəhləvannar alt olubdu,
Heç birinin səsi yox.

**BAĞLIDI**
***(bağlama)***

Səng içində cüt şirin quş,
Onlar döş-döşə bağlıdı.
Bir şəhərə iki dərya bağlanıb,
Quşnan baş-başa bağlıdı.
Qırx nədi bu dünyada,
Altısı qələm çalır;
Beş nə deməkdi,
Beş də beşə bağlıdı.

Hansı dəryada səng var,
Səngin içində nə?
Nə yeyər, nə deyər,
Nə rəngin içində nə?
Nə ayağında, ay arif,
Nə təngin içində nə?
Hansı dəryada çarx hərlənir,
Harda daş-daşa bağlıdı?

Ay, arifəm deyənlər,
İslamın azarı nədəndi;
Bir məqama səfər eylədi,
Düşdü güzarı, nədəndi.
Qapısız, aynasız xanə gördüm,
Onun açarı nədəndi;
Sirdaş oldum bir işə,
İş də işə bağlıdı.

## NİFTALI SÜLEYMANOV
*(1911-1976)*

***Niftalı Kərbəlayi İsmayıl oğlu Süleymanov 1911-ci ildə Göyçənin Ardanış kəndində anadan olub. Oğlunun aşıqlığa meylini və həvəsini görən Kərbəlayı İsmayıl onu dövrünün tanınmış ustad aşığı Qızılvəng kəndində yaşayan Aşıq Qulunun yanına şəyird qoyub.***

***Aşıq Niftalı Süleymanov İkinci Dünya müharibəsinin iştirakçısı olub. 1942-1944-cü illərdə cəbhənin ön xəttində döyüşlərdə iştirak edib. Cəbhədən qayıtdıqdan sonra bir müddət doğma kəndində pedaqoji fəaliyyət göstərib.***

***1949-cu ildə aşıqlar müsabiqəsində iştirak edən Aşıq Niftalı müsabiqənin qalibi kimi mükafat və tərifnaməyə layiq görülüb. 1961-ci ildə aşıqların III Qurultayında iştirak edib.***

***Aşıq Niftalı həm də bədii yaradıcılıqla məşğul olub. Onun əsərlərinin hamısı günümüzədək gəlib çatmasa da, əlimizdə olan nümunələr göstərir ki, o, aşıq şeirinin müxtəlif formalarında mükəmməl poeziya nümunələri yarada bilib.***

***Aşıq Niftalı 1976-cı il sentyabrın 26-da dünyasını dəyişib.***

### GÖYÇƏNİ

Aşıqlıq sirrini öyrənən zaman
Ustadım Quluynan gəzdim Göyçəni.
Ələsgər dərsində görərsən ümman,
Könlümün oduynan sezdim Göyçəni!

Göyçə gölü şirin xəyala dalı,
Şah İsmayıl sevdi Miskin Abdalı.
Dodaqdan-dodağa düşəndə Alı,
Tarixi soyuynan bildim Göyçəni!

Niftalı od alıb ocaq odundan,
Divani, müxəmməs çıxmaz yadından.
Hikməti qananda bəlli adınnan
Adilıər oxuynan seçdim Göyçəni!

## AŞIĞIN

Vardığı məclisdə mərifət olsa,
Dinlənib aşınmaz sözü aşığın.
Sazını köklüyüf sədalı çalsa,
Meydanda qaşınmaz üzü aşığın.

Hər kəsə bəladı dilin əmması,
Əlhdən süzülər hər müəmması.
Kəlməsi cılızsa, yoxdu amması,
Mənalı sayılmaz düzü aşığın.

Niftalı dərsini deməz çəpinə,
Qiyməti bilinsə, düşməz çətinə.
Zili zildən, bəmi yetər təbinə,
Mətləbdən yayınmaz gözü aşığın.

## GÖYÇƏ

Qərib qonaxların yay düşərgəsi,
Könül quşdarının budağı Göyçə.
Qaynar bulax kimi qaynıyıb axır
Şeir sənətinin ocağı Göyçə.

Ələsgəri doğan doğdu dürr danə,
Mərd igidə süd veribdi mərd ana.
Ellər də söylüyür mərdi-mərdanə,
Canınnan çox sevir qonağı Göyçə.

Aşıx Niftalının binası sənsən,
Ağarmış saşdarın xınası sənsən,
Aşıx sənətinin anası sənsən,
Saz tutan əllərin qucağı Göyçə.

## BU YAZA

Bu gözəldən, yarəb, mətləb diləsən,
Lütf eylə dərdimi, nola, bu yaza.
Bülbül həsrət çəkər, gülüm var deyin,
Aşıxlar dərdini, nola, bu yaza.

Naşı ovçu çətin tapar maralı,
Həsrətinnən qəddim oldu yaralı.
Qazax irayonu, Əsgiparalı,
Kim ayrılsa, çətin dözər bu yaza.

Niftalıyam, sinəm yaman qəmlidi,
Özümdə qəm çoxdu, sazım dəmlidi.
Boyun qələmədi, adın Səlmidi,
Kim ayrılsa, çətin dözər bu yaza.

## SİNƏMDƏDİ

Ala gözlüm, bil ki, səni atmaram,
Həmənki məhəbbət var, sinəmdədi.
Narzan bulağını heç unutmaram,
Silinməz, nə sönməz, nar sinəmdədi.

İlqarım bütündü, söyləmə barı,
Vurursan sinəmə oxnan xəncəri.
Çıxanda qarşıma sən üzü bəri,
Eşqinən çalıram, saz sinəmdədi.

Yəqin bil, atmaram mən Xuramanı,
Ağlıyıb açmaynan köhnə yaramı.
İnciyif dosdunnan, kəsmə aranı,
Bil ki, namus, qeyrət, ar sinəmdədi.

Aşıx Niftalıyam, deyim gerçəyi,
Atmaram nə duzu, nə də çörəyi.
Həyat baxçasının ilham çiçəyi,
Özün əllərinnən dər, sinəmdədi.

## SƏNNƏN OLDU

Başına döndüyüm telli vəfadar,
İndi beybafalıx gör sənnən oldu.
Ömrüm başa yetdi fani dünyada,
Daha deyəmmərəm, var sənnən oldu.

Kamil təbib gərəh silə yaramı,
Gözü yaşdı qoydun qannı haramı.
Biymar vaxdı uçurdursan qalamı,
Gen dünya başıma dar, sənnən oldu.

Gül xara yapışsa, bülbül qan ağlar,
Beybafa gözdərin saraltma bağlar.
Od tutuf cəsədim cismimdə yanar,
Səpmədin üsdümə qar, sənnən oldu.

Aşıx Nifdalıyam, qara yazım var,
Əlimdə xatəvənd telli sazım var.
Hökmü-ilahidən bir murazım var,
Qalsa gözdərimdə, yar, sənnən oldu.



## MƏHƏRRƏM HACIYEV (AĞBULAQLI)
***(1913-2002)***

***Məhərrəm Məhəmməd oğlu Hacıyev 1913-cü ildə Göyçə mahalının Ağbulaq kəndində anadan olub. İbtidai təhsil alıb (1926-1930). Erkən yaşlarından musiqi duyumu, söz demək bacarığı, məlahətli səsi və aşıqlığa marağı ilə diqqəti cəlb edib.***

***Sənətin sirlərini Aşıq Talıbdan və Aşıq Nəcəfdən öyrənib. Göyçə aşıqlarının, eləcə də klassik aşıq sənətinin görkəmli nümayəndələrinin zəngin ədəbi irsini mənimsəyib. "Bozuğu Koroğlu", "Misri", "Göyçəgülü", "Cəlili", "Dilqəmi", "Sarıtel" və s. havaların mahir ifaçısı kimi şöhrətlənib.***

***Məhərrəm Ağbulaqlı 1949-cu ildə Azərbaycana köçərək Xanlar (indiki Göygöl) rayonunda məskunlaşıb. Azərbaycan aşıqlarının III və IV qurultaylarında iştirak edib.***

***Ağbulaqlı Məhərrəm – Məhərrəm Hacıyev 2002-ci ildə Göygöl şəhərində vəfat edib.***

### BARIŞAQ

Ağrın alım, küsmə məndən,
İnsaf eylə, gəl barışaq.
Ayrıla bilmirəm səndən,
Gəlib çatıb il, barışaq.

Sənsən bir ceyran balası,
Dağların gülü, lalası,
Naz eyləmə, ay qadası,
Bir üzümə gül, barışaq.

Sən ol Məhərrəmin yarı,
Bir sallan gəl bizə sarı.
Bağışla mən günahkarı,
Ver əlimə əl, barışaq.

## MAİS GƏNCƏLİ, GƏNCƏLİ

Mərd kişinin mərd balası,
Mais Gəncəli, Gəncəli.
Hər yana çıxıb sədası,
Mais Gəncəli, Gəncəli.

Hatəm kimi səxalıdı,
Dost, yoldaşa vəfalıdı,
Naməhrəmdən həyalıdı,
Mais Gəncəli, Gəncəli.

Dərya kimi elmi vardır,
Xaliqim üstündə yardı,
İmranıma barabardı,
Mais Gəncəli, Gəncəli.

El-obanı tutub adı,
Sevir dostu, sevir yadı,
Məhərrəmin qol-qanadı,
Mais Gəncəli, Gəncəli.

## VAR

Qadir Allah, sənsən mənim pənahım,
Bir yol göstər mənə, intizarım var.
Bağışla, yanında çoxdu günahım,
Gözüyolda qalan nazlı yarım var.

İslam olan şəxsin var bir ağası,
Cəmi dərdlərinin odur davası,
Əlbəttə, silinər könlümün pası,
Buna əzəl gündən etibarım var.

Məhərrəm qəm çəkməz meydanda qalsa,
Ərənlər sərvəri bir nəzər salsa,
Əgər hücum edib faşistlər gəlsə,
Mənə kömək duran ələmdarım var.

## KİMİ
*(Aşıq Ələsgərə)*

Şeir meydanında vüqarla durdun,
Möhtəşəm dağların ucası kimi.
Sənətə möhkəm bir təməl qoyubsan,
Misir ehramının bənnası kimi.

Sözündə vəsf olub el gözəlləri,
Tər qönçə, tər çiçək, gül gözəlləri,
Oxşayıb sazında tel gözəlləri,
Mehriban ananın laylası kimi.

Meydanında neçə qeylü-qal olub,
Neçə aşıqların dili lal olub,
Neçə molla, alim payimal olub,
Coşubsan elmlər dəryası kimi.

Deyirlər, hər şeyi bilib Ələsgər,
El ilə qəmlənib, gülüb Ələsgər,
Elə ki, məclisə gəlib Ələsgər,
Nur saçıb Günəşin ziyası kimi.

Bir də gəl cahana, Ələsgər əmi,
Aşıq Məhərrəmin qalmasın qəmi.
Yığılsın başına aşıqlar cəmi,
Aşıq Ələsgərin sədası kimi.

## OLSUN
***(İmran Həsənova ithaf olunmuşdur)***

Şəyird odur, ustad adın ucalda,
Elə şəyird, görüm, daim var olsun!
Nə mətləb istəsə, çatsın murada,
Həmişə əlində ixtiyar olsun!

Şəyird əgər itirməyə əməyi,
Haqq yanında qəbul olar diləyi.

Şahlar şahı olsun onun köməyi,
Ömürboyu tale ona yar olsun.

Məhərrəmin şirin sözü İmrandı,
Vuran qəlbi, görən gözü İmrandı,
Ellər yaraşığı düzü, İmrandı,
Görüm səfa sürsün, bəxtiyar olsun.

## CAVANLIQ

İndiyədək verdin mənə qol-qanad,
Sən məni saxladın yaxşı, cavanlıq.
Yalvarıram, qoyma düşüm həvəsdən,
Ömrün yaraşığı, naxşı cavanlıq.

Gəl, qoyma saçlarım tez ağarmağa,
Yolumu salmaynan yoxuşa, dağa.
Türfə gözəllərə mehman olmağa,
Geri qaytar ötən yaşı, cavanlıq.

Bir də Məhərrəmlə, gəl, sövda vuraq,
Həyatı, dövranı yenidən quraq.
Sən Allah, tərs olma, kəcliyi burax,
Axıtma gözümdən yaşı, cavanlıq!

## AĞLAMAZMI

Əgər ki, bir bülbül qəfəsdə qalsa,
Ah çəkib, sızlayıb, bəs, ağlamazmı?!
Pərvanə özünü yandırsa oda,
Şəmi onun üçün yas saxlamazmı?!

Görən, yerindəmi gəzdiyim bağlar?
Gözlərim görməsə, qəlbim qan ağlar.
Səfalı yaylaqlar, sərin bulaqlar,
Sizdən ayrı düşən tez qocalmazmı?!

İllər həsrətiyəm səni görməyə,
Sirr sözümü açıb aşkar deməyə.
Qarğıyıram zalım çərxi-fələyə,
Sevgi sevgisini yada salmazmı?

Salam olsun sizə, mənim ellərim,
Hələ ki cavanam, solmur güllərim.
Məhərrəməm, həsrət qalan əllərim,
Hicran sazım qürbət eldə çalmazmı?

## GÖRƏYDİM

Qadir Allah bir də səbəb olaydı,
Dostu, qohumları bir də görəydim.
Fələk ayrı saldı nazlı yarımdan,
Seyraqub qoymadı gülüm dərəydim.

Sağalaydı bu könlümün yarası,
Tapılaydı dərdlərimin çarası.
Uzaq oldu mənlə Vətən arası,
O yerləri görüb, sonra öləydim.

Ağlamaq peşəmdi, huş yoxdu sərdə,
Mən necə tab edim bir belə dərdə?!
Şahi-Mərdan yetişəydi bu yerdə,
Qurbanımı, nəzirimi verəydim.

Röyada bu gecə gördüm anamı,
Döşənib payına verdim salamı.
Ağlayıb, dəstindən mən aldım camı,
İntizaram, əhvalını biləydim.

Ağlama, ay ana, düşmə gümana,
Çox cavanlar qərq oldular ümmana.
Məhərrəm sığınıb Şahi-Mərdana,
Qismət ola, ziyarətə gedəydim.

## AY HAYIF-HAYIF
### *(Aşıq Əsəd Rzayevin ölümünə)*

Eşit, Azərbaycan, Göyçə elləri,
Aşıq Əsəd öldü, ay hayıf-hayıf.
Soldu bənövşəsi, qızıl telləri,
Qara torpaq aldı, ay hayıf-hayıf.

Qara torpaq, hamımıza vətənsən,
Öz işinə baxıb, bircə utansan.
Yaranan insanı bir gün unutsan,
Əsəd səndə qaldı, ay hayıf-hayıf.

Fələk, əldən aldın sən Ələsgəri,
Xəstə Qasım, İman elmin gövhəri.
Aşıq Hüseyn, Qurban gedəndən bəri,
Ozan qəmə daldı, ay hayıf-hayıf.

Ağladı el-oba, cəmi aşıqlar,
Çəkəcək qəlbində qəmi aşıqlar.
Gəldi məzarına, əmi, aşıqlar,
Bir dünya qaraldı, ay hayıf-hayıf.

Dünyada bir anlıq qonaqdır insan,
Qaldı ürəklərdə əziz, mehriban.
Heç çıxmaz xəyaldan, xatırlar zaman,
Demə, bir xəyaldı, ay hayıf-hayıf.

Ustad oldu Məhərrəmə, həm ata,
Çox dastanlar yazdı bu şən həyata.
İnsan gedəridir, durub həyata,
Əsəd çox zülaldı, ay hayıf-hayıf.

## ƏLİ ŞAİROV
*(1913-1943)*

***Əli Şamil oğlu Şairov 1913-cü ildə Göyçə mahalının Daşkənd kəndində anadan olub, Şair Məmmədhüseynin nəticəsidir.***

***Əli Şairovun şeirlərindən məlum olur ki, o, çox gözəl təbə malik şair və aşıq olub. Onun şəxsi sazı və əlyazmaları bu günə qədər qohumları tərəfindən qorunub saxlanılmaqdadır.***

***Əli Şairovun yaradıcılığında klassik aşıq üslubunda deyişmə və dərdləşmələrə də rast gəlinir. Müxtəlif janrlarda və dini mövzularda olan şeirlərindən məlum olur ki, aşıq Əli Şairov dini biliklər baxımından da zəngin olub.***

***O, 1941-ci ildə İkinci Dünya müharibəsinə gedib, 1943-cü ildə döyüşdə həlak olub.***

### AY QIZ

Nazınla öldürmə bizi,
Rəhm eylə gəl, bizə, ay qız.
Şəninə tərif deyərəm,
Müştaq olsan saza, ay qız.

Əndama geyib qırmızı,
Aşığı öldürür nazı.
Bülbül kimi vur avazı,
Yön çevir sən yaza, ay qız.

Mailəm siyah tellərə,
Tərifin düşüb dillərə.
Sona kimi cum göllərə,
Bənzə quba qaza, ay qız.

Guşunda var qızıl tənə,
Rübənd açıq, bəyaz sinə.
Əli qaldı yana-yana,
Bir dərdimi yaza, ay qız.

## GÖRDÜM

Qərib vilayətdə səhər çağında,
Bağçada açılmış təzə gül gördüm.
Lalə, nərgiz düzüb al buxağına,
Qüdrətdən qurşanmış incəbel gördüm.

Guşində göründü qızıl tənəsi,
Dağlar maralıdı, göllər sonası.
Güləndə sinəmə düşdü qadası,
Zəbanı söhbətli, şirin dil gördüm.

Əliyə xoş gəldi şirin küfdarı,
Qoynunda göründü bircə cüt narı.
Eyvandan boylanıb qayıtdı geri,
Gərdana tökülmüş siyah tel gördüm.

## KEYTİ DAĞI

Göyçə mahalından səfər eylədim,
Göründü gözümə mil, Keyti dağı!
Dastanı dilimdə əzbər söylədim,
Açılıb köksümdə gül, Keyti dağı!

Zimistanda qərq olursan dumana,
Baharda dönürsən sultana, xana.
Növrəs növcavanlar göz dikir sana,
Çoxdur pişvazında qul, Keyti dağı!

Əli gəzir qürbət eldə hər yanı,
Açılmaz sərindən çiskin, dumanı.
Çağırram sidq ilə Şahi-Mərdanı,
Görünsün gözümə yol, Keyti dağı!

## GETDİ

Həsrət qaldım baharına, yayına,
Dolandı fəsillər, il gəldi getdi.
Yazıq canım düşdü bulunmaz dərdə,
Yükləndi kəcavə, el gəldi getdi.

Pərvanə şamlarda oda qalandı,
Leyli Qeys deyib, dağı dolandı.
Sallanma naz ilə öldüm, amandı!
Çəkilib sinəmə mil gəldi getdi.

Geyinib əndama zərli koftanı,
Sənsən bu yerlərin sultanı, xanı.
Əlinin söhbəti, dini, imanı,
Tökülmüş gərdana tel gəldi getdi.

## İNDİ

Öz-özünə yenə aşığam demə,
Əl atıb dəstindən tutaram indi.
Adını dastanda əzbər eyləmə,
Qolların gərdəndə çataram indi.

Girrəm meydana mərdi-mərdana,
Salaram könlünü xofu gümana.
Naləni çatdırram o, Əl Osmana,
Hirsdə Rüstəm Zaldan betərəm indi.

Qəvvas gərək girə dərin dəryaya,
Döndərrəm gününü ahınan-vaya.
Baş əymərəm sənin kimi gədaya,
Əliyəm, halını qataram indi.

## VAR

Qış dolandı, budur, gəldi bahar, yaz,
Açılan güllərin gəlhagəli var.
Çiçəklər çağırır biri-birini,
Ötüşən bülbülün dilhadili var.

Göyərər örüşlər, olar göy çəmən,
Üstündə sehr edər qaşları kaman.
Sallanıb gələndə dağlardan duman,
Tökülən leysanın selhaseli var.

Əli deyər, bu sözləri dağlara,
İncəbellər gələr buz bulaqlara.
Bağçalar bar verər sağı-sollara,
Al-yaşıl bağların gülhagülü var.

## BU DADA

Sıtqınan çağırram yekdi Sübhanım,
Dar günümdü, özün yetiş bu dada.
Mərdlərin mövlası, – Ya Şahi Mərdan!
Dar günümdü, özün yetiş bu dada.

Qəmbərlə Şəhrizəri alıb gələn,
Hər sirli işləri aşkara bilən,
Ağ divi bənd edib, dünyaya gələn,
Dar günümdü, özün yetiş bu dada.

Nələr gördüm, könlüm etdi qubarı,
Sinəm üstə yandı atəşi, narı.
Əli, çağır qolsuz o Əlamdarı,
Dar günümdü özün yetiş bu dada.

## AY FƏLƏK

Oyandım qəflətdən çiskin, dumandı,
Görünmür gözümə ellər, ay fələk.
Çəkirəm ah-nalə, fəqan eylərəm,
Car olur eynimdən sellər, ay fələk.

Neçə Süleymanlar gəldi cahana,
Qalmadı onlardan bircə nişana.
Rəhm et, didəmdən tökülən qana,
Çəkilib sinəmə millər, ay fələk.

Əli olub dərdin-qəmin mehmanı,
Dərd əhli eylədin neçə cavanı.
Unutmaram qəlbdən Şahı-Mərdanı,
Fədadı yolunda qullar, ay fələk.

## GÖRMƏYƏM

Ay ariflər, bu dərd məni alıbdı,
Qorxuram ki, nobaharı görməyəm.
Bağça-bağa bağban olub bəsləyəm,
Əziyyətin çəkib, barı görməyəm.

Məcnun oylağıdır dağların başı,
Leylinin eşqindən tökürdü yaşı.
Kərəmi yandırdı Leyli atəşi,
Fərhad kimi yar bazarı görməyəm.

Əliyəm, virandı könlüm xanası,
Bu el qürbət eldi, yoxdu vəfası.
Ay şahların şahı, qullar ağası,
Qorxum budur, mən də yarı görməyəm.

## ABBASƏLİ XƏLİLOV
*(1913-2007)*

***Abbasəli Süleyman oğlu Xəlilov 1913-cü ildə Göyçə mahalının Daşkənd kəndində anadan olub. Şair Məmmədhüseynin nəticəsidir. Aşıq Abbasəlinin ustadı Göyçə mahalının Yarpızlı kəndindən olan Aşıq İslam olub. Abbasəli özü isə qardaşı Aşıq Novruzun ustadı olub. Aşıq Abbasəli həm ifaçı, həm də yaradıcı aşıq kimi tanınıb.***

***Aşıq Abbasəli İkinci Dünya müharibəsinin iştirakçısı olub, müxtəlif orden və medallarla təltif olunub. Müharibədən qayıtdıqdan sonra uzun müddət Gədəbəy rayonunda yaşayıb.***

***1953-cü ildə ata-baba yurdu olan Göyçə mahalından həmkəndliləri və qohumları deportasiya olunduqdan sonra 1965-ci ildə Aşıq Abbasəli də Bərdə rayonunun Yeni Daşkənd kəndinə köçüb.***

***Aşıq Abbasəli 2007-ci il sentyabrın 30-da Bərdə rayonunun Yeni Daşkənd kəndində vəfat edib.***

### MƏNİM

Elə baxdı zalım qızı,
Getdi sərdən huşum mənim.
Viran etdi qəlb evimi,
Qalmadı bir daşım mənim.

Şamaması qucaq-qucaq,
Yanaq lalə, buxağı ağ.
Gözəllərin yolunda bax,
Ağarıbdı başım mənim.

Abbasəli tutdu dilə,
Bürünmüşdü bəyaz tülə.
Canıyanmış bu gözələ,
Yaman qonub quşum mənim.

## DAĞLAR

Göylər sənə laylay çalır,
Ay vüqarlı, uca dağlar.
Gədikləri sərt sıldırım,
Qayaları haça dağlar.

Sənə heyran gör neçə göz,
Dillərdəsən, gəzib söz-söz.
Alovlanır ocaqda köz,
Tüstülənir baca, dağlar!

Abbasəli qatar-qatar,
Tərif deyib, şeir qoşar.
Hər gələndə nazlı bahar,
Cavanlaşır qoca dağlar.

## AY HAYIF

Qocalmışam, bükülübdü qamətim,
Olubdu ürəyim yara, ay hayıf!
Dünən həsrətimdən ölən gözəllər,
Bu gün gedir, bax əğyara, ay hayıf!

Uçub mürğu-ruhum könül dağından,
Özünə yurd seçdi qəm budağından.
Bülbül ayrı düşdü bağça-bağından,
Qönçə qismət oldu xara, ay hayıf!

Daha dərd görməkdən gözlərim doyub,
Qəm tüğyan eyləyib sinəmi oyub.
Tülkünü bir elə gözətçi qoyub,
Aslanı çəkdilər dara, ay hayıf!

Düşünmür sonunu ərzi-halının,
Qalmayır qeydinə qeylü-qalının.
Uyub işrətinə dünya malının,
Çoxusu aldanır vara, ay hayıf!

Abbasəli, neynəyirsən bu baxtı,
Getdi, geri dönməz cavanlıq vaxtı.
Xoş gün axtarırdım, qara gün çıxdı,
Gəlmədi bu bəxtim kara, ay hayıf!





## ORUC ƏHMƏDOV
*(1920-1976)*

***Oruc Vəli oğlu Əhmədov 1920-ci ildə Göyçə mahalının Yarpızlı kəndində anadan olub. Onun atası bölgənin tanınmış ustadlarından olduğundan, ailədə tez-tez təşkil olunan saz-söz məclisləri Orucun sənətə marağını daha da artırıb.***

***Qərbi Azərbaycandan növbəti deportasiya zamanı – 1949-cu ildə Aşıq Oruc doğma yurd-yuvasını məcburiyyətdən tərk edərək Gədəbəy rayonunun Zəhmət kəndinə köçüb. Qısa müdcdətdə burada da özünün sazı-sözü ilə tanınıb. 1953-cü ildə Gədəbəydə Aşıqlar ansamblı yaradıb və iyirmi ilə yaxın bu kollektivə rəhbərlik edib.***

***O, aşıq şeirinin müxtəlif formalarında maraqlı nümunələr də yaradıb. Gəraylı, qoşma, təcnisləri aşıqların repertuarında geniş yayılıb.***

***El sənətinin inkişafında xidmətlərinə görə Aşıq Oruc Azərbaycan Mədəniyyət Nazirliyinin Fəxri fərmanına və bir neçə dəfə pul mükafatına layiq görülüb.***

***Aşıq Oruc 1976-cı il iyulun 19-da Gədəbəy rayonunun Zəhmət kəndində vəfat edib və həmin kənddə də dəfn olunub.***

### NEYLƏSİN

Öz eybini bilməzlərə,
Qohum-qardaş, el neyləsin?!
Zatı xain olan kəsə,
Düzgün ürək, dil neyləsin?!

Elmə sinə gərməyənə,
Ustad dərsi görməyənə,
Düzə qiymət verməyənə,
Alim, şair bil, neyləsin?!

Eli sevər ər oğlu ər,
Qanı təmiz, canda hünər.
Haqsız ölsə nadan, sərsər,
Ona külüng, bel neyləsin?!

Sarvan ümid bağlar nərə,
Şair olan şah əsərə,
Səyyah yorğun, çətin bərə,
Ovun getsə, sel neyləsin?!

Aşıq Oruc, de sözünü,
Tərifləmə gəl özünü.
Bil, çevirsə el üzünü,
Yüz köməkçi əl neyləsin?!

**OLAR**

Alım-verim dostu olan,
Aylar-illər qanlı olar.
Təmannasız qeydə qalan,
Axır adlı-sanlı olar.

Bir şey verib, əvəz uman,
Dostun olmaz uzun zaman.
Fürsət düşüb, olsa aman,
Coşub dəliqanlı olar.

Oruc sevər insanları,
Qəlb-ürək bir olanları.
Könül istər bu anları,
Axı, həyat anlı olar.

## KÖLGƏSİZ
### *(bağlama)*

Səndən xəbər alım, ay Aşıq Teymur,
Necə daşdır, hər nişanı kölgəsiz?
O nədir ki, nə dincəlib, dayanmaz,
Nə dolanır bu dünyanı kölgəsiz.

O nədir ki, nəfəsi yox, qanı var,
O nədir ki, hər  bir rəngdən donu var?
O nədir ki, nə yurdu, nə məkanı var,
Gəşt eyləyər hər bir yanı kölgəsiz.

Oruc deyər: Nədir yerin pərgarı,
O nədir ki, gah qız olur, gah qarı.
O nədir ki, yerin, göyün ləngəri,
Əgər bilsən, hər nişanı kölgəsiz?!...

## VAR

Özgənin bağına həsrət deyilik,
Bizim könül açan öz bağımız var.
Tamarzı deyilik nara, heyvaya,
Onu yetişdirən torpağımız var.

Zülmət gecə olsa, yansın çırağı,
Bizimdir həyatın gözəl növrağı.
Göz üstə saxlarıq gələn qonağı,
Gəzməyə səfalı yaylağımız var.

Qəhrəman yurdudur mənim bu yurdum,
Poladdan möhkəmdir yenilməz ordum.
Aşıq Oruc deyər, hər kimdən sordum,
Dedi, bundan gözəl sabahımız var.

## YAZARDIM

Yenilməz qüdrətim olsaydı əgər,
Mərdlərin adını başa yazardım.
Yaxşıya baharı bağışlayardım,
Yamanı ömürlük qışa yazardım.

Heç cavan canları verməzdim bada,
Qıymazdım onları torpağa fəda.
Mən özüm düşərdim eşqidə cüda,
Aşiqi məşuqla qoşa yazardım.

Yaltağın başına salardım kəndir,
Xainin yerini edərdim təndir.
Orucam, əyrini seçərdim bir-bir,
Həyat ünvanını boşa yazardım.

## YAXŞIDIR

Çınqıllı, kəsəkli çətin yollardan,
Mərdin keçib adlaması yaxşıdı.
Qışda məskən salsan Kür qırağında,
Yayda çıxsan, dağ havası yaxşıdı.

Səhərin havası gələr sərindən,
Xəyalım dolanar, gəzər dərindən.
Mərmər qayaların qumsal yerindən,
Bulaqların qaynaması yaxşıdır.

Hər yana baxasan Qoşqar dağından,
Zövq alasan baxcasından, bağından.
Tülkünün atılıb tullanmağından,
Əlbəttə ki, şir davası yaxşıdı.

Oruc dinməz, söz təhrini bilməsə,
Ya axşamın, ya səhərin bilməsə.
Bir insan ki, öz qədrini bilməsə,
Heyvan olub otlamağı yaxşıdı.

## YAR SİNƏ-SİNƏ
*(Təcnis)*

O hilal qaşını görəndə gözüm,
Müştaq oldum onun yar sinəsinə.
Laçın tərpənişli, tovuz cilvəli,
Qaldım qulluğunda, yar, sinə-sinə.

Gəzib bu dağları lalə üzəsən,
İnsaf eylə, gəl dərdimi üzəsən.
Busə nədir, qıymayırsan üzə sən,
Xəncərlə bağrımı yar sinə-sinə.

Oruc deyir: Sən gələndə Yasəmən,
Gah şad olub, gah batıram yasa mən.
Nitqi, nəfəsindən qopur yasəmən,
O nədir, köksündə yar sinə-sinə.



## VALEH BİLAL
*(1926-2000)*

***Aşıq Valeh Bilal – Valeh Sadıq oğlu Xıdırov 1926-cı ildə Basarkeçərin Babacan kəndində anadan olub, uşaqlıqdan saza-söz böyük maraq göstərib, böyük qardaşı Məhəmmədəli Pünhandan, əmisi aşıq Qəribdən və dayısı aşıq Vəlidən aşıq sənətinin incəliklərini öyrənib, eldə-obada bir aşıq kimi tanınıb. Yazıb-oxumaq bilməsə də, iti zehni və qabiliyyəti ilə fərqlənib, bircə dəfə yanında oxunan şeiri yaddaşına köçürüb.***

***Aşıq Valeh 1950-ci ildə Tovuz rayonunun Yanıqlı kəndinə köçüb və burada məskunlaşıb.***

***1956-cı ildə Kəlbəcərdə İstisuda Səməd Vurğunla görüşünü əziz bir xatirə kimi heç vaxt unutmayıb. Onun ifasını bəyənən bu böyük şair Bakıya gəlib onunla görüşməsini deyib, bir aşıq kimi yaxşı gələcəyi olduğunu söyləyib. Təəssüf ki, Səməd Vurğunun vaxtsız ölümü aşığın onunla Bakıda görüşməsini mümkünsüz edib.***

***Aşıq Valeh 2000-ci ildə Tovuz rayonunun Yanıqlı kəndində dünyasını dəyişib və həmin kənddə dəfn olunub.***

### XALQIN

Uca eyləyib başını,
Göyərtsən Vətən daşını,
Seçər pislə-yaxşısını,
Tərəzidir gözü xalqın.

Düşməmişik haya-küyə,
Kim istər ki, qəlbə dəyə.
Yol az qalıb qələbəyə,
Güləcəkdir üzü xalqın.

Çəkilsə də hey çarmıxa,
Deməyibdir qara ağa.
Dönən zaman Qarabağa,
Olacaqdır yazı xalqın.

Yaxşı bilir düşmən, yağı,
Dərd çəksə də, deməz ağı.
Çox alıbdır sinə dağı,
Bir məktəbdir özü xalqın.

Nəfəsi eldən alarsa,
Vətənə sadiq qalarsa,
Əqidəsi bir olarsa,
Əyilərmi dizi xalqın?!

Aşıq Valeh yaxşı bilir,
Bu qan-qada hardan gəlir.
Bir səda ki, Haqdan gəlir,
Susmayacaq sazı xalqın.

## **İNAM**

Son sözünü əzəl demə,
Hər yetənə gözəl demə,
Tökülənə xəzəl demə,
Payız gəlməmiş, gəlməmiş.

Alış sirri saxlamağa,
Hünər yoxsa, çıxma dağa.
Can atma, gəl, ağlamağa,
Üzün gülməmiş, gülməmiş.

Hər fəslin də öz yeri var,
Söyüd heç vaxt gətirməz bar.
Rahat olmaz vəfalı yar,
Dərdi bölməmiş, bölməmiş.

Valeh sözü üzə deyər,
Yalan düzü çətin əyər.
Əkdiyini vaxtında dər,
Qışda solmamış, solmamış.

## SEVİNDİRİR

Sazımı sinəmə sıxıb çalanda,
Məni dindirdiyim tel sevindirir.
Sevib, sədaqətlə eşqə qovuşan,
Sevinclə yaşayan el sevindirir.

Elə ki, gedirəm mən el toyuna,
Zənguləm bənzəyir qartal qıyına.
Sübh tezdən çıxanda dağlar qoynuna,
Çəməndən dərdiyim gül sevindirir.

Min  şükür Allaha, doğma elim var,
Xoşbəxt gələcəyə gedən yolum var,
Ürəklər oxşayan bəmim, zilim var,
Eli, oxuduğum zil sevindirir.

Neçə ki, döyünür sinəmdə ürək,
Halallıq gətirir mənə düz çörək.
Düzgün yol tutmuşam babalarım tək,
Məni bu tutduğum yol sevindirir.

Mən aşıq Valehəm, söz xiridarı,
Xoşbəxtəm, tapmışam vəfalı yarı.
Qəlbimi üşütməz dağların qarı,
Məni Vətən, oba, el sevindirir.

## ALIRAM

Göz açdım dünyaya Göyçə elində,
Vətən məhəbbəti yaşar qəlbimdə.
Sazım sinəmdədir, nəğməm dilimdə,
İlhamımı mən bu eldən alıram.

Ellər göyərdəndə yazda səməni,
Ürək daim anır ana Vətəni.
Gəzib dolandıqca şehli çəməni,
İlhamı açılan güldən alıram.

Vurğunu olmuşam obanın, elin,
Qədrini bilmişəm hər açan gülün.
Sinəm üstə dinən sazımla, bilin,
Zil səsi sazdakı teldən alıram.

Mən aşıq Valehəm, el sənətkarı,
Qoşma, gəraylıdır qəlbimin varı.
Mənə ilham verir Vətən dağları,
Gücümü çağlayan seldən alıram.

## DÜNYADI

Düz olsan həyatda əhdi-ilqara,
Dərdini səninlə bölən dünyadı.
Sən hələ görməmiş tərs-avandını,
Demə ki, bu dünya yalan dünyadı.

Kimsə bilmir bu dünyanın işini,
Birini verəndə alır beşini.
Adama qıcayır zəhər dişini,
Mələk donu geymiş ilan dünyadı.

Hər zaman insanı çəkir sınağa,
Ağanı qul edir, nökəri ağa.
İnsanı çörəklə çəkir sınağa,
Əqrəbdir, quyruqla çalan dünyadı.

Nəfəsi ağırdır bəd nəzər kimi,
Böyükdür nifrəti, böyükdür kini.
Kimsə görməyibdir əzəl-ilkini,
Ömürlük sirr kimi qalan dünyadı.

Sevənə tuş edər qara sevdanı,
Həsrət-hicran verib, qaraldar qanı,
Heç vüsal görməmiş tez alar canı,
Cavan ömrə balta çalan dünyadı.

Xoş həyat yolunu məndən kəc salıb,
Cavanlıq ömrümə bir cəllad olub.
Valehəm, qüssədən gözlərim dolub,
Demə, əhdə vəfa qılan dünyadı.



## SALEH HƏSƏNOV
*(1930-1975)*

***Saleh Əhməd oğlu Həsənov 1927-ci ildə Göyçə mahalının Bala Qaraqoyunlu kəndində anadan olub. İkinci dünya müharibəsi illərində ailəsi ilə Gədəbəy rayonuna köçüb. Bir müddət sonra isə Tovuz rayonunun Düyərli kəndində məskunlaşıb. Həyatının mühüm bir hissəsini Goranboy rayonunun Qızılhacılı kəndində yaşayıb. Goranboy rayonunun mədəniyyət evində çalışıb, aşıq bölməsinə rəhbərlik edib.***

***Ustadı Aşıq Ələsgərin oğlu Aşıq Talıb və Aşıq Əsəd olub. Ayrı-ayrı toplularda çap olunan və aşıqların repertuarında səslənən şeirləri onun istedadlı sənətkar olmasını göstərir.***

***Aşıq Saleh 1975-ci il sentyabrın 21-də Goranboy rayonunun Qızılhacılı kəndində vəfat edib.***

### AYRI

Tifil ikən ah-vay çəkən,
Mənəm düşən eldən ayrı.
Qara gözlü, gülər üzlü,
Şirin-şirin dildən ayrı.

Bəlalıdı başım mənim,
Atılıbdı daşım mənim,
Gözdən axır yaşım mənim,
Üzüm durmur seldən ayrı.

Saleh deyər, çeşmi-xumar,
Yaralarım eylər qabar,
Gecə-gündüz ağlar, sızlar,
Sona düşsə göldən ayrı.

## YALVAR

Dedim: gözəl, həmdəm olaq,
Dedi: aşıq, saza yalvar.
Dedim: birgə deyək, gülək,
Dedi: söhbət, sözə yalvar.

Dedim: nazlı yarım olsun,
Dedi: işim, karım olsun.
Dedim: çoxlu varım olsun,
Dedi: onda aza yalvar.

Dedim: pərim, mürvətə gəl,
Dedi: Saleh, yola düzəl.
Dedim: məndən çəkməynən əl,
Dedi: qəmzə-naza yalvar.

## MƏNİM

Həvəsli bülbüləm, bir şirin diləm,
Düşübdür qürbətə güzarım mənim.
Alınır mətahım, çoxdu xirdarım,
Hələ kasad deyil bazarım mənim.

Bir bivəfa pozdu əhdi, ilqarı,
Çəkirəm həsrəti, var intizarı,
Əgər ki, dərdimə olmasa yarı,
Köçəndə od alar məzarım mənim.

Mən sənə nə deyim, bimürvət gözəl,
Gedib özgəsini sevəydin əzəl.
Yandırma Salehi, gəl, yola düzəl,
Kəsilibdi səbrü-qərarım mənim.

## VERDİN

Vəfasızlıq etdin, alagöz pəri,
Əzəl gündən mənə hicranı verdin.
Yolunda qoymuşam bu canu-səri,
Sən isə min cövrü-cəfanı verdin.

İndi kim olubdu yarın-yoldaşın,
Niyə tez qocaldın, ağardı başın.
Görəndə axıtdım gözümün yaşın,
Mənə dəryaları, ümmanı verdin.

Artıbdı Salehin dərdi, məlalı,
Tale küskünüdü, halısan, halı.
Ataşı yandırır eli, mahalı,
Gen dünyada ona zindanı verdin.

## GÖZƏL SƏN

Nədən incimisən, ay mina gərdən,
Sındırma könlümü barı, gözəl, sən.
Üzür ürəyimi qüssə, qəm, kədər,
Gəl eylə dərdimi yarı, gözəl, sən.

Sevəndə naz gərək, şirin söz gərək,
Qaş ilə göz gərək, gülər üz gərək,
Eşqə sədaqətli, əhdə düz gərək,
Unutmusan düz ilqarı, gözəl sən.

Sən mənim cananım, xub mehribanım,
Salehəm, uzaqda necə dayanım,
Ayrılıq odunda alışır canım,
Sinəndi dağların qarı, gözəlsən.

## AY YARI BİR DƏ

Aşıq, al sinənə sədəfli sazı,
Çağır avaz ilə ay yarı bir də.
Bilirsənmi, sənə var ərkinazı,
O dostun eyləyər ay yarı bir də.

Hərdən oxuyursan "Alagöz"ləri,
Deyirlər, əzizim, ala gözləri,
Çəkirdi məni də ala gözləri,
Dedim, qəmi bölək, ay yarı bir də.

Mən bülbüləm, o da güldü, gül məzə,
Çağır gəlsin, qoy versin o gül məzə.
Saleh deyər, qarşı gəldim gülməzə,
Pərişanam, yetir əyyarı bir də.

## MİN AYƏ, PƏRİM

Eşqin havasıdı, yoxdu çarası,
İstəyirsən oxut min aya, pərim.
Ölənədək ilqarımdan dönmərəm,
Gözlərəm, dözərəm min aya, pərim.

Bağban olub, bağdan aldım yüz barı,
Ürəyimdə kədər çosdu, üz barı.
Hər ikimiz indi duraq üzbarı,
And içmək nə lazım Minaya, pərim.

Nə gözəl fəsildir, Saleh, de, yazdı,
Elm çox dərində, Saleh dayazdı.
Bu yeni təcnisi Saleh də yazdı,
Apar ver saxlasın Minaya, pərim.

## ƏLİ İMAMQULİYEV
*(1927-1990)*

***Əli Əşrəf oğlu İmamquluyev 1927-ci ildə Göyçə mahalının Zərzəbil (Zərkənd) kəndində anadan olub, Aşıq Ələsgərin qardaşı Məşədi Salahın nəvəsidir.***

***Gənc yaşlarından aşıq sənətinə böyük maraq göstərən Əli uzun müddət Aşıq Talıb və Aşıq Nəcəfin yanında şəyirdlik eləyib, el arasında kamil bir aşıq kimi tanınıb.***

***Aşıq Əlinin ailəsi 1942-ci ildə Göyçədən köçüb, Goranboy rayonunun Qızılhacılı kəndinə gəlmiş, bir müddətdən sonra isə Naftalan şəhərinə gələrək orada məskunlaşmışdır.***

***Aşıq Əli 1990-cı ildə Naftalan şəhərində vəfat edib.***

### BU GÜNDƏ

Bir nəzər sal, şahlar şahı, yetiş dada bu gündə,
İrəhm eylə mən fağıra, çat imdada bu gündə.
Qürbət eldə fikir məni üzüb, əldən salıbdı,
Ömrüm hicranlar qoynunda gedib bada bu gündə.

Vətənimdən cida düşdüm, necə dözüm bu dərdə,
Tab gətirmir canda canım, yoxdu sözüm bu dərdə.
Kərəm kanı, bir səbir ver, dözüm özüm bu dərdə,
Sidqi-dilnən sığınmışam min bir ada bu gündə.

Yaxşıların bu dünyada gərək olmasın nəsi,
Alçaqların, namərdlərin, görüm kəsilsin səsi.
Zaman elə dəyişib ki, seçmək olmur heç kəsi,
Sirr vermək çox çətinləşib dosta, yada bu gündə.

Haqq işini başa düşməz hər yaranan, hər insan,
Geri qaytarmaq çətindi, nə yazılıb binadan.
Ah, nə deyim bu gərdişə, əzab çəkir dərd qanan,
Az-az dəyir gözə, qardaş, halalzada bu gündə.

Bu halımdan yox bir kəsin, bilirəm ki, xəbəri,
Düşünəndə az qalıram, olum dəli, sərsəri.
Aşıq Əli gecə-gündüz gözəl keçən günləri,
Sızıldayıb qəmli-qəmli salır yada bu gündə.

## AĞRIMA, CANIM, AĞRIMA

Böyük Allahın eşqinə,
Ağrıma, canım, ağrıma.
İrəhm eylə mana, hələ,
Ağrıma, canım, ağrıma.

Könül həzin çalan neydi,
Tutqunlaşıb başım, keydi.
İnsaf, mürvət yaxşı şeydi,
Ağrıma, canım, ağrıma.

Nə gizlədim, niyə danam,
Az qalıram oda yanam.
Nə atam var, nə də anam,
Ağrıma, canım, ağrıma.

Yazılmamış yazım qalıb,
Ürəyimdə sözüm qalıb,
Körpə oğlum, qızım qalıb,
Ağrıma, canım, ağrıma.

Mənə eyləyib zülümü,
Tez-tez göstərmə ölümü.
Gözləyənim var yolumu,
Ağrıma, canım, ağrıma.

Qış dolanıb, indi yazdı,
Aşıq Əli dərdin yazdı.
Arzu çoxdu, zaman azdı,
Ağrıma, canım, ağrıma.

## MƏNİM

Nə deyim, nə danışım mən,
Qurtarıbdı sözüm mənim.
Hər yetənə dost deməkdə
Günahkaram özüm mənim.

Qəmi-möhnət qəddim əydi,
Tutqunlaşıb başım keydi.
Namərdləri görməyəydi,
Kor olaydı gözüm mənim.

Ürəyimə qüssə dolub,
Ona görə rəngim solub.
Könlüm kimi dustaq olub,
Daha çalmır sazım mənim.

Yenə kəməndə ilişdim,
Hər kəsi tanıdım, seçdim.
Əliyəm, borana düşdüm,
Çox sərt gəldi yazım mənim.

## YERİNDƏDİ

Vəfasız deyiləm, nazlı mələyim,
Mən sənə verdiyim söz yerindədi.
Səndən ayrılalı üzüm gülməyib,
Özgəyə baxmayıb, göz yerindədi.

Hansı səmtə, hara düşsə güzarım,
Çıxmırsan yadımdan, a nazlı yarım!
Səninlə etdiyim əhdim, ilqarım
Bir ara qəlbimi, öz yerindədi.

Havadarın olsun qadiri-Sübhan!
A gözləri yolda, halı pərişan.
Səni öz canıtək çox sevir canan,
Aşıq Əli, səbr et, döz, yerindədi.

## BİRCƏ ÜZ MƏNƏM

Dönmərəm sözümdən, düz ilqarımdan,
Belə doğulmuşam, bircə üz mənəm.
Dostluğun ən gözəl nemətlərindən
Ölərəm, əlimi bircə üzmərəm.

Ehtiyatlı dolan, açma dər yada,
Bağça mənimkidi, iylə, dər ya da.
Bivəfa, biilqar üzən dəryada,
Alova yanaram, bircə üzmərəm.

Dost bilmişəm mən özümə Kamalı,
Ağlı olan bu dünyadan kam alı.
Azalıb Əlinin ağlı, kamalı,
Təcnisi yazmağa bircə üz mənəm.

## NARA CANIMI

A bimürvət, niyə haqsız, günahsız
Yandırdın ataşa, nara canımı?
Çarxı-fələk, səndə bu nə adətdi,
Həsrət qoydun bir cüt nara canımı.

Pünhan durub, çəkilirsən nə yana?
Qoyma canım nə alışa, nə yana.
Arzulayıb dilin mana nəyi ana?
Nə yoxla qəlbimi, nə ara canımı.

Aşıq Əli, üzünü tut canana,
Adətdir ki, canı gərək can ana.
Xəstəyəm, gözlərim gəzir canana,
Aram etmir çəksəm nara canımı.

## FİRUDDİN ƏLİYEV (SOLAXAY FİRUDDİN)
*(1927-1987)*

***Firuddin Qasım oğlu Əliyev 1927-ci ildə Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində anadan olub. Orta təhsilini Daşkənd kənd orta məktəbində alıb. Erkən yaşlarından saza, sözə maraq göstərən Firuddin saz çalmamışdan qabaq həmkəndlisi şair Həsən Xəyallıdan dastanları və klassik aşıqların şeirlərini öyrənib.***

***O, 1962-ci ildə Şəmkir rayonunun Keçili kəndinə köçüb.***

***Aşıq Teymur, Aşıq Məsim kimi ustadlardan dərs alan Aşıq Firuddin sazı sol əllə çaldığına görə, el arasında "Solaxay Firuddin" adıyla tanınıb.***

***Aşıq Firuddin 1987-ci ildə Şəmkir rayonunun Keçili kəndində dünyasını dəyişib və həmin kənddə dəfn olunub.***

### MƏNİ
*Murad Niyazlıya*

Ay Niyazlı, Aşıq Murad,
Heç salmırsan yada məni.
Alıb səbri-qərarımı,
Fələk verdi bada məni.

Mən piyada, dərdim atlı,
Qərib oldum qohum-yadlı.
Nə müddətdi ölüm adlı,
Qovur elə xata məni.

Xəbər gətir yurd-yuvamdan,
Dərman olsun sözün tamnan.
Perik düşdüm el, obamdan,
Baxtım saldı cida məni.

Firuddinəm, bax bu hala,
Tuti dilim dönüb lala.
Can verirəm Əzrayıla,
Bəyənməyir o da məni.

## DAĞLARIN

Nə vaxtdı qar yağıb, çovğun əsibdi,
Kəsilib get-gəliş yolu dağların.
Axmır əvvəlki tək qaynar bulaqlar,
Suyu da quruyub sulu dağların.

Çiçək də görmüşəm üstündə dəstə,
Dərə bilməyəndə düşmüşəm xəstə.
İldırım şığıyıb başının üstə,
Döyüb zirvəsini dolu dağların.

Ziyadsız, İdrissiz bəd gəlib yasım,
Hanı Hacı Rəhim, Məşədi Qasım?
Bir vaxt Qara Avıl, Gözlü Abbasım,
Durub keşiyində ulu dağların.

Bələdçi olubdu yolumda inam,
Gərək əbədilik yandıqca yanam.
Dedim, Firuddinəm, sənin oğlunam,
Dolandı boynuma qolu dağların.

## DÜNYANIN

Çalış, yaxşılıq et, bəşər övladı,
Beş gün qonağıyıq bica dünyanın.
Bilmirəm nədəndi, bu pul zəhrimar,
Dönübdü gözündə taca dünyanın.

İtirmə, başında saxla kamalı,
Birdən bu gərdişin dəyər zavalı.
Çoxu gödən sökdü, yığdı el malı,
Sirrini bilmədi qoca dünyanın.

Bu gün etdiyin toy, sabah olur yas,
Ölüm yuxu kimi, Əzrayıl həssas.
Aşıq Firuddinə yaxşı qulaq as,
Quluna çevrilmə xoca dünyanın.

## MƏNİM

Azəri balası, türk ünvanlıyam,
Bax budur, soyum, soyadım mənim.
Ellərə yayılıb, dillərə düşüb,
Gör neçə dastanım, bayatım mənim.

Var olsun qoy Cildə Müseyib lələm,
Səfərə çıxmışam, sözdəndi şələm.
Sinəmdə telli saz, əlimdə qələm,
Düşüb tarixlərə bil, adım mənim.

Nərmanlıda Bəhman, Zodda Ağayar,
Daşkənddə Həsən tək mahir sənətkar.
Talıb, Nəcəf, İman kimi ustadlar,
Sənətdə sınmayan qanadım mənim.

Gəzib dolanmışam Mil-Muğan, Gəncə,
Hamısı doğmadı bizlərə məncə.
Öz adım Firuddin, mahalım Göyçə,
Alı, Ələsgərdi ustadım mənim.



## İSMAYIL MAHİR
***(1928-1995)***

***İsmayıl Bahan oğlu Nağıyev 1928-ci ildə Göyçə mahalının İnəkdağı kəndində anadan olub. Uşaq yaşlarından ata-anasını itirən İsmayılı Gəncə şəhərində yaşayan böyük bacısı Zivər 1940-cı ildə öz yanına gətirib və ona hər cür qayğı göstərib.***

***Gəncə şəhərində tez-tez aşıq məclislərinin iştirakçısı olan İsmayılda bu sənətə maraq oyanıb, saz çalmağı, oxumağı öyrənməyə başlayıb, sonralar isə Aşıq Talıbın, Aşıq Nəcəfin yanında bir neçə il şəyirdlik edərək, bir aşıq kimi püxtələşib. O, eyni zamanda sazbəndliklə də məşğul olub.***

***Aşıq İsmayıl gənc yaşlarından şeir yazmağa da həvəs göstərib. Onun əldə edilmiş şeirləri içərisində qoşmalar daha geniş yer tutur. Onun "İsmayıl və Qəmzə" adlı bir dastanı da var. Şeirlərinin bir çoxunda "Mahir" təxəllüsünü işlətmişdir.***

***Aşıq İsmayıl 1995-ci ildə Gəncə şəhərində vəfat edib.***

### OLSUN

El-obada gəzən aşıq,
Qoy, kamalın dərin olsun.
Könüllərin sazını çal,
Ürəklərdə yerin olsun.

Sənətində sən ol mahir,
Sözü-söhbəti cəvahir.
Tarixləri oxu bir-bir,
Dastanlar əzbərin olsun.

Mən demirəm, yüz bilginən,
Bildiyini düz bilginən,
Ləl qiymətli söz bilginən,
Sinən də dəftərin olsun.

Sən ey, el sazını çalan,
Dilinə gəlməsin yalan,
Sənət dəryasına dalan,
Qiymətli gövhərin olsun.

Qəvvas deyil üzdə üzən,
Doğru sözdən olma küsən.
İsmayıldan nə inci sən,
Nə də aran sərin olsun.

## DAĞLAR

Tilsimli gədikləri,
Könül istər aşa, dağlar!
Təbiət vurub boyasın,
Hər qaya, hər daşa, dağlar!

Eşq əsəri var başımda,
Ürək yanır ataşımda.
Yoxdur burcə qardaşım da,
Mənlə gəzə qoşa, dağlar!

Gəl, pozmayaq düz ilqarı,
Var Mahirin intizarı,
Dərdimi tən bölən yarı,
Mənimlə çək qoşa, dağlar!

## OLMAZ

Aşıq Mahir aldı, görək nə dedi:
Gözü qamaşdıran hər şey zər olmaz.
Qoşun sərkərdəsi ər ola bilsə,
Onda qorxu bilən bir əsgər olmaz.

Axtarsan dünyanı tamam sərasər,
Nadana heç zaman söz etməz əsər.
Çoxları dəmiri əridər, kəsər,
Nə fayda, dəmirçi, ya misgər olmaz.

Dastanım sizlərə qalsın əmanət,
Sazıma, sözümə verin zəmanət.
Hər dahi Nizami, hər şair Səməd,
Hər saz götürəndən Ələsgər olmaz.

## SAZDA YAŞAYIR

Hələ köhlənməyib bu sədəfli saz,
Babamın hikməti sazda yaşayır.
Ölməz iyidlərin, qəhrəmanların
Hünər hekayəti sazda yaşayır.

Hünərdən söz açıb hər bir pərdəsi,
Ellərə car edib azadlıq səsi.
O Qoç Koroğlunun ölməz nərəsi,
Babəkin qüvvəti sazda yaşayır.

Abbasın, Alının, Aşıq Qurbanın,
Dahi Ələsgərin, Novrəs İmanın,
Şəmşirin, Talıbın, Hüseyn Cavanın
Ölməz söz sənəti sazda yaşayır.

Açıb kitabını keçmiş aləmin,
Dərmanı olubdur hər dərdin, qəmin.
Leylinin, Məcnunun, Əsli, Kərəmin
O saf məhəbbəti sazda yaşayır.

Dadıb acısını ötən zamanın,
Verib qiymətini yaxşı-yamanın.
Hər gəlinin, qızın, əziz ananın
Həyası, isməti sazda yaşayır.

Tamahı olmayıb elin varında,
Bilib öz qədrini, dostun, yarın da;
Böyük dahilərin, ataların da
Sözü, nəsihəti sazda yaşayır.

Sənət gülşənindən min çiçək dərir,
Nəğmə bəstələyir, ruha dad verir.
Döyüşdə igidə qol-qanad verir,
Xalqın əzəməti sazda yaşayır.

Əsəndə üstündə hicran yelləri,
Arxada qoymuşdur ağır illəri.
Mahir, daim dindir polad telləri,
Sənətin qüdrəti sazda yaşayır.

## GETDİ
### *(Daşkəndli Aşıq Nəcəfə)*

O şeir sərrafı, söz sənətkarı,
Ağlatdı elləri, hər yanı, getdi.
Sazımın, sözümün ustadı Nəcəf,
Könlümün istəyi, həyanı getdi.

Yayıldı ellərə bu acı xəbər,
Aldı ürəyimi acı qəm-kədər,

Sanki bu gün öldü Aşıq Ələsgər,
Dillərin söhbəti, dastanı getdi.

Həsrəti sinəmi dağlamazmı bəs?
Yaralı sinəmi oxlamazmı bəs?
Göyçə yasa batıb ağlamazmı bəs?
Ağır məclislərin ürfanı getdi.

İsmayıl Mahirin hanı ustadı?!
Qövr etdi yarası, sındı qanadı,
Dilinin əzbəri, ağzının dadı,
Dərdinin çarəsi, dərmanı getdi.

## ATA ÇATMADIM

Deyirlər, ulaq min ata çatınca,
Ha sürdüm ulağı ata çatınca.
Ulaq yük üçündür, at minmək üçün,
Ulağın yükünü ata çatmadım.

Yön çevir düz Haqqa, sən elə yalvar,
Aşa bilmədiyin sən elə yal var,
Sən elə arxalan, sən elə yalvar,
Deməzsən, arzuma, ata, çatmadım.

Dərs alın, öyrənin, halaldan qanın,
Sən nə qandın, mən də ha laldan qanım?
Mahirəm, var bir mərd halaldan qanım,
Namərdin adına ata çatmadım.



## İMRAN HƏSƏNOV
*(1928-1999)*

***İmran Mehralı oğlu Həsənov 1928-ci ildə Göyçə mahalının Ağbulaq kəndində anadan olub. Gənc yaşlarından saza maraq göstərən İmran həmkəndlisi Aşıq Məhərrəm Hacıyevə bir neçə il şəyirdlik edib, bu sənətin sirlərinə yiyələnib.***

***Aşıq İmran 1940-cı illərdən Tovuzda yaşayıb.***

***Aşıqlıq sənətində böyük uğur qazanan İmran 1957-ci ildə keçirilmiş VI Ümumdünya festivalının laureatı olub, "Əməkdar mədəniyyət işçisi" fəxri adına layiq görülüb.***

***Azərbaycan aşıqlarının III və IV qurultaylarının nümayəndəsi olan Aşıq İmran bir sıra ölkələrdə beynəlxalq festivallarda iştirak edərək vətənə mükafatla qayıdıb.***

***Aşıq İmran Həsənov 1999-cu il dekabrın 15-də vəfat edib.***

### QARAGÖZ

Yanağın gül, saçın sünbül, qaşın təzə, ay Qaragöz!
Aşiqin çox, mürvətin yox, qoy, salım haray, Qaragöz!
Qəddin çinar, qoynunda nar, düşməz mənə pay, Qaragöz!
Ceyran nədir, tərlan nədir, yoxdur sənə tay, Qaragöz!

Özün şirin, sözün şirin, məlahətsən başdan-başa,
Nə incəsən, könlümcəsən, qismət olsun, yüz il yaşa!
Gözəl çiçək, gəl and içək, könül verib, gəzək qoşa,
Keçmə belə gülə-gülə, səninləyəm, ay Qaragöz!

Aşıq İmran sənə qurban, bir gəl bulağın başına,
Qeydinə qal, bir kölgə sal qəmli qonağın başına.
Gözəl xanım, qoy dolanım sən tək çırağın başına,
Bəxtim gülər, bir gün gələr, eyləyərəm toy, Qaragöz!

## BİRİ QANAR, BİRİ QANMAZ

Yaranmışın qaydasıdı,
Biri qanar, biri qanmaz.
Gizli-gizli eşq oduna,
Biri yanar, biri yanmaz.

Gözlə adı, düşsən dara,
Mərd of deməz, çəksən dara,
Könül vermə biilqara,
Arif qanar, nadan qanmaz.

Dost olmaya belə saxta,
Ad gəzməyə varda-yoxda,
Ölüm olsa bərk ayaqda,
Namərd qaçar, mərd oysanmaz.

İmran qurub büsatını,
Tanıyın əsli-zatını.
Yeri gəlsə, öz adını,
Gəda danar, kişi danmaz.

## HARALISAN?

Ləbi şirin, xoş xəyallı,
Ay gülyanaq, haralısan?
Qaşı kaman, yandım aman,
Huri sayaq, haralısan?

Ay camalın şölə salır,
Hər baxışın canlar alır.
Zülfün şahmar kimi çalır,
Qaymaq dodaq, haralısan?

Ayaq saxla, qəddi mina,
Od salıbsan şirin cana.
Qəsd eyləmə sən İmrana,
Nurlu çıraq, haralısan?

## OLANDA

Ürək cavan, arzu şirin,
Nə olar ki, çal olanda?
Duyan bilər ləzzətini,
Dodaq qaymaq, bal olanda.

Fikir vermə çox daş-qaşa,
Meylini sal qələm qaşa,
Ömürdən də çəkmə haşa,
Əlif qəddin dal olanda.

Qınama gəl, sən İmranı,
Nə qocası, nə cavanı.
Cavan saxlayar insanı,
Yarı əhli-hal olanda.

## QOCALMAZ

Dünyada olmasa hicranlar, qəmlər,
İnsanın ürəyi, gözü qocalmaz.
Saçın ağarması zirvə qarıdır,
Arzu-diləklərin düzü qocalmaz.

Həmdəmi olasan daim qananın,
Oduna yanasan oda yananın.
Bilsəydi qədrini insan insanın,
Keçsə də ömrünün yüzü, qocalmaz.

Az yaşa, çox yaşa, mənalı yaşa,
Bacarıb arzunu vurasan başa.
Əgər bu sözlərim gələrsə xoşa,
İmranın söhbəti, sözü qocalmaz.

## GÖZLƏR

Qanrılıb baxanda o telli sona,
Yandırır bağrımı badamı gözlər.
Mən nə biləydim ki, havalandırıb,
Çöllərə salarmış adamı gözlər.

İşvəsi, qəmzəsi nələr andırar,
Qayanı dindirər, daşı qandırar.
Məni həm ağladar, həm də yandırar,
Birə-min artırar qadamı gözlər.

İmran saz götürüb, məclis quraydı,
Könül tellərinə mizrab vuraydı,
Bir cüt ulduz kimi nurlandıraydı,
Zülmət otağımı, odamı gözlər.

## YARANIB

Gözlərin ülkərdən, saçın zülmətdən,
Baxışın, gülüşün nazdan yaranıb.
Avazın çeşmədən, sözün şəkərdən,
Qəlbinin telləri sazdan yaranıb.

Boyun təbiətin yaraşığıdır,
Xəyalın qəddinin sarmaşığıdır,
O şux təbəssümün Ay işığıdır,
Yanağın, dodağın közdən yaranıb.

Eşqin dəryasında bir gövhərmisən?
Məhəbbət mülkündə bəxtəvərmisən?
Ürəklər oxşayan söz istərmisən?
İmranın ürəyi sözdən yaranıb.

## GÖZƏL

Bəzənib-düzənib çıx seyrangaha,
Sənsən yaraşığı yaylağın, gözəl.
Açılıb yolları, bitib gülləri,
Gözləri yoldadır bulağın, gözəl.

İndi novbaharın gəlhagəlidir,
Tülək tərlan kimi, könlüm dəlidir,
O yerə baş qoyub can verməlidir,
Hansı daşa dəysə ayağın, gözəl.

Cilvələnib dağdan-dağa aşarsan,
İmran kimi, hər gülə söz qoşarsan,
Telli sazın tilsiminə düşərsən,
Yayılar ellərə sorağın, gözəl.

## SORUŞ

Mənim əhvalımı bilmək istəsən,
Qumru bulaqların gözündən soruş.
Xınalı kəkliyin nəğmələrindən,
Ceyranın, cüyürün izindən soruş.

Köhlən sür dalımca arana, dağa,
Üstünə gah yağış, gah şəfəq yağa.
Baş vuraq çadırlı yaşıl yaylağa,
Çoban ocağının közündən soruş.

Bu gözəl yurdumu gəz yavaş-yavaş,
Mənim sirdaşımdır hər qaya, hər daş.
Yerimi gec tapsan, eyləmə təlaş,
Yolun yoxuşundan, düzündən soruş.

Odlar ölkəsində azad bir quşam,
İstərəm yurduma min dastan qoşam.
Qartal yuvasında qonaq qalmışam,
İstəsən dağların özündən soruş.

Əgər unutmasan əhdi-peymanı,
Düşüb sorağıma, dolan hər yanı.
Ellər məclisində gəl gör İmranı,
Aşığın halını sazından soruş.

**SƏNİN**

Sənət dahisisən, Aşıq Ələsgər,
Kamala yetişdim izindən sənin.
Oxuyan doymayır, duyan doymayır,
Çox ilham alan var sözündən sənin.

Üz tutdun dünyada haqq-ədalətə,
Can verdin əbədi şeir, sənətə.
Heyranam səndəki sirrə, hikmətə,
Heç şey yayınmayıb gözündən sənin.

Dad çəkdin zamandan: aman, əlaman,
Verib qiymətini indiki zaman.
Adınla fəxr edir bu Azərbaycan,
İmran od götürüb közündən sənin.

## EYLƏ SƏN

Xalqın üçün xeyirxahlıq yolu seç,
Düz insana yaxşılığı elə, sən.
        Aşıq deyər, eyləsən,
        Oxu dərsin elə, sən.
        Yamanlığa yaxşılıq,
        Yaxşı olar eyləsən.
İnsanlara ləkə vurma dünyada,
Xəcalətdən çıxammazsan, eləsən.

Mərd insanlar sadə olar, yəqindi,
Beləsinə can verərəm, yəqindi.
        Aşıq deyər, yəqindi,
        Ədalət var, yəqindi.
        Qapı döyən, qapın da
        Döyüləcək, yəqindi.
İstəmirəm nanəcibi görməyə,
Əl çəkməyir, ha uzaq get elə, sən.

İmran, yolun gözləyərmi bədəsil?
Bekar yola qulluq eylər bədəsil.
        Aşıq deyər, bədəsil,
        Nanəcibdir bəd əsil.
        Heç çıxmaya qarşına,
        Zatıqırıq, bədəsil.
El qədrini nə bilirsən, bədəsil?
Bir yük oldun obaya sən, elə sən.



## MƏHƏMMƏD QASIMOĞLU
*(1928-2023)*

***Məhəmməd Qasım oğlu Məmmədov 1928-ci ildə Göyçə mahalının Ağbulaq kəndində anadan olub. Aşıqlıq sənətini Aşıq İmran Həsənovdan öyrənib. Aşıq Mahmud Məmmədovun böyük qardaşıdır.***

***2023-cü ildə Tovuzun Bozalqanlı kəndində vəfat edib.***

### BAX

Qara qaşın kölgəsində,
Göz altından baxana bax.
Kirpikləri ox kimidi,
Şimşək kimi çaxana bax.

Gözəllər insafsız olur,
Hər baxanda bir qan olur.
Səməndər tək alovlanır,
Canı oda yaxana bax.

Qoyma yana şirin canı,
Etməginən nahaq qanı.
Məhəmməd tək binəvanı,
O çöllərə atana bax.

### ÖLƏCƏMMİ MƏN

Könlüm yaman istər gəzdiyim yeri,
Bir də o yerləri görəcəmmi mən?
Bağrım zədə oldu, yara bağladı,
Yoxsa ki, bu dərddən öləcəmmi mən?

Ötəm Ağbulaqdan üzü o yana,
Çaxmaqlıda qonaq qalam anama.
Görən, Allah, düzələrmi zamana,
Bu dərdi ürəkdən siləcəmmi mən?

Qara Quzey sarı dənizə baxam,
Əlvan çiçəklərdən çələng toxuyam.
Saz alam əlimə, "Dilqəm" oxuyam,
Bir də toy-mağarda güləcəmmi mən?

Şorcada qohumlar ola yanımda,
Əliyə saz çalam alma bağında.
Zəki İslam şeir deyə sağımda,
Bir də o dövranı görəcəmmi mən?

Qasımoğlu, üz tut Haqq dərgahına,
Səcdə qıl şahların səcdəgahına.
Gündə min yol diz çökərəm adına,
Yanıb ocaqlarda, sönəcəmmi mən?

## GƏRƏK

Övladı saxlamaq ata borcudur,
Övlad da borcunu qaytarsın gərək.
Bir zaman özü də olacaq ata,
Borcunu qaytarsın, borc versin, gərək.

Oğul pis baxmaya ata üzünə,
Ürəyi bir vura, bir də döyünə.
Ata baxa, fəxr eyləyə, sevinə,
Beləcə, borcunu verəsən gərək.

Müqəddəs bil ömür boyu atanı,
Allah bağışlamaz ata atanı.
Bir gün atacaqlar ata atanı,
Qasımoğlu, bunu biləsən gərək.

## BİR ÜZƏM, ÜZƏM

Dərin dəryalarda qəvvas olmağa,
İstərəm qol açam, bir üzəm, üzəm.
Bağ salmışam, qismət ola bar mənə,
Həsrət əllərimlə bir üzəm, üzəm.

İlqarlı dost keşik çəkər dəhnəyə,
Köhlən ata nə lazımdı dəh, nəyə?
Xanımlar əlindən qoca təhnəyə,
Axşamdan sərilmiş bir üzəm, üzəm.

Qasımoğlu, qüvvət saxla qolunda,
Dar günündə gərəyi var qolun da.
Namuslu qız qoçaq oğul qolunda,
Deyər ki, bu gülü bir üzəm, üzəm.



## NOVRUZ SÜLEYMANOĞLU
*(1929-2000)*

***Novruz Süleyman oğlu Şairov 1929-cu il aprelin 24-də Göyçə mahalının Daşkənd kəndində anadan olub, Daşkəndli məşhur şair Məmmədhüseynin nəticəsidir. Hələ uşaqlıqdan saza-sözə çox böyük marağı olan Novruz sənətin sirlərini böyük qardaşı Aşıq Abbasəlidən öyrənib. Həm ifaçı, həm də yaradıcı aşıq kimi tanınan Aşıq Novruz eyni zamanda mahir sazbənd olub.***

***1956-cı ildən ömrünün axırına qədər Bərdə rayonunda Mədəniyyət Evində çalışıb, dəfələrlə radio və teliviziya verilişlərində çıxış edib.***

***Aşıq Novruz 1986-cı ildən 1992-ci ilə qədər Bərdə şəhər 1 saylı Musiqi məktəbində dərs deyib.***

***Aşıq Novruz 2000-ci il noyabrın 3-də Bərdə rayonunun Yeni Daşkənd kəndində vəfat edib.***

### TUTAR

Qəza qədərsizdi, yoxdu miqdarı,
İnsanı tutanda dalbadal tutar.
Taleyi bəd gəlib, bəxti yatanda,
Səbəbli-səbəbsiz qeyli-qal tutar.

Hökümdar hökm edir, qərardır qəti,
Elə bil ki, yoxdur insaf-mürvəti.
O qədər veribdi qəmi-möhnəti,
Nə bir oda tutar, nə də zal tutar.

Novruza tuş edir qəm-kədərlini,
Taleyi bəd gələn gözü nəmlini.
Bilmək olmur Haqq-talanın sirrini,
Gözlünü kor edib, dilin lal tutar.

## DÜŞƏR

Haqqa, ədalətə boyun əyməyən,
Haqsız, ədalətsiz divana düşər.
Qəlbidən kəc olar, əməldə iblis,
Nadanlıq eyləyib, böhtana düşər.

Qəlbidaş insanlar kərəmsiz olar,
Əhdinə, andına vəfasız olar.
Qəzadı, qədərlə üzbə-üz olar,
Nə qəlbi oxşayar, nə cana düşər.

Biçarə Novruzun vardı əsası,
İgidin kərəmi, mərdin səxası.
Olmasa həyatın kəc zamanası,
Nə dərdə, nə qəmə, nə qana düşər.

## BƏLLİDİ

Salam vermə hərcayıya, gen dolan,
Ürəyi çirkabdı, kəc xəyallıdı.
Şeytan fitnəlidi, dilində yalan,
Əzəldən cəm olmuş bu kamallıdı.

Axtarır həmişə özünə bir tay,
Ara qarışdıra, sala hay-haray.
İblis əməlindən kim olubdu bay,
Axır aqibəti qeyli-qallıdı.

Novruz Haqq yolunda keçib sərindən,
Dosta sədaqəti vardı dərindən.
Ocaq ha korlansa, bilin yerindən,
Ocaq yeri öz külündən bəllidi.

## GƏLMİŞƏM

Qəza kəməndindən düşmüşəm tora,
Yönüm düşüb biyabana, gəlmişəm.
Axtarıb dərdimə tapmıram çarə,
Dərdim dönüb bir ümmana, gəlmişəm.

Tale üz döndərib, yatıb iqbalım,
Beş-on heyvanım var, beş-on da malım.
Qoymadı ki, qala bimürvət zalım,
Qapım dönüb dəyirmana, gəlmişəm.

Nütfəmdə haram yox, halaldı mayam,
Nə huşdan kəmsiyəm, nə əqli zayam.
Söz-sənət eşqilə bir coşqun çayam,
Mən Novruzam, çən, borana gəlmişəm.

## AY GÖZƏL

Coşqun təbim ola, alam qələmi,
Vəsfini dəftərə yazam, ay gözəl.
Açam ürəyimi, deyəm dərdimi,
Xəyal tək qəlbində gəzəm, ay gözəl.

Camalın göyçəkdi, boyun tamaşa,
Gözəllik həkk olub o qələm qaşa.
Eşqindən od tutub yandım ataşa,
Bir sönməz alovam, közəm, ay gözəl.

Novruz deyər, eşqə olma bivəfa,
Naz edib, könlümü salmaynan xofa.
Xəstə canım, bəlkə, tapa bir şəfa,
Ellərin qoynunda gəzəm, ay gözəl.

## OLMASA

Heç gör ayrılarmı ürək-ürəkdən,
Şeytanın fitnəsi, feli olmasa.
İnsan nəyə lazım, nəyə gərəkdi,
Qohum-qardaş, ağır eli olmasa.

Söyləyib dərdimi, de, yara qandır,
Açmasın sirrimi de, yara qandır.
Sağalmaz yaradı oy... yara qandır!
Məhəbbəti, təbib əli olmasa.

Öz adım Novruzdu, ünvanım Göyçə,
Vətən məhəbbətin unudum necə.
Həsrətin çəkərdim gündüz və gecə,
Ürəyimə bağlı teli olmasa.



## HAQVERDİ TALIBOĞLU
***(1930-2018)***

***Haqverdi Talıb oğlu Ələsgərov 1930-cu il martın 17-də Göyçə mahalının Ağkilsə kəndində anadan olub, Aşıq Ələsgərin nəvəsidir.***

***Haqverdi ibtidai təhsilini öz doğma kəndlərində, orta təhsilini qonşu Zod kəndində, ali təhsilini isə H.Zərdabi adına Gəncə Pedaqoji institutunda alıb.***

***Haqverdidə aşıqlığa həvəs erkən yaşlarından yaranıb və bu sənətin sirlərini atası Aşıq Talıbdan öyrənərək, bir aşıq kimi yetişib, bədii yaradıcılıqla da məşğul olub.***

***İnstitutu bitirəndən sonra Kəlbəcərin kəndlərində pedaqoji fəaliyyətlə məşğul olan Haqverdi sonra Ağkilsə kəndinə qayıdıb, 1988-ci ilə qədər müəllim və məktəb direktoru vəzifəsində çalışıb. Eyni zamanda aşıq kimi də fəaliyyətini davam etdirib.***

***Qərbi Azərbaycandan 1988-ci il deportasiyası zamanı Göyçəni tərk etmək məcburiyyətində qalıb.***

***Aşıq Haqverdi 2018-ci il iyulun 4-də Gəncə şəhərində vəfat edib, Göygöl qəbirstanlığında dəfn olunub.***

### MƏNDƏN

Vətənimdə bülbül idim,
Ayrı düşdü gülüm məndən.
O zamandan incik olub,
Ayım məndən, ilim məndən.

Kədər məni çalır-çapır,
Sevincimi göydə qapır,
Hara getsəm, gəlir tapır,
Aralaşmır zülüm məndən.

Məskən seçib, bay olmuşam,
Əlif qəddi yay olmuşam,
Gör kimlərə tay olmuşam,
Niyə qaçır ölüm məndən!?

## AĞRIN ALIM

Yenə məndən üz döndərib,
Gəzmə kənar, ağrın alım.
Bu söhbəti el eşidər,
Bizi qınar, ağrın alım.

Küsü-barış bir peşədir,
İlqarımız həmişədir,
Qəlbim büllur bir şüşədir,
Dəymə, sınar, ağrın alım.

İlqarımda mərdanəyəm,
Həsrətindən divanəyəm,
Mən oduna pərvanəyəm,
Sənsə fənar, ağrın alım.

## SƏNİ

Qurban olum, qəşəng ceyran,
İncitməsin sözüm səni.
Yaman qorxur ayrılıqdan,
Gözdən qoymur, gözüm səni.

Uzaqlaşma ayaq-ayaq,
Vədə verək, ilqar qoyaq,
Bu dağlarda Məcnunsayaq
Nə vaxtacan gəzim səni?!

Odlanar Haqverdi xəstə,
Heç kəs olmaz mən həvəsdə.
Tər çiçəksən bircə dəstə,
Əlim gəlmir üzüm səni.

## BAŞINA DÖNÜM

Xudam səni pak yaradıb,
Birsən, başına dolanım.
Ağlın, zəkan qüdrətindi,
Sirsən, başına dolanım.

Cana cansan san içində,
Yetişdin ümman içində,
Zühr etdin neysan içində,
Dürsən, başına dolanım.

Yolunda talanmaq şərəf,
Oduna qalanmaq şərəf,
Başına dolanmaq şərəf,
Pirsən, başına dolanım.

Külli-bəşər marağısan,
Xoş səadət sorağısan,
Xalqın ümid çırağısan,
Nursan, başına dolanım.

Haqverdiyə müqəddəssən,
İmdadlara yetən kəssən.
Həzrət Əliyə əvəzsən,
Şirsən, başına dolanım.

## MƏN

Bir  xaliq üstümdən nəzər əyməsə,
Yüz namərd yığılsa, əyilmərəm mən.
Vicdanım şüşədi, qəlbim poladdı,
Əysələr sınaram, əyilmərəm mən.

Məni soyuq sanıb incitmə, lələ,
Hələ körpəlikdən qayəmdi belə:

Nə elə acıyam, atalar çölə,
Nə çox şirin olub yeyilmərəm mən.

Qohum var, vurğunam etibarına,
Qohum var, qohumu satır qarına.
Dərdliyəm, göz yumdum dünya malına,
İsrafil sur çalsa, ayılmaram mən.

## MƏNİ

Gündə qılınc çəkir, alır üstümü,
Çox aciz tanıyıb fələk də məni.
Aramır sədaqət, ilqar, etibar,
Tapır fırıldaq da, kələk də məni.

Əyilib qamətim bir sual kimi,
Dinib-danışmıram dili lal kimi,
Gəzirəm mənasız boş xəyal kimi,
Eşitmir arzu da, dilək də məni.

Qəm-kədər əlindən ciyəri qanam,
Haqverdiyəm, nə kəmtale insanam.
Kaş, uşaq vaxtımda mehriban anam
Basıb öldürəydi bələkdə məni.

## A DADA HARAY
### *(cığalı təcnis)*

Anamız Göyçənin hər nemətindən,
Könlüm istəyir ki, a dada hər ay.
    Aşıq deyər, a dada,
    Körpə istər a “dada”.
    Yaxşı iş baş ucaldar,
    Şöhrət gələr ada da.
Çəkirəm vətəndə qürbət əzabı,
Həsrətdi dahanım a dada, haray!

Qürbət eldə ha qovrulum, ha yanım,
Xəstə düşsəm, kəsən olmaz ha yanım.
Aşıq deyər, ha yana,
Cismim oda ha yana.
Dərddi dəryayi-qəmdi,
Yön çevirrəm ha yana.
Yoxdu bir həmdəmim, dostum, həyanım,
Sərgərdan qalmışam adada, haray!

Ay Haqverdi, demə dərdin yara, dan,
Xəbərsizdi sənə deyən yaradan.
Yox aşıq, yaradandı,
Axan qan yaradandı.
Köməksizin dayağı,
Dünyanı yaradandı.
Köməksizəm, nəzər əymə, Yaradan,
Dar günümdü, yetiş a dada, haray!

## OYANA, BƏLKƏ

Səmimi qardaşa yetir salamı,
Kağız, yolun düşdü o yana, bəlkə.
Könül sarayımın tacidarıdı,
Pərişan halıma o yana, bəlkə.

Dost yolunda astanadı  dərdə sər,
Fikrim çoxdu, tab eyləmir dərdə sər,
Huşum çaşır, eyləyəndə dərd əsər,
Yüz dəfə deyirəm "oy, ana", bəlkə.

Bilmirəm, Haqverdi qara baxtdımı,
Yoxsa, fələk ona qara baxdımı?
O da haraylasın qara baxtımı,
Qəflət yuxusundan oyana, bəlkə.

## MUSA SÜLEYMANOV (MÜŞKÜL MUSA)
## *(1931-1991)*

***Aşıq Musa Ağayar oğlu Süleymanov 1931-ci ildə Göyçə mahalının Sarıyaqub kəndində anadan olub. Ağkilsə kəndində yaşamış məşhur ustadlardan Səfəroğlu Aşıq Musanın (1830-1912) qız nəvəsidir.***

***Müşkül Musa ləqəbi ilə tanınan Aşıq Musa aşıqlıqla yanaşı, zurnada ifa etməyi də bacarıb, şeirlər yazıb, yaradıcı təbi ilə sayılıb-seçilib. "Aşıq Qərib", "Əsli və Kərəm", "Valeh və Zərnigar", "Növruz və Qəndab" və s. dastanlar onun repertuarında daha çox üstünlük təşkil edib.***

***Müxtəlif mövzularda düzüb-qoşduğu gəraylı, qoşma, təcnisləri aşıqların repertuarında geniş yer tutub.***

***Müşkül Musa 1991-ci ildə vəfat edib.***

### SÖZÜM QALDI

Başsız qalmış o dağlarda
Var doymamış gözüm, qaldı.
Səyyad oldum boran-qarda,
Silsilədə tozum qaldı.

Ayrılmadım, əl çəkmədim,
Şeir-sözlə bəzəklədim.
Tifil oldum, iməklədim,
Torpağında izim qaldı.

Bax iqbala, bir bax bəxtə,
Musa, söylə elin haqda,
Hər məclisdə, hər ocaqda
Şirin söhbət-sözüm qaldı.

### DUR GEDƏK

Qızım, gedib, qohum-qonşu qalmayıb,
Bir doyunca otur ağla, dur gedək.
Ocağın başından, təndir külündən,
Qaynar yaralarım, yağla, dur gedək.

Sən gəl vidalaşaq Keyti dağınnan,
Son dəfə ver içim el bulağınnan.
Atamın, anamın al torpağınnan,
Tökərsən gözümə, saxla, dur gedək.

Silkindi Musanın ömrünün varı,
Ağlama, sızlama, oldun sapsarı.
Ağrın alım, götür qıfıl-açarı,
Bağla qapıları, bağla, dur gedək.

## VARMI

Daha qocalmışam, əl işdən qalıb,
Gör, açıb yaramı, sarıyan varmı?!
Fəhimi gödəlib, ağlı azalıb,
İçin-için məntək çürüyən varmı?

Gəlirim, qazancım dönsə də selə,
Vermişəm, aparıb, tufana-yelə.
Kimə gərək ollam mən innən belə,
Bir gör, heç axtarıb-arayan varmı?

Hər vaxtın qurğusu, hər işin çəmi,
Yandırıb odlara yaxır sinəmi.
Musa, sənlə bahəm bu dərdi-qəmi,
Tutub bir küncündən sürüyən varmı?

## ADDIYARMIŞ

Məni naçar qoyub, ay qoca baxtım,
Qalmadı cismimdə, can addıyarmış.
Zəmanəm, taleyim bir də ki vaxtım
Eyləyib qəlbimi qan, addıyarmış...

Tale bəd gələrmiş, iqbal dönərmiş,
Enən ucalarmış, qalxan enərmiş.
Sönən odlanarmış, yanan sönərmiş,
Ömür pay-puş olub, gün addıyarmış.

Yüz nəzir-niyaz de, yüz də sadağa,
Alnına yazılan çıxar qabağa.
Dostlar çəkilərmiş darda qırağa,
Qohum da, qardaş da gen addıyarmış.

O cənnət, cəhənnəm hardadı, harda?!
Elə cəhənnəmdi o dar məzar da.
Vəfasız çıxarmış vəfalı yar da,
Oğul-qız da gələr, yan addıyarmış.

Xilqətdən sən yaranıbsan tək, Musa,
Aslan Musa, pələng Musa, lək Musa,
Dərd sənindi, çəkəcəksən, çək, Musa,
Heç kim qatmaz cana-can addıyarmış.

## BİLMİRƏM

Qoca dünya, sən nə yaman şirinsən,
Mən səndən əlimi üzə bilmirəm.
Gövhər düzüb əbrü-atlas bürünsən,
Arzu-istəyimi yaza bilmirəm.

Deyirlər, hər dərdi salma ürəyə,
Dözümsüz bir ürək gərəkdir nəyə.
Saxlayaq cəsədi nəfəs verməyə,
Axı, mən dayanıb dözə bilmirəm.

O tərlan qəlbimi saldın təpərdən,
Göz dolur, boşalır, bax hərdən-hərdən.
Yaman diksinirəm səsdən, xəbərdən,
Silirəm, qəlbimdən poza bilmirəm.

Köçəri quşlar var, gəlib-keçəndə,
Könlüm yüz yol dəyib-qayıdır kəndə.
Bir çadır görürəm, odur, yelkəndə,
Tanıya bilmirəm, sezə bilmirəm.

Musa, Musa deyil o vətəndəki,
Daş deyil, ürəkdi bu bədəndəki.
Yar vuran yaradı bu sinəmdəki,
Qövr edir yaralar, dözə bilmirəm.

## QALDI

Yurd-yuva itirmək asan iş deyil,
Ürəyimdə dərdi-malalı qaldı.
Yetmiş il qazandı, qurdu, yaratdı,
Görünməz nə cahı-cəlalı qaldı.

El məzardan oldu, məzarlar eldən,
Nə dərdin sahibi gör, olmuşam mən?!
Anadan dünyaya gəldiyim Vətən,
Biz ondan, o bizdən aralı qaldı.

Dili yox, dillənə hər məzar daşı,
Ürəyimə axdı gözümün yaşı.
Dost-dostu itirdi, qardaş-qardaşı,
Neçə-neçə yaslı-yaralı qaldı.

Əklillər çəkilib daşların üstə,
Yolma saçlarını, gəl, dəstə-dəstə.
Gözləri yollarda, qulağı səsdə
Neçə-neçə dağlar maralı qaldı.

Ziyarət etsəm də ata-anama,
Baba dərdi çox çətindi adama.
Bir mən deyiləm ki, alışan şama?
Bu dağı görməmiş haralı qaldı.

Heyranıyam, yol-ərkanı qananın,
Azər oğlu, azəriyəm, inanın.
Dərdi çoxdu yazıq Müşgül Musanın,
Yaranandan başı balalı qaldı.

## QƏRİBLİKDƏ QALDI

Köç-köç oldu, aləm köçdü, el getdi,
Qırıldı könlümün havası qaldı,
İsti komasını hamı tərk etdi,
Qəriblikdə yurdu, yuvası qaldı.

Babası sayırdı özünə hamı,
Dədə Ələsgəri, Miskin Abdalı.
Həm Seyid Mahmudu, Seyid Bayramı,
Cəddi, cəsarəti, duası qaldı.

Əmək zaya getdi, qazanc oldu puç,
Daşnaqlar boynuna gör, alırmı suç.
Musa, Göyçə deyə yüz də boyun quc,
Böyük Oğuz yurdu, obası qaldı?!

## GÖYÇƏ

Gün çıxanda kəkliklərin oxuyar,
Daşdan-daşa qonar balalı, Göyçə.
Göy örpəyin müşkü-ənbər qoxuyar,
Nərgizli, reyhanlı, laləli Göyçə.

Bülbül həvəslənər gül kölgəsinə,
Aşıq butalanar el kölgəsinə,
Zənbur cəhd eyləyər gül kölgəsinə,
Qonub hər çiçəkdən bal alı, Göyçə!

Qov getsin qoynundan dağlar oğlunu,
Ana qoyardımı ağlar oğlunu?!
Musayam, yandırır dağlar oğlunu,
Ay başı qovğalı, bəlalı Göyçə!

## GÖYÇƏNİN

Olsa qış fəslində boranı, qarı,
Xoş gələr baharı, yazı Göyçənin,
Dərdlərə dərmandı hər çəmanzarı,
Mötəbər çörəyi, duzu Göyçənin.

Keçib bu dağlardan Koroğlu, bəli,
Başında yeddi min yeddi yüz dəli.
Aslan ürəklidi, pələng pəncəli
Gəlini, oğulu, qızı Göyçənin.

Miskin Abdal yurdu, Miskin ocağı…
Kəsilməz üstündən, gələr qonağı.
Tərlan oylağıdı aranı, dağı…
Azalmaz söhbəti, sazı Göyçənin.

Aşıq qardaş, sazı bir götür ələ,
Aşıq Ələddin tək, çək görüm zilə.
Müqəddəs Göyçədi, düz söhbət eylə,
Sönməz bir ocaqdı közü Göyçənin.

Üst yanı qatarı Keyti dağıdı,
Alt yanı Şahdağı, el yaylağıdı,
Musa deyər, dostlar, cənnət bağıdı,
Dərəsi, təpəsi, düzü Göyçənin.



## HACI BAYRAMOV
*(1931-2011)*

***Hacı Abbas oğlu Bayramov 1931-ci ildə Göyçə mahalının Daşkənd kəndində anadan olub. Hələ uşaq yaşlarından aşıqlığa həvəs göstərən Hacı 1945-ci ildə Daşkəndli Abbasəli Nəzərova şəyird olub, bir ildən sonra Bala Məzrəli Aşıq Hüseynin, 1947-1950-ci illərdə isə Aşıq Mehdinin yanında şəyirdlik edib.***

***Aşıq Hacı özü də ustad sənətkar kimi, bir neçə şəyirdə aşıqlıq sənətinin sirlərini öyrədib. Aşıqların IV və V Qurultaylarında iştirak edib.***

***1992-ci ildə Türkiyənin Konya şəhərində Ümumtürk aşıqlar müsabiqəsində qızıl medala layiq görülüb.***

***Qərbi Azərbaycandan soydaşlarımızın sonuncu deportasiyası zamanı - 1988-ci ildə Aşıq Hacı Şəmkir rayonunun Çənlibel kəndində məskunlaşıb.***

***Bədii yaradıcılıqla da məşğul olan ustad aşığın "Mənim sazlı, sözlü dünyam" (Bakı, 2008) adlı şeirlər kitabı çap olunub.***

***Aşıq Hacı Göyçəli (Bayramov) 2011-ci il may ayının 22-də Şəmkir rayonunun Çənlibel kəndində vəfat edib.***

### SƏN

Dəli könlüm, yaxşı düşün, vəzifəni seçmə sən,
Dolanırsan sadə dolan, dost yanından keçmə sən.
Öz-özünə mənəm demə, bu, vəfasız dünyadı,
Həm endirər, həm qaldırar, öz həddini aşma sən.

Süleyman da bu dünyadan nakam getdi, doymadı,
Puç eylədi igidləri, bir pəhləvan qoymadı.
Salsal qabil pəhləvandı, Əli yıxdı, soymadı,
Şamama da ondan qorxdu, Əli dedi, – qaçma sən.

Hacı deyər, ləzzətsizsən, axır ollam puç kimi,
Ruhum çıxar bədənimdən, qanad alar, quş kimi.
Dünya malı çox şirindi, sonu xarab daş kimi,
Sirat durur qabağında, hünərin var, keçmə sən.

## GÖYÇƏ

El səni unudar çətin,
Həmişəlik  qalan Göyçəm.
Çox sevirdin mehmanı sən,
Niyə oldun talan, Göyçəm?

Gələn şair şeir yazdı,
O tariflər sənə azdı.
Sənətin şeirdi, sazdı,
Çox ustadı olan Göyçəm.

Hacı deyər, Vətənimsən,
Uryan qalsam, kəfənimsən.
Nemət verdin, nəfəsimsən,
Niyə oldun yalan, Göyçəm.

## OLMASA

Aşıq necə coşa gəlsin,
Sinəsində saz olmasa.
Oxuyarmı şeyda bülbül,
Bahar gəlib, yaz olmasa.

Gəlsə baxtimin əzəli,
Mətləbim Haqdan düzəli.
Sevmək olmaz hər gözəli,
Onda işvə, naz olmasa.

Hacıyam, deyim dərdimi,
Kim çəkər mən çəkdiyimi.
Əzizlənməz sona kimi,
Göldə süzən qaz olmasa.

## GÖYÇƏNİN

Nə qədər saz duyan, söz əhli varsa,
Hamsı əziz qonağıdı Göyçənin.
Ögeyi bilinməz, yadı bilinməz,
Qoynu ana qucağıdı Göyçənin.

Burdadı İmanın şirin xəyalı,
Nazlı sənəmlərin göyçək camalı.
Məmmədsöyün, pir Ələsgər, şıx Alı,
Haqdan yanan çırağıdı Göyçənin.

Dindir Ağayarı, ol ayıl-mayıl,
Anlamaz Bəhmanı ağıldan zayıl.
Misgin Abdal, Seyid Bayram – səcdə qıl,
Ən müqəddəs ocağıdı Göyçənin.

Gəl, Tərsə dağını seyr elə, qayıt,
Obalar mürgülü, yavaşca ayılt.
İsmixan, Şiruyə, Zəki, Alqayıt
Şeir-sənət sorağıdı Göyçənin.

Qartalları zirvələrdən qıy alar,
Çəmənində min bir naxış, boya var.
El-obaya keşik çəkən qayalar,
Yazılmamış varağıdı Göyçənin.

Ay Hacı, gələndə aşıqlar dəsi,
Qorxuya salardı Həsənin səsi.
Nəcəfin, Əsədin çağlar nəfəsi,
Bir nəğməkar bulağıdı Göyçənin.

## İNDİ

Qocalığın ovsarından tutmuşam,
Alıban yedəyə çəkirəm indi.
Yorğun öküzlərnən, qırıq bir cütnən,
Ömrün bağçasını əkirəm indi.

Səhralarım tor görünür gözümə,
Durammıram, əl vururam dizimə.
Oğul-uşaq daha baxmır sözümə,
Ağlayıb gözyaşı tökürəm indi.

Hacıyam, qocalıqdan giley eylədim,
Sərgi güddüm, sərçələri teylədim.
Nə qədər qazandım, axır neylədim,
Oturub hesabım çəkirəm indi.

## QƏRİBDİ

Bir məclisə, bir şənliyə gedəndə,
Hamı deyər – baxın, gələn qəribdi.
Vətən həsrətinnən, el möhnətinən,
Günəştək saralıb, solan qəribdi.

Elə ah-vay çəkər hər an, hər gecə,
Yurd-yuva axtarar, gəzər ölüncə.
Dərdini içində çəkib gizlicə,
Əlləri qoynunda qalan qəribdi.

Gecə-gündüz haraylaram elimi,
Dərdinnən yükləyib əydim belimi.
Hacı deyər, bahar buludu kimi,
Gözləri həsrətdən dolan qəribdi.

## SALAMAT QALIN

Bəlkə, qayıtmadım, görmədim sizi,
Nərgizli yaylaqlar, salamat qalın.
Gedirəm, sən Allah, halallıq verin,
Ay elsiz oymaqlar, salamat qalın.

“Hacı Heydər”, “Samux düşən”, “Ala göl”,
“Bəylik yalı”, sarımsaqlı “Çala göl”,
Elin getdi, sən salamat qal, a göl,
Sahibsiz oylaqlar, salamat qalın.

Zimistan adlayıb, yaz gələn zaman,
Mağarlar bəzənib saz gələn zaman,
Gəlin otağına naz gələn zaman,
Titrəşən dodaqlar, salamat qalın.

Amansız zəmanə, bir sualım var:
Niyə tökdün yolum üstdə boran, qar.
Həsrət çəkər gözü yolda intizar,
Lilparlı bulaqlar, salamat qalın.

Hacıyam, zirvəsi görünən dağlar,
Al-yaşıl bəzənib bürünən dağlar,
Duman ətəyinə sürünən dağlar,
Müqəddəs ocaqlar, salamat qalın.

## YOXDU

Mətahı ucuzdu bu qocalığın,
Alan yox, satan yox, bazarı yoxdu.
Qızıl cavanlığa tez əsər xəzan,
Zalım qocalığın azarı yoxdu.

Oğul sözə baxa, gəlin xoşduya,
Bir vura, insafı ola, boşduya,
Qorx o gündən, nəvələrin daşdıya,
Deyələr, kişinin bazarı yoxdu.

Hacı qocalıban, kirdən düşərmiş,
İnsan dəyişərmiş, birdən düşərmiş,
Qocalıqda ağıl sərdən düşərmiş,
Arvad da deyərmiş, nəzəri yoxdu.

## SƏNİN OLSUN

Gəl, bizim ellərin seyrinə çıxaq,
Bu oba, bu oymaq, el sənin olsun.
Nəğmələr oxuyub, şərqilər deyən,
Dodaq sənin olsun, dil sənin olsun.

Keyti, Tərsə - baxırsanmı o dağa,
Lalələr, nərgizlər düşüb sorağa.
Şehli çəmənliyi gəzək, ay qağa,
Çiçək sənin olsun, gül sənin olsun.

Sabah yeli sığal çəksin telinə,
Bal bələnsin dodağına, dilinə.
Əlini ver sən Hacının əlinə,
Salamını alan əl sənin olsun.

## MURAD NİYAZLI
***(1933-2005)***

***Aşıq Murad Niyazlı (Murad Babaxan oğlu Həsənov) 1933-cü ildə Göyçə mahalının Aşağı Şorca kəndində anadan olub. Atası İkinci Dünya müharibəsində itkin düşdüyündən anası ilə birlikdə Şəmkir rayonunun Dəllər Cəyir kəndinə gələrək burada yaşamağa başlayıb.***

***O, 1950-ci illərdən şeir yazmağa başlayıb, eyni zamanda aşıqlığa həvəs göstərib. Aşıq Əsəd Rzayev və onun qardaşı Aşıq Məhəmmədin yanında bir müddət şəyird olduqdan sonra müstəqil aşıqlıq etməyə başlayıb. Onun şeirləri müxtəlif mətbuat orqanlarında dərc olunub, "Harda türk var, mən ordanam" adlı kitabı çap olunub.***

***Aşıq Murad Niyazlı 2005-ci ildə vəfat edib, Dəllər Cəyir kəndində dəfn olunub.***

### ÇIXAR

Sahibinə tabe olmaz, bir söz ki dildən çıxar,
Qanadlanıb uçub gedər, mahaldan-eldən çıxar,
Həqiqəti, doğru sözü çox zaman pəsdən deyərlər,
Yalanların, böhtanların sədası zildən çıxar.

Ucalığa dağ deyiblər, qarlı-qarsız – fərqi yox,
Ömür ki var, bir vəyğadır, varlı-varsız – fərqi yox.
Köksüz ağac tez quruyar, barlı-barsız – fərqi yox,
Saxta saxtadan törəyər, əsil əsildən çıxar.

Aşıq Murad Niyazlının sözləri ləldən gözəl,
Sevir haqı, ədaləti, buraxmaz əldən gözəl,
Kənar gəz, gendə dolan, çirkin əməldən, gözəl,
Yaxşı ər, yaxşı igid, yaxşı nəsildən çıxar.

## TÜRK OĞLUYAM, TÜRKƏM, OĞUL

Əcdadımı xəbər alsan,
Türk oğluyam, türkəm, oğul!
Məni əyməz nə yağlı dil,
Nə də quru görkəm, oğul,
Türk oğluyam, türkəm, oğul!

Uçurub könlüm şəhrini,
Bulandırma qəm bəhrini,
Çəkə bilməz el qəhrini,
Hər ağılsız, hər kəm, oğul,
Türk oğluyam, türkəm, oğul!

Kəclə kəcəm, çiylə çiyəm,
Dünya görmüş bir kəndçiyəm.
Nə qatıra yedəkçiyəm,
Nə yabıya tərkəm, oğul,
Türk oğluyam, türkəm, oğul!

Aşığam, hər nəyəm, buyam,
İnanma, namərdə uyam.
Alışana sərin suyam,
Üşüyənə kürkəm, oğul,
Türk oğluyam, türkəm, oğul!

Niyazlı əl üzməz Haqdan,
İlham alır hər sabahdan.
Pak çıxmışam çox sınaqdan,
Poladdan da bərkəm, oğul,
Türk oğluyam, türkəm, oğul!

## HARDA TÜRK VAR, MƏN ORDANAM

Mərd doğulmuş, mərd ucalmış,
Harda türk var, mən ordanam.
Döyüşlərdə zəfər çalmış,
Harda türk var, mən ordanam.

Təbriz, Bakı, cəm Osmanlı,
İgidləri şöhrət-şanlı,
Təmiz qanlı, pak vicdanlı,
Harda türk var, mən ordanam.

Bulaqları sərin, buzlu,
Bayraqları Ay-ulduzlu.
Söz-söhbəti dadlı-duzlu,
Harda türk var, mən ordanam.

Qana-qana, bilə-bilə,
Çox keçmişik əldən-ələ.
Dağıstandan Çənlibelə,
Harda türk var, mən ordanam.

Koroğlu tək ər oğlu ər,
Dəliləri mərd, müzəffər,
Cünun kimi sinədəftər,
Harda türk var, mən ordanam.

At oynadan, qılınc vuran,
Düşməninə qan udduran.
Sazlı-sözlü məclis quran,
Harda türk var, mən ordanam.

O bir kitab, içində Haqq,
Gəl, aç oxu, varaq-varaq.
Niyazlıdan tutsan soraq,
Harda türk var, mən ordanam.

## DÜŞDÜ

Dilbər, sənin baxışların,
Dastan oldu, dilə düşdü.
Gözlərinin giləsindən,
Gözlərimə gilə düşdü.

Səhər oldun bir axşama,
Ürəyimə dama-dama.
Pərvanə yanmağa şama,
Özü bilə-bilə düşdü.

Niyazlıyam, var ilqarım,
Tükənməzdi etibarım.
Qönçələnmiş arzularım,
Çovğun gördü, selə düşdü.

## GÖZLƏ

Xainin dilindən zəhrimar yağar,
Kinli ürəyindən özünü gözlə.
Səxavət əhlindən səxavət doğar,
Namərd çörəyindən özünü gözlə.

Söyləyərlər, yaxşı işi deyərlər,
Əsli-zatı, var keçmişi deyərlər.
Kişiylə otursan kişi deyərlər,
İnsanın səyindən özünü gözlə.

Günəşin şöləsi sönərsə bir an,
Məhv olar kainat, yaşamaz insan.
Vurağan öküzdən, xəfkir qatırdan,
Atın ürkəyindən özünü gözlə.

Şəri-böhtan ilə yarışmaq olmaz,
Bilmədiyin işə qarışmaq olmaz.

Çirkin əməllərlə barışmaq olmaz,
Dilin sürçəyindən özünü gözlə.

Süzülmüş ayrana yağ deyənlərin,
Ulğun kollarına bağ deyənlərin,
Alçaq təpələrə dağ deyənlərin,
Fitnə kələyindən özünü gözlə.

Mərdlərin mərdliyi, igidin adı,
Dilsiz əsrlərin yollarındadı.
Pələngin var gücü qollarındadı,
Tutma biləyindən, özünü gözlə.

Həqiqətə  bənzəyərmi yalan da,
Eşşək ölsə, təqsir qalır palanda.
Ruzigar bədləşib, qaş qaralanda,
Qurdun kürsəyindən özünü gözlə.

## BİR SƏHƏR GƏL, BİR GÜNORTA, BİR AXŞAM

Vəfalı dilbərim, məni görməyə,
Bir səhər gəl, bir günorta, bir axşam.
Halımı soruşub salam verməyə,
Bir səhər gəl, bir günorta, bir axşam.

Deyək, gülək, söhbət açaq sazınan,
Fərə kəklik kimi xoş avazınan,
Bəzən, sallan bizə qarşı nazınan,
Bir səhər gəl, bir günorta, bir axşam.

Keçən günlər bir də düşsün yadına,
Şeir yazdım, dastan qoşdum adına.
Aşıq Murad Niyazlının dadına,
Bir səhər gəl, bir günorta, bir axşam.

## DEYİL

Sevincdənmi, kədərdənmi nəmlənib,
Gözlər o gözlərdir, yaş o yaş deyil.
Cəm gözəllik camalında cəmlənib,
Baxış o baxışdı, qaş o qaş deyil.

Bağçamızda gül-çiçəyə batardın,
Qoltuğuma qısılardın, yatardın,
Hey dalımca söz sapandın atardın,
Dillər o dillərdir, daş o daş deyil.

Ömrümüzü yola verdik birtəhər,
Arzular çevrilib olubdur qəhər.
Yolunu gözləyən hər axşam-səhər
Murad o Muraddır, yaş o yaş deyil.

## ÇIXIBDI

Vətən oğlu, sizə xəlvət sözüm var,
İşlərimiz çox gülməli çıxıbdı.
Ağıllı bildiyim, alim saydığım
Dostlarımdan biri dəli çıxıbdı.

Böhtan sözdən, bir də şərdən qorxuram,
Xəfkir atdan, qızmış nərdən qorxuram,
Yaman gözdən, bədnəzərdən qorxuram,
Bu gün qabağıma Vəli çıxıbdı.

Bilirsənmi, söz qılıncı yamandı,
Sayıq ol, yaz-yarat, yatma, amandı.
Müxtəsər, qardaşım, xeyli zamandı,
Muradın hər şeydən əli çıxıbdı.

## QADASI

Enişli-yoxuşlu bu yollarda mən,
Min bəla görmüşəm azı, qadası.
Haqqı, ədaləti gözləyənlərdən
Olmuşam həmişə razı, qadası.

Hərənin bir şeyə olar həvəsi,
Nadanlar alimlə çəkməsin bəhsi.
İblis olar iblisin də nəvəsi,
Edər atasına nazı, qadası.

Həmişə mərd deyib atalar mərdə,
Günəşin üzünə çəkilməz pərdə.
“Təqsir” Alıdamı, ya Ələsgərdə,
Onlar niyə çalıb sazı, qadası!?

Xanəndədən gəlir “Şikəstə” səsi,
“Şur” ilə “Segah”ın şirin nəfəsi.
Əcnəbi xalların bu işgəncəsi
Tanıtdırır hoqqabazı, qadası.

“Dilqəmi” çal, qoy qəlbimi dağlasın,
“Kərəmi” çal, yazıq nənəm ağlasın.
“Koroğlu” çal, atam qılınc bağlasın,
Doldurma beynimə “caz”ı, qadası.

Çox sərvətli bağça-bardı Niyazlı,
El yanında üzü ağdı Niyazlı.
Neçə ki ölməyib, sağdı Niyazlı,
Gələcəkdir xoş avazı, qadası.

## YADIMA DÜŞÜBDÜ

İtirdiyim uşaqlığı, gəncliyi
Tapan ola tez, yadıma düşübdü.
Həzin-həzin şirin bir layla səsi,
Baş qoyduğum diz yadıma düşübdü.

Quzu otardığım, dağlar aşdığım,
Dəyə, alaçıqdan uzaqlaşdığım,
Dumanda, çisgində yolu çaşdığım
Dərə, təpə, düz yadıma düşübdü.

Tay-tuşlarım çağırırdı: qaşa çıx,
Gədiklərdən çən çəkildi, başa çıx.
Şehli otda ayaq yalın, baş açıq
Saldığımız iz yadıma düşübdü.

Nənəm məni oyadardı hər sabah,
Eyləyərdim umu-küsü, qaş-qabaq:
"Baban yatır, səs salmayın, ay uşaq!"
Anam deyən söz yadıma düşübdü.

Qoltuğumda yağlı fətir, bir kətə,
Hərdən-hərdən çəkilərdim xəlvətə.
Aşıq Murad, ayrılığa, həsrətə,
İyidsənsə, döz, yadıma düşübdü.

## ÇƏKƏR

İnamsızdan, ilqarsızdan, karsızdan,
Ayaq ziyan çəkər, əl ziyan çəkər.
Utanmazdan, abırsızdan, arsızdan,
Mahal ziyan çəkər, el ziyan çəkər.

Ağıllı söz çıxar kamallı başdan,
Mərhəmət gözləmək olarmı daşdan?
Süzülən gözlərdən, çatılan qaşdan,
Kəmər ziyan çəkər, bel ziyan çəkər.

Şoran su kökündən qurudar bağı,
Doğru söz arana endirər dağı,
Bar verən ağacın sınsa budağı,
Bağban ziyan çəkər, gül ziyan çəkər.

Adıyla bağlıdır hər şeyin dadı,
Buğdanı bəyənmir arpanın cadı.
Bayquşun bəyliyi gün çıxıncadı,
Aylar ziyan çəkər, il ziyan çəkər.

Niyazlı, kənar gəz qorlanan közdən,
Şübhəli baxışdan, həyasız üzdən.
Mənasız söhbətdən, mənasız sözdən,
Dodaq ziyan çəkər, dil ziyan çəkər.

## İNDİ

Məcnun kimi bir Leylinin üzündən,
Dərd birdir canımda ay yara, mindi.
Yaman məni yad elədi yaxşıdan,
Hərcayi dilbərə ay yaram, indi.

Əl gətirmir, xoş keçməyir həyatım,
İstəyirəm dost-tanışa hay atım.
Tanrı ruzi yetirərmi, ha yatım?
Bundan uzaq olsun, ay aram indi.

Ey Niyazlı, etibar gəz, dost ara,
Bel bağlama şirin dilli dostlara.
Kim tor qurur, deyir düşsün dost dara,
Əlindən doğrayam, ay yaram indi.

## ALAR

Şeytanın adətidir,
nəmərini lənətdən alar,
Şər əkər, ləzzət çəkər,
düşüb kəndbəkənddən alar,
Ulayar bayquş kimi,
qopan qiyamətdən alar,
Girən insan cildinə,
sirrini xəlvətdən alar,
Hansı yerdə tutsa əli,
utanmaz nifrətdən, alar.

Aslanlar tordadırmı,
tülkülər şikar axtarır,
Hiylə qurub ev yıxmağa,
özünə həmkar axtarır,
Eşidin, ayıq olun,
pünhan yox, aşkar axtarır,
Hər yaranmış halal-haram,
dolam üçün var axtarır,
Qansoran, boyunburan
kefi xəcalətdən alar.

Əl tutub, dostam deyən,
tez danır, ilqarı yeyir,
Məzlumun qazancını,
cəllad olan yarı yeyir,
Quyruğu qurd aparır,
tərlan isə darı yeyir,
Sərçələr tuluq deşir,
siçanlar anbarı yeyir,
Nütfəsi kəc, zatı haram
dərsi xəyanətdən alar.

Qorxmayıb düz danışmaq,
nər oğlu nərin işidir,
Ucalmaq-enmək, yıxılmaq,
bu dünyanın gərdişidir,
Yeməyib, var toplamaq,
xəsislərin vərdişidir,
Nadandan nadan törəyər,
kişidən olan kişidir,
Zalım keçsə iş başına,
hayıfını millətdən alar.

İstəmirəm var-dövləti,
bircə sağlam canım ola,
El sevən, mahal sevən
ürəkdə pak qanım ola,
Göz dikməyəm özgələrə,
sınmayan vicdanım ola,
Müxənnəti oxlamağa,
əlimdə kamanım ola,
Onda Murad ilhamını
yazdığı beş benddən alar.



## MAHMUD MƏMMƏDOV
*(1935 - 2020)*

***Mahmud Qasım oğlu Məmmədov 1935-ci ildə Göyçənin Ağbulaq kəndində anadan olub. Qərbi Azərbaycandan 1948-ci il deportasiyası zamanı ailəsi ilə birgə Tovuz rayonuna köçüb. Aşıq İmran Həsənov 1950-ci ildə onun zil səsini, saza həvəsini nəzərə alıb yanına şagird götürüb.***

***Aşıq Mahmud Azərbaycan aşıqlarının III, IV, V və VI qurultaylarında iştirak edib. Onun söylədiyi "Koroğlu" və "Abbas-Gülgəz" dastanı Azərbaycan Televiziyasının Qızıl Fondunda saxlanılır. Bədii yaradıcılıqla da məşğul olub, bir neçə kitabı işıq üzü görüb. 2008-ci ildən ölkə Prezidentinin fərdi təqaüdünə, 2019-cu ildə isə "Əməkdar mədəniyyət işçisi" fəxri adına layiq görülüb.***

***Aşıq Mahmud Məmmədov 2020-ci ildə Bakıda vəfat edib.***

### MİN ŞÜKÜR

Bu qəlbimdən qəmi sildi, ol Xudaya min şükür,
İşimi sahman eylədi, saldı saya, min şükür.
Sənətimin qüdrətiylə catdım şana-şöhrətə,
Həmd olsun cəlalına, o Mövlaya min şükür.

Bu dünyanın əşrəfidi, hər bir insan xilqəti,
Cismi yoxkan ruh yarandı, o, dünyanın isbatı.
Hər bir kəsə qəlbə görə Allah verir qisməti,
Həm adildi, həm qadirdi, Mürtəzaya min şükür.

Gəl biçarə Aşıq Mahmud, dünya fanidir, tanı,
Neçə şahlar, sərkərdələr göstər, görünmür, hanı?!
Arzular başa çatınca əcəl verməz amanı,
Bu dünyadan kar görmədim, ol üqbaya min şükür.

## QURBAN OLUM

Gah qəzəbli, gah mehriban,
Baxışına qurban olum.
Ağ üzündə qoşa xalın
Naxışına qurban olum.

Eşqin min cür bəlası var,
Sevinci var, naləsi var.
Vüsalının şəfası var,
Baxışına qurban olum.

Mahmud, nələr çəkib başın,
Müştağıyam qələm qaşın.
Şəhla gözdən axan yaşın
Axışına qurban olum.

## MƏRDƏ MƏNİ

Yaradıbsan, yaradanım,
Qoymaginən darda məni.
İşimi salma namərdə,
Möhtac eylə mərdə məni.

Zərrə qədər salsan nəzər,
Tutmaz məni qəza-qədər.
Uzaq olar qəhər, kədər,
Tapar şöhrət, var da məni.

Aşıq Mahmud, Haqqı tanı,
Unutma dini-imanı.
Xoş keçərsə güzaranı,
Əzizləyər yar da məni.

## İNSAN

Təqdiri yazıdır yaranan gündən,
Nə yazılıb, görməlidir hər insan.
Təqdirə tədbir yox, yazıya pozu,
Şükr eylə Allaha hər səhər, insan.

Tamahkarı şeytan yoldan çaşdırar,
Fitnəsi aləmi hey qarışdırar.
Adam var, bir sözlə qan barışdırar,
Hər kəs olmalıdır bu təhər, insan.

Ay Mahmud, tez keçdi ömrün baharı,
Gənclikdə bilməzdin qəmi, qubarı.
Qalacaq dünyada dünyanın varı,
Qazan o dünyanı mötəbər, insan.

## ƏLVİDA

A dağlar, bir ömür yaşadım sizdə,
Cığırım əlvida, izim əlvida.
Ağır elim-obam, salamat qalın,
Oğulum əlvida, qızım əlvida.

Qalmadı gözlərim dünya varında,
Sədaqətli oldum dost ilqarında.
Ağlayıb-gülmüşəm öz məqamında,
Söhbətim əlvida, sözüm əlvida.

İnsan əmanətdir, dünya baqidir,
Nədən, insan bir-birinə yağıdır?
Ay Mahmud, ömrünün xəzan çağıdır,
Sənətim əlvida, sazım əlvida.

## DÜNYADA

Nə gözəl yaradıb gözəl Yaradan,
Gözəl, gəlməyəsən gözə dünyada.
Gözəl olan gözəl adın gözləyər,
Gözəl də gəşt edə gəzə dünyada.

Adın da gözəldi, özün də gözəl,
Yaranıb qoşa xal üzündə, gözəl.
Tərifin də gözəl, sözün də gözəl,
Layiqsən dastana, saza dünyada.

Bəxş eyləyib sənə ol kərəm kanı,
Hüsnün mat eyləyir görən insanı.
Mahmudam, kəsərəm qada-qurbanı,
Görməyəsən qəhri-qəza dünyada.

## İNDİ

Qəlbimdə təlatüm, başımda fikir,
Oğulsan, bir ömür vur başa indi.
Nə haqq-ədaləti yada salan var,
İki yumruq dəyir bir başa indi.

Boş vədlər, ümüdlər deməyə nə var,
Fağırın malını yeməyə nə var,
Kimsəsiz yazığı döyməyə nə var,
Hələ sür dövranın birbaşa indi.

Ay Mahmud, seçən yox ağı qaradan,
Onunçün zülm edir bizə yaradan.
Oğullar məhv oldu, getdi aradan,
Taleyi toxundu gör daşa indi.

## AY ELLƏR
***(Dədə Qorquda həsr olunur)***

Unutmaq olarmı Dədə Qorqudu,
Hər sözü bir həqiqətdi, ay ellər.
Sazdı-sözdü məclislərin bəzəyi,
Ədəb-ərkan, mərifətdi, ay ellər.

Aləmə bəllidi onun sənəti,
Öz nurundan xəlq eyləyib qüdrəti.
Gözəl ənənəni, gözəl adəti,
Pozmaq olmaz – cinayətdi, ay ellər.

Elindən yaranır elin aşığı,
Elə arxalanır, elin aşığı.
Mahmud da sayılır elin aşığı,
Əzizləyin, əmanətdi, ay ellər.

## BƏS EYLƏR

Səxavət gözləmə namərddən, könül,
Allah verən qismət sənə bəs eylər.
Telli sazla qazandığın şan-şöhrət,
Xalq yanında hörmət sənə bəs eylər.

Nə alçalmaz, nə ac qalmaz sənətkar,
Kim apardı bu dünyadan sərvət-var?!
Baş ucaldar təmiz vicdan, təmiz ar,
El verdiyi qiymət sənə bəs eylər.

Ömrün baharında qaynadım, coşdum,
Sənət aləmində zirvələr aşdım,
Çalışdım, aşıqlar sanına düşdüm,
Ay Mahmud, bu şöhrət sənə bəs eylər.

## GƏLMİŞƏM

Ağbulaq beşiyim olub əzəldən,
Halal südün əmib cana gəlmişəm.
Anamın o isti qucağında mən,
Böyümüşəm, ətə-qana gəlmişəm.

Körpə vaxtı tez ayrıldım elimdən,
Gözəl adı heç düşməyib dilimdən.
Uzaq düşmək betər olur ölümdən,
Görüşəndə din-imana gəlmişəm.

Dağı-daşı mənə həyan Ağbulaq,
Adı-sanı elə bəyan Ağbulaq,
Mən Mahmudam, gəzsəm ha yan, Ağbulaq,
Ziyarətə bu məkana gəlmişəm.



## VALEH HƏSƏNOV
*(1937)*

***Valeh Rəhim oğlu Həsənov 1937-ci ildə Qərbi Azərbaycanın Göyçə mahalında sənətkar ailəsində dünyaya gəlib. Onun atası Rəhim dövrünün tanınmış aşıqlarından olub. Sənətin sirlərini də ailədə atasından öyrənib.***

***Aşıq Valeh 1961-ci ildə ailəsi ilə birgə Zaqatalaya köçüb, burada sənətini davam etdirib. Bu gün də mühitin yaradıcı mənzərəsinə öz töhfələrini verir. Klassik dastanlarımızı mükəmməl bilir, "Aşıq Valeh və Afət" dastanının müəllifidir.***

***Aşıq Valeh bədii yaradıcılıqla da məşğul olur, "Mərcan gözlər", "Dastanlar", "Vüqar və Aypara dastanı", "Mən necə yazmayım Zaqataladan" adlı kitabları nəşr olunub. Hazırda Zaqatala şəhərində yaşayır.***

### ŞİŞQAYA

Tifilkən köç eylədim elimdən,
Vətən sözü heş düşmədi dilimdən,
Yurdum-yuvam tamam çıxdı əlimdən,
Qürbətdə bir ayım döndü min aya,
Ulu Göyçə, Göyçə gölü, Şişqaya.

Gəzib dolaşsam da Böyük Qafqazı,
Göyçə dağlarından aldım avazı.
Bir az qəmli çaldım sədəfli sazı,
Çox həsrətlə baxdım bu gen dünyaya,
Ulu Göyçə, Göyçə gölü, Şişqaya.

Qürbətdə şöhrət də, şanda qazandım,
Hörmət gördüm hər insanda, qazandım,
Nə qazandım, bu məkanda qazandım,
Ucaltdılar məni ulduza, Aya,
Ulu Göyçə, Göyçə gölü, Şişqaya.

Dolaşdım dünyanı, gəzdim hər yanı,
Doğma vətən seçdim Zaqatalanı.
Qardaş-bacı bildim hər bir insanı,
Məni çox hörmətlə saldılar saya,
Ulu Göyçə, Göyçə gölü, Şişqaya.

## ƏLƏSGƏR

Ey ulu göylərin nəğməkar oğlu,
Şairlər sultanı, şahı Ələsgər!
Köksündə gömüldü, qara torpağa,
Şeyriyyətin çeşməgahı, Ələsgər!

Ziyarət etmirəm səni müddətdir,
Göyçə viran oldu, gör nə möhnətdir?!
Doğma vətənində qəbrin qürbətdir,
Yoxmu bunun bir pənahı, Ələsgər?!

Səni məğlub edən olmayıb hələ,
Sən çox meydanlara saldın vəl-vələ.
Ələsgərlə  Nəcəfi, sən verdin elə,
Aşıqlar mayağı, mahı, Ələsgər!

Çoxları səninlə girdi meydana,
Kəlin meydanında dözərmi dana?
Çoxunu gətirdin dinə, ərkana,
Çoxlarının qibləgahı, Ələsgər!

Qalib çıxdın hər deyişmə anında,
Üzüağ dayandın ustad yanında.
Şeir aləmində, söz meydanında,
Bağlamısan bəndərgahı, Ələsgər!

Valeh də dərsini səndən alıbdı,
Həsrətinlə dərdə, qəmə dalıbdı.
Yurdun-yuvan gör kimlərə qalıbdı,
Ustadlar ustadı, dahi Ələsgər!

## DÜŞMÜŞƏM

Susubdu idrakım, dağılıb huşum,
Bu səbəbdən bəd iqbala düşmüşəm.
Kütləşibdi zehnim, işləmir başım,
Eşq ucundan daldan dala düşmüşəm.

Həsrətin canıma salıbdı tonqal,
Canımda tonqaldı, qəlbimdə manqal.
Ya yetir dərmana, ya gəl canım al,
Ya nəzər sal, gör nə hala düşmüşəm.

Ölüncə eşqinlə yaşayacağam,
Yaşasam da, həsrətinlə naçağam.
Qohum, qonşu, dost-tanışdan qaçağam,
Mən Valehəm, yüz xəyala düşmüşəm.



## FƏTULLA GÖYÇƏLİ
*(1941)*

***Fətulla Əbdüləzim oğlu Əliyev 1941-ci ildə Göyçə mahalının Nərimanlı kəndində dünyaya göz açıb. Kiçik yaşlarından saza-sözə böyük maraq göstərən Fətulla iki il müddətində aşıqlıq sənətinin sirlərini Qanlılı Aşıq Mehdidən öyrənib, sonra isə Aşıq Ələsgərin oğlu Aşıq Talıba qulluq edib.***

***H.Zərdabi adına Kirovabad Pedoğoji İnstitutunun (indiki Gəncə Dövlət Universiteti) dil-ədəbiyyat fakültəsini bitirib.***

***Qərbi Azərbaycandan 1988-ci il deportasiyasından sonra Gəncə şəhərində məskunlaşan Aşıq Fətulla İ.Qayıbov adına musiqi məktəbində şəxsi təşəbbüsü ilə ilk dəfə olaraq saz sinfi açıb, burada çoxlu yetirmələri olub.***

***Bədii yaradıcılıqla da məşğul olan Fətulla Göyçəlinin "Yurd yeri", "Göyçəsiz dağlardan yaman küsmüşəm" və "Göyçə – dahilər yurdu" adlı kitabları işıq üzü görüb.***

***Azərbaycan Aşıqlar Birliyi İdarə heyətinin üzvüdür.***

***Azərbaycan Respublikası Prezidentinin 15 iyul 2016-cı il tarixli sərəncamı ilə aşıq Fətulla Əliyev "Əməkdar mədəniyyət işçisi" fəxri adına layiq görülüb.***

### GÖYÇƏ

Köç karvanım yola düşür,
Sən də ağla, mən də, Göyçə.
Görüşmədik bir də bəlkə,
Sən də ağla, mən də, Göyçə.

Göyçə gölüm layla çalar,
Ələsgərim fikrə dalar,
Səhnəbanım saçın yolar,
Sən də ağla, mən də, Göyçə.

Ustad Alı, şair Bəhman,
Bəs, de, hanı Növrəs İman?!
Nəcəfindir oda yanan,
Sən də ağla, mən də, Göyçə.

Qoy öpüm mən torpağından,
Ayrı düşdüm qucağından.
Necə köçüm ocağımdan?
Sən də ağla, mən də, Göyçə.

Harda dost tapım özümə,
Qüvvət verən yox sözümə.
Küləyin dəysin üzümə,
Sən də ağla, mən də, Göyçə.

Fətullanı yola salsan,
Qəm sazını alıb çalsan,
Gedirəm, salamat qalsan,
Sən də ağla, mən də, Göyçə.

## DAĞLAR

Yenə yönüm düşdü sizə,
Ağır elsiz qalan dağlar.
Heyif, Göyçə getdi əldən,
Məni məndən alan dağlar.

Bu dərd yandıracaq məni,
Heç dərmirəm bənövşəni.
Nə bərk alıb duman səni,
Qəm sazını çalan dağlar.

Fətulla, bil, haqdı ölüm,
Bir alçal, Vətəni görüm.
Pisdən də pis gəlir ilim,
Bizi dərdə salan dağlar.

## ÖPÜM

Göyçəsiz öldürmə, ey Allah məni,
Gedim vətənimin daşından öpüm.
Ziyarət eyləyim Ələsgər yurdun,
Çalmalı dağının qaşından öpüm.

Düşüm laylasına Göyçə gölünün,
Baxım mən yurduna Məmməd Göyünün.
Seyid Bayramın, Qara Seyidin,
Əyilib ocağının daşından öpüm.

Alı, Ələsgərdən bir şeir deyim,
Misgin Abdaldan bir hədis deyim.
Növrəst İmandan bir təcnis deyim,
Ağlayan gözünün yaşından öpüm.

Ata məzarında dayanım bir an –
Fətulla, talanıb tamam qəbiristan.
Bir bayatı deyim, ağlasın anam,
Qara örpəyinin altından öpüm.

## "YURD YERİ"

Ellər o dağlara çıxmaz bir daha,
Yağılara yaman qaldı "Yurd yeri".
Hərə səpələnib düşüb bir düzə,
Ayrılıq təbilin çaldı "Yurd yeri".

Daşlı Güney – Ələsgərin oylağı,
Qan ağlayar Çalmalının yaylağı.
Sarıyer, Qaraxaç elin sorağı,
Açan gülün tezcə soldu, "Yurd yeri".

Aman Allah, bu nə ahdı, amandı,
Keyti dağı göz önümdə dayandı.
Uzun Güney, Qumlu bulaq odlandı,
Dərin xəyallara daldı, "Yurd yeri".

"Baleylinin komu", "Sarı dərəsi",
Bal dadardı südün axşam sərməsi.
Yeməliydi əmliklərin kərəsi,
Fikir məni nə bərk aldı, "Yurd yeri".

Hayana baxıram dərddi, vərəmdi,
Göyçə Əsli, Fətulla da Kərəmdi.
Kim çəkər, ay ellər, axı bu dərdi,
Yaman ayrılığı saldı "Yurd yeri".

## GÖRDÜM

Yuxumda Göyçəyə getmişdim, Allah,
Endim Çalmalıdan, gölləri gördüm.
Bənövşə boynunu bükmüşdü yaman,
Düşmənin əlində gülləri gördüm.

Kom yerini gəzib gəldim Zinaya,
Qarabulaq, həm Daltəpə haraya.
Xaçda gördüm hər şey uçdu havaya,
Axtarırdı keçmiş illəri, gördüm.

Bəd gəldi atamın baharı, yayı,
Ünüm ərşə çıxdı, yoxdu harayı.
Uçdu varlığımın ömür sarayı,
Gözümə toxunan milləri gördüm.

Seyid Mahmud burda çatdı imdada,
Seyid Miri vurğun oldu min ada.
"Bu ah yerdə qalmaz", – dedi, dünyada,
Qeybdən səslənən dilləri gördüm.

Fətulla, ağlayıb, eylədim fəryad,
Bizi yaradandan istədim imdad.
Yetişsin dadıma, xudaya, min ad,
Vətənsiz uzanan illəri gördüm.

## MƏNİM

Göyçə yenə yaman yadıma düşdü,
Dolanar qəlbimdə haralar mənim.
Heyif, əldən getdi sazlı yığnaqlar,
Dağlayıb, sinəmi paralar mənim.

Analar da gözlərindən yaş tökər,
Qalan məzarlara kimlər baş çəkər.
Qəribsəyir Alı, Bəhman, Ələsgər,
Bu sınıq qəlbimi yaralar mənim.

Fətulla, tarixin belə hökmü var,
Yuxusunda Göyçə deyər uşaqlar.
Kimə qaldı şır-şır axan bulaqlar,
Ağlayıb, gözlərim qaralar mənim.

## ÇAĞIRIR

Bu saat Göyçənin elə vaxtıdı,
El dağa çıxmağa yolu çağırır.
Durnalar ötüşür göyün üzündə,
Sonalar üzməyə gölü çağırır.

Saz səsinə həsrət qalıb Göyçəmiz,
Vətənin qəhrinə dalıb Göyçəmiz,
Ələsgəri dərdə salıb Göyçəmiz,
Bir ağı deməyə dili çağırır.

Elimiz bəzənmir toy libasına,
Dalıbdı düşmənin qanlı yasına.
Elə sükut çöküb el-obasına,
Fətulla haraya eli çağırır.

## GÖSTƏR

Ey bizi cövhərdən yaradan kişi,
Düşmənə möcüzə, amandı, göstər.
Fironu dəryaya qərq edən kişi,
Vətənsiz yaşamaq yamandı, göstər.

Bir möcüzə göstər yerə, oynasın,
Dağlar dəyib bir-birinə, dayansın.
Seyid Bayram, Qara Seyid oyansın,
Həmişə muraza çatandı, göstər.

Vətənsiz ölməsin yazıq Fətulla,
Gecə-gündüz nə qədər çəkərlər ah.
Sənə qurban olum, ey ulu Allah,
Göyçəmizin üstü dumandı, göstər.

## AĞLADIM

Elə bildim bu meh Göyçə mehidi,
Üzümə sığalı çəkdi, ağladım.
Yuxumda gördüm ki, dağa çıxmışam,
Atam çadırımızı tikdi, ağladım.

Elə bildim düşdüm çayın içinə,
Sel də gəlib tamam dolub əkinə.
Mən çıxmışam Çalmalının dikinə,
Anam tez əlimdən çəkdi, ağladım.

Yuxumdan heç çıxmır Göyçə, ay aman,
Yurdumda turp əkdi insafsız, nadan.
Vətən, vətən deyib odlanıb yanan,
Fətulla dərdləri çəkdi, ağladım.

## OLMUR

Ağılsızlar yaman alıb dünyanı,
Bircə kəlmə deyib-danışmaq olmur.
Yalan ayaq tutub yaman artıbdır,
Düz sözə inanıb, barışmaq olmur.

Yaxşıların sözü qalıb gümana,
Lotulara meydan verib zamana.
Məclislərdə söz verilmir qanana,
Gedib əyriyə də yapışmaq olmur.

Fətulla nə çalıb, oyna, zamana,
Kəlin meydanında nə dözər dana.
Oğrular, quldurlar girib meydana,
Dil tapıb, biriynən danışmaq olmur.

## BAĞLIDI

İndi dostlarımız, ay Vətən oğlu,
Açığı, aşkarca pula bağlıdı.
Görürsən ismətli bir nazənin qız,
Ehtiyat ucundan dula bağlıdı.

Kişilik dediyin hanı, a qardaş,
Dar gündə yox olur vəfasız yoldaş.
Oğulsan, gəl çıxar bu dünyadan baş,
Bədbəxtlər həmişə yola bağlıdı.

Fətulla, seçilmir yaxşıyla-yaman,
İndiki zamandan aman, əl aman.
İndi köhlənlərə verilmir meydan,
Ulağın yanında çula bağlıdı.

## ƏZİZİM

Çox da gəl güvənmə dövlətə, vara,
Bu dünya çoxunu yeyib, əzizim.
Dövlət-malı qismət olub yadlara,
Zaman öz sözünü deyib, əzizim.

Bu həyatdan bac alanlar de, hanı,
Yola salıb gör neçə Süleymanı.
Güvənmə varına, Haqqını tanı,
Neçəsinin gözünü oyub, əzizim.

Hanı bu dünyada mənəm deyənlər,
Hanı bu dünyanı soyub yeyənlər.
Köçüb, ay Fətulla qədirbilənlər,
Yurd yerində nələr qoyub, əzizim.



## ALQAYIT XƏLİLOV
*(1942-2013)*

***Aşıq-şair Alqayıt Göyçə mahalının Daşkənd kəndində anadan olub. Ustadı atası aşıq Bayram Xəlilov olub. Şeirləri aşıqların repertuarında mühüm yer tutub. Bir neçə kitabı nəşr olunub.***

***Alqayıt Xəlilov 2013-cü ildə Bakıda vəfat edib.***

### BÜLBÜL

İnləyirsən daş qəfəsdə,
Can, a yazıq, can, a bülbül.
Nəğmələrin kədər, qüssə,
Oldu bağrım qan, a bülbül.

Qorxu, heyrət gözlərində,
İnam, cürət gözlərində.
Sənin həsrət gözlərində,
Sökülürmü dan, a bülbül?

Alqayıta dəyən yara,
Nə gizlidir, nə aşkara.
Qismət oldu qönçə xara,
Yan, a yazıq, yan, a bülbül.

### ÜSTƏ

Mən ömrümdə ilk dəfəydi,
Tüfəng aldım üzüm üstə.
Bir qartala güllə atdım,
Qan töküldü dizim üstə.

İtirmişdi yuvasını,
Axtarırdı balasını,
Yıxdı könlüm qalasını,
Bir od qoydu közüm üstə.

Alqayıtam, toba-toba,
Bir daha çıxmaram ova.
Hər nə desə bu el-oba,
İnnən belə gözüm üstə.

## GÖYÇƏM

Sənsiz məhbəsdəyəm, Günəşim tutqun,
Qız-gəlin ismətli, həyalı Göyçəm.
Xəyalım didərgin, qəlb evim uçqun,
Qədəmi şəfqətli, sayalı, Göyçəm.

Əritdi cismimi qəmin, kədərin,
İçirsən doymaram, baldır zəhərin.
Nə dastan gecən var, nə al səhərin,
Pas tutmuş könlümün royalı, Göyçəm.

Torpağa bağlılıq, qonağa hörmət,
Taledən bəxtinə yazılan qismət.
Adi çobanında bir dünya hikmət,
Bəstəkar qüdrətli, ziyalı, Göyçəm.

Sən mənə Vətənsən, yaşasam yüz də,
Möhnətin ürəkdə, kədərin üzdə.
Yoxdur bərabərin kürreyi-ərzdə,
Zirvəsi qartallı, qayalı, Göyçəm.

Mənə ilham payı, sənət də sənsən,
Xilqətə yalvarış, minnət də sənsən,
Sevgi də, vüsal da, cənnət də sənsən,
Sənsən Alqayıtın xəyalı, Göyçəm.

## TELLİ SAZ

Nəcəfil-əşrəfim, Məkkəm, Mədinəm,
Ən müqəddəs kitabımsan, telli saz.
Zər-ziba yatağım, ləlim, dəfinəm,
Əsrlərə xitabımsan, telli saz.

Əkdiyin qəm, becərdiyin gül oldu,
Həsrətindən dondu cismim, lül oldu.
Bir telində neçə aşiq kül oldu,
Möhnətimsən, əzabımsan, telli saz.

Əzəldən sən oldun şöhrətim, şanım,
O həzin tellərdə can verən canım.
Kərbəla dəştində tökülən qanım,
And yerimsən, mehrabımsan, telli saz.

Alqayıtam, Kür taleyim kürdür, kür,
Sən susanda gözlərimə qəm çökür.
Eldən-elə gəlin gətir, qız köçür,
Şərbətimsən, gülabımsan, telli saz.

## VERDİM

Vuruldum baharın təravətinə,
Könlümü hər yaşıl budağa verdim.
Can dedim qartalın əzəmətinə,
Fikrimi o dağa, bu dağa verdim.

Həsəd aparmışam qıy vuran selə,
Durna qatarını demirəm hələ.
Toxunmadım bir çiçəyə, bir gülə,
Nə yaxşı, nəfsimə qadağa verdim.

Alqayıtam, çiçək solğun, gül həşəm,
Bir baharda neçə xəzan görmüşəm.
Eldən yazmaq oldu sənətim, peşəm,
Canımı ellərə sadağa verdim...

## DÖNMƏMİŞ

Gərək baxışımdan duyasan məni,
Könlüm bir pərişan saza dönməmiş.
Gəl, yaşa ömrümün sevinc payını,
Qəhər qayıtmamış, qəza dönməmiş.

Xəyal qanadlanıb uçarmı, söylə?
Ana təbiəti qucarmı, söylə?
Nanələr, reyhanlar açarmı, söylə,
İllərin qış fəsli yaza dönməmiş.

Alqayıtam, duyğulardır sükutum,
Elə kainatam, yoxdur hüdudum.
Gəl, səni yandırsın alovum, odum,
Ürək səngiməmiş, buza dönməmiş.

## YADIMDA

Nə müddətdir ayrılmışam Vətəndən,
Ana yurdun odu qalıb yadımda.
Tütək səsi, ağ sürülər, göy çəmən,
O günlərdən budu, qalıb yadımda.

Vurulmuşam qıy səsinə qartalın,
Əsiriydim hər yamacın, hər yalın.
Ağ lavaşın, kərə yağın, şan balın,
Qovurmanın dadı qalıb yadımda.

Alqayıtam, dərdim, qəmim bilinib,
Bağrım başı şan-şan olub, dəlinib.
Hər nə varsa, xəyalımdan silinib,
Bir o elin adı qalıb yadımda.

## XƏBƏR GƏTİR

Uç, ay qartal, o viranə Göyçəni,
Təpədən dırnağa süz, xəbər gətir.
Əlində tutduğun qəm çələngini,
Yaralı köksünə düz, xəbər gətir.

Dağlar idi nəvasına uyduğum,
Lilparını əllərimlə soyduğum.
Bəsdir qəm yediyim, kədər duyduğum,
Qüssənin bağrını əz, xəbər gətir.

Hər nə görsən, çək sinəmə dağı, de,
Kim becərir o bağçanı, bağı, de?
Abbasbəydə qanad saxla, ağı de,
Tərsə yaylağını gəz, xəbər gətir.

Bu elin dərdini dağlara söylə,
Qoy yaysın aləmə tütəklə, neylə.
Son şeirimi bir qayada həkk eylə,
Qılıncdan itidir söz, xəbər gətir.

Buzlu bulaq heç boynunu bururmu?
Dövrəsində el aşiyan qururmu?
Babaların məzar daşı dururmu?
Qalıb yollarında göz, xəbər gətir.

## SAXLAR

Maral buynuzunda, quş qanadında,
Ahu gözəlliyi gözündə saxlar.
Pələng dişlərində, şir biləyində,
Kərgədan gücünü dizində saxlar.

Hanı cəh-cəh vuran bülbül səsində?
Oxuya, can verə gül həvəsində.
Təbiət qartalı dağ zirvəsində,
Gözəllər həyanı üzündə saxlar.

Ömür qatarını kimsə əyləməz,
Cavanmı, qocamı, hörmət eyləməz.
Vurdum, yıxdım, asdım, kəsdim söyləməz,
İgid dəyanəti sözündə saxlar.

Koramal sürünər, zirvəyə qonmaz,
Höyüş tüstülənər, od alıb yanmaz.
Günəşdən pay ummaz, Aydan pay ummaz,
Ocaq hərarəti közündə saxlar.

Elə  vurulubdur torpağa, daşa,
Nə yaza həsrətdir, nə qarlı qışa.
Sevinci bəxş eylər dosta-tanışa,
Alqayıt kədəri özündə saxlar.



## MƏMMƏD ƏLƏSGƏROV
*(1950)*

***Məmməd Ələsgərov əslən Göyçə mahalındandır. Sənət aləmndə Əkbər Cəfərov, Ədalət Nəsibov və Mahmud Məmmədovdan bəhrələnib. Bədii yaradıcılıqla da məşğul olur. Tovuz rayonunun Bozalqanlı kəndində yaşayır.***

### OLMASA

Ruzimizi Allah verir, mərdimazar olmasa,
Adəm oğlu bəndə düşməz, gər tamahkar olmasa.
Şər işlərdən kənar gəzsən, peşmançılıq çəkməzsən,
Dosta arxa çevirərsən, quyu qazar olmasa.

Yer üzündə bəla gəzir, bilmirəm bu nə səsdi,
İnsanların bu dünyada yaşaması həvəsdi.
Qan içənə deyəmmirsən, tökdüyün qan ta bəsdi,
Hər bir adam yüz yaşayar, azar-bezar olmasa.

Tamahkar özün düşünür, qayğı yoxdu cahanda,
El qayğına qalanlarsa, kənarlanır bir anda.
Məmməd, haqlı danışana yer də yoxdu məkanda,
Düz insan yerin tapammaz, haqlı bazar olmasa.

### GƏRƏK

Özünə aşıq deyənin,
Ağılı başında gərək.
Ustada qulluq eyləyə,
Lap cavan yaşında gərək.

Bir yar sevə, boyu bəstə,
Etməyə aşiqi xəstə.
Xalları yerbəyer üstə,
Üzündə, qaşında gərək.

Aşıq Məmməd, dost var olsun,
Qaynasın, peymanın dolsun.
İlahi özü yar olsun,
Kişinin işində gərək.

## DÜNYADA

Adam var, cavankən qanan sayılır,
Adam var, qocalar nadan, dünyada.
Dolanar həftələr, dolanar aylar,
Arzular kəm qalar nədən dünyada.

Gəl Haqqın yolunda olma bədgüman,
Vaxt gələr, əməyin itirməz zaman.
Yaxşıya yaxşı de, yamana yaman,
Nə unut hörməti, nə dan dünyada.

Ay Məhəmməd, əli qana batanlar,
Halal ruzulara, haram qatanlar,
Torpağı satanlar, xalqı satanlar,
Nə çəltik əkdirməz, nə dən dünyada.

## LOVĞALANMASIN

Hər yetən özünə aşığam deyib,
Arif məclisində lovğalanmasın.
Dar gündə gizlənib, gen gündə çıxan,
Dərya mənəm deyib, çalxalanmasın.

Qartala ov gəlməz, qanad çalmasa,
Günəş də sevilməz, zülmət olmasa.
Ağac bar gətirib, meyvə verməsə,
Göylərə baş çəkib, havalanmasın.

Damarlarımızda halal qan axsın,
Qeyrətli övladlar yuxarı çıxsın.
Üçrəngli bayrağımız havaya qalxsın,
Xainlər əlində dalğalanmasın.

Məmmədi anlayar qanan insanlar,
Dost yolunda olar hər çətin anlar.
Dost tutub saxlamaq bacarmayanlar,
Yalandan dost deyib, arxalanmasın.

## ƏZİZİM

Rəhm eyləyib qucaq açdıq, bilmədik,
Mənfur düşmən yuva salıb, əzizim.
Arxa durmaq kafərlərə, qəddara,
Çar dövründən miras qalıb, əzizim.

Mərd oğlumuz hər bir vaxtı çox olub,
Düz sözləri düşmənlərə ox olub.
İmperiyanın pənçəsində yox olub,
Sürgünlərdə fikrə dalıb, əzizim.

Ermənilər vəzifələr tutdular,
Bir yandan da içimizdən satdılar.
Qız verdilər, genimizi qatdılar,
Bizi onda ələ alıb, əzizim.

Kişi olan vicdanını atarmı,
Vara, pula torpağını satarmı?!
Xalqın mayasına haram qatarmı,
De, bizlərə bəs nə olub, əzizim?!

Qurban olum payızına, yazına,
Siz qayıdın bu millətin sazına.
Aldanmayın əcnəbilər cazına,
Dastanımız tamam solub, əzizim.

Qara zurna uca gələn səsimdi,
Bir məclisə təkcə sazım bəsimdi.
Yad nəfəslər əzəl gündən nəsimdi,
Hər havanı tarım çalıb, əzizim.

Aşıq Məmməd, belə getməz bu dövran,
Tapılar yaxşını hər yamandan ayıran.
Nə qədər imkan var, tarixi öyrən,
Dünya çox boşalıb, dolub, əzizim.

## GEDƏR

Dolandı yay, payız, gəldi zimistan,
Dağların başını qar alar gedər.
Dost hayına yetər, düşmən vayına,
Müxənnət izini qaralar gedər.

Çoxları can atır, çıxır o taxta,
Kimini ehtiyac sıxır otaqda.
Kimi kefdən-kefə baxır otaqda,
Kimi səhralarda qaralar gedər.

Kimi qalmaqalda a, səri qaldı,
Məmməd, dahilərin əsəri qaldı.
Düşmən viran qoydu, əsəri qaldı?
Yerində kol-koslar qaralar gedər.



## ƏLƏDDİN GÖYÇƏLİ
*(1954)*

***Ələddin Musa oğlu Süleymanov 1954-cü il Göyçə mahalının Sarıyaqub kəndində anadan olub. Onun atası da Göyçənin tanınmış aşıqlarından olub. Atasının, eləcə də mühitin digər aşıqlarının təsiri Ələddinin sənətə marağını gücləndirib və sazda çalıb-oxumağa başlayıb. Ustadların repertuarında daha geniş yer alan havaları və dastanları yüksək həvəslə mənimsəyib. Yaradıcı aşıqdır. Aşıq şeirinin müxtəlif şəkillərində poetik nümunələr yaradıb. Beynəlxalq Aşıqlar Festivallarının laureatı olub, aşıqların V və VI Qrultaylarında iştirak edib.***

### GÖZLƏYİR

Gəl deyim, dağlar lalası,
O dağlar bizi gözləyir.
Elimin gözəl balası,
O dağlar bizi gözləyir.

Dur qoşa qaçaq dağlara,
Quş olaq, uçaq dağlara,
Dərdimiz açaq dağlara,
O dağlar bizi gözləyir.

Musaoğlu, eşit belə,
Gəl aldanma fitnə, felə,
Yola düşək eldən, elə,
O dağlar bizi gözləyir.

### ƏYMƏRƏM DƏ

Nadanlara qamətimi
Əyməmişəm, əymərəm də.
Ariflərin heç xətrinə
Dəyməmişəm, dəymərəm də.

Dolanmışam eldən-elə,
Səs vermişəm hər bülbülə,
Dələduza, fitnə-felə,
Uymamışam, uymaram da.

Eşq oduna alışanı,
Kərəm kimi yanan hanı?
Yekə-yekə danışanı,
Saymamışam, saymaram da.

Anaların laylasından,
İlahinin sədasından,
Telli sazın avazından,
Doymamışam, doymaram da.

Musaoğlu, mənzil hara?
Olacağa yoxdur çara.
Saf qəlbimi biilqara,
Qoymamışam, qoymaram da.

## İNCİMƏ, DAĞLAR, İNCİMƏ

Görüşünə gələmmədim,
İncimə, dağlar, incimə.
Gül-çiçəyini dərəmmədim,
İncimə, dağlar, incimə.

Düşmənlər kəsib aranı,
Seçmədik ağı, qaranı.
Birgə almışıq yaranı,
İncimə, dağlar, incimə.

Ələddinəm, qəmdi yüküm,
Fələk verib, gərək çəkim.
Yoxdu loğman, yoxdu həkim,
İncimə, dağlar, incimə.

## SARIYAQUB[1]

Sarıyaqubu məndən xəbər alan dost,
Göyçəmizin bir kəndidir Sarıyaqub.
Göyçək olub, əzəl adı mahalın,
O, mahalın pir kəndidir Sarıyaqub.

Miskin Abdal məktəb açıb o kənddə,
Günəş olub, şəfəq saçıb o kənddə,
Hatəm kimi süfrə açıb o kənddə,
Babaların qeyrətidir Sarıyaqub.

Xəlvir təpəsi var, Şirvi dağı var,
Laləli, nərgizli bağça-bağı var,
Gecələr sönməyən şam-çırağı var,
Başdan-başa möcüzədir Sarıyaqub.

Keyti dağı olub kəndin yaylağı,
Bir yanı Tərsədi, igid oylağı,
Pendiri, süzməsi, şoru, qaymağı,
Nənələrin ismətidir Sarıyaqub.

Gözəl mənzərəsi olub o kəndin,
Elsiz gül-çiçəyi solub o kəndin,
Gözləri yollarda qalıb o kəndin,
Musaoğlunun hörmətidir Sarıyaqub.

***1. Göyçə mahalının kəndlərindən olan Sarıyaqub kəndi, Miskin Abdalın yaşadığı, aşıq Ələddinin doğulub, boya-başa çatdığı kənddir.***

## YADIMA DÜŞDÜ

Ariflər, aqillər sual eylədi,
Atam nəsihəti yadıma düşdü.
Dastan danışması, nağıl deməsi,
Şirin söz-söhbəti yadıma düşdü.

Möcüzə deyərdi Misgin Abdaldan,
Alı, Ələsgərdən, Aşıq Musadan,
Ustad Abdulladan, Növrəs İmandan,
Ustada hörməti yadıma düşdü.

Övlada mehriban, xalqına yanan,
Həyatdan tez getdi, dəyişdi zaman.
Aşıq Ələddinə xatirə qalan,
Hatəm səxavəti yadıma düşdü.

## DANIŞAQ

Ay telli saz, gəl bir yerdə dərdləşək,
Qurbanidən, Ələsgərdən danışaq.
Dədəmiz Qoqudu yad edək bir an,
Söz-söhbəti ləl-gövhərdən danışaq.

Necoldu Ələsgər, necoldu Alı,
Cətin ki, yetirə Göycə mahalı,
Səsləyək babamız Misgin Abdalı,
Onda olan möcüzədən danışaq.

Atam Müşkül Musa, adım Ələddin,
Nadana baş əymək çətindir, çətin,
Sərraf gərək versin sözün qiymətin,
Könülaçan xoş söhbətdən danışaq.

## ŞİRİN-ŞİRİN

Ala gözlüm, ağlım başımdan aldın,
Boylanır yanaqdan xal şirin-şirin,
Zənbur olub, ağ sinəyə qonaydım,
Süzülə dodaqdan bal şirin-şirin.

Ay dağlar lalası, göllər sonası,
Geyibsən əyninə bayram libası,
İnsaf eylə, ay zalımın balası,
Bu sınıq könlümü al şırin-şirin.

Ay insafsız, gəl yaxına, amandı,
Ələddin də qəm-qüssədən talandı,
Ömür qısa, zaman gözəl zamandır,
İstəsən, yanımda qal şirin-şirin.

## SAZDAN AYRI

Saz mənim ürəyim, saz mənim canım,
Yaşaya bilmərəm mən sazdan ayrı.
Keçmişim, bu günüm, həm də sabahım,
Yaşaya bilmərəm mən sazdan ayrı.

Yolda yoldaşımdı, evdə qardaşım,
Hər an dərdləşirik, olub sirdaşım.
Gecə də, gündüz də axar gözyaşım,
Yaşaya bilmərəm mən sazdan ayrı.

Dədəmiz Qorquddan yadigar qalıb,
Tanrı dərgahına qalxıb, ucalıb.
Çətin döyüşlərdə zəfərlər çalıb,
Yaşaya bilmərəm mən sazdan ayrı.

Musaoğlu istəməz cahi-cəlalı,
Dünyada qalacaq dünyanın malı.
Mən sazda duymuşam babam Abdalı,
Yaşaya bilmərəm mən sazdan ayrı.

## ODLAR YURDUNUN İGİD ƏSGƏRİ

Əl atıb süngüyə girdi meydana,
Bu odlar yurdunun igid əsgəri.
Düşmən yuvasını boyadı qana,
Bu Odlar yurdunun igid əsgəri.
Şahinlər şığıyıb səmaya qalxdı,
Düşmənin başına şimşəklər çaxdı.
Od vurdu, köz qoydu, yandırıb-yaxdı,
Bu Odlar yurdunun igid əsgəri.

Aslanlar əlində tülkülər neylər,
Yırtar yaxasını, yalanlar söylər.
Qatar qabağına, it kimi teylər,
Bu Odlar yurdunun igid əsgəri.

Bəzən şirə dönər, aslana dönər,
Bir gözəgörünməz tufana dönər,
Koroğluya dönər, Babəkə dönər,
Bu Odlar yurdunun igid əsgəri.

Çağla Musaoğlu, novbahar olsun,
Vətən çiçəklənsin, laləzar olsun.
Ali Baş Komandan öndə var olsun,
Bu Odlar yurdunun igid əsgəri.

## ÇAŞMIŞAM

Nələr gəldi, gör bəlalı başıma,
Olan yox dərdimdən halı, çaşmışam.
Zəhər damdı şərbətimə, aşıma,
İtirib obanı, eli, çaşmışam.

Sayili borcdan qurtaran, ahunu dardan,
Yunisi dəryadan, Xəlili nardan,
Min ismin sahibi, baxma kənardan,
İtirib cığırı, yolu, çaşmışam.

İbnim Miskin Musa, ismim Ələddin,
Ağırdır vəziyyətim, işimdir çətin.
Aləmə bəllidir, qəzəb-qeyrətin,
Yet dadıma, ağam Əli, çaşmışam.

## ATADIR, ATA

Eşidin obalar, eşidin ellər,
Ailənin kompası atadır, ata.
Dizlərə taqətdir, qollara qüvvət,
Gözlərin qarası atadır, ata.

Köhlən çapıb, dağdan-dağa atlanan,
Övlad üçün əziyyətə qatlanan,
Xoş günündə şadlıq edən, şadlanan,
Hər dərdin çarəsi atadır, ata.

O, iki gözümdür, vuran ürəyim,
Dar gündə köməyim, hər an gərəyim,
Ələddinəm, unum, urvam, çörəyim,
Balamın babası atadır, ata.

## NURİDDİN İSGƏNDƏROV
*(1956-2017)*

***Nuriddin Abid oğlu İsgəndərov 1956-cı il noyabrın 20-də Göyçə mahalının Daşkənd kəndində anadan olub. İlk təhsilini Daşkənd kənd orta məktəbində alıb, hərbi xidməti başa vurduqdan sonra təhsilini Moskva Kooperasiya İnstitutunda davam etdirib.***

***Hələ erkən yaşlarından aşıqlıq sənətinə meyil göstərib, gənc yaşlarından aşıq Hacı Bayramovla həm Göyçə mahalının, həm də Azərbaycanın ayrı-ayrı bölgələrinin el məclislərində iştirak etməyə başlayıb, tez bir zamanda elin-obanın rəğbətini qazanıb.***

***Aşıq Nuriddin 2017-ci il dekabrın 22-də Şəmkir şəhərində vəfat edib.***

### EYLƏMƏ

Gecə-gündüz bayquş kimi ulamağa meyl eyləmə,
Yemək ilə doymadınsa, yalamağa meyl eyləmə.
Yaltaqlanıb ona-buna boyun əymə, yalmanma,
Orda-buda quyruğunu bulamağa meyl eyləmə.

Yaltaqlıqdan kənar dolan, hünər göstər, qeyrət elə,
Yaxşılığı özün üçün bir tükənməz sərvət elə.
Adam kimi doğulmusan, adamlığa hörmət elə,
Namərd olub, qan meydanı bulamağa meyl eyləmə.

Açıq gözlə həyata bax, dur seyr elə çöl-çəməni,
Dünya varı gəldi-gedər, aldatmasın əsla səni.
Hatəm kəslər süfrə açar, yarı bölər bir tikəni,
Haram varla gün keçirib, dolanmağa meyl eyləmə.

Gədadan da bəy olarmı, hey aşsa da varı başdan,
Gözünü şöhrət bağlayar, xəbər tutmaz bu təlaşdan.
Nuriddini məcbur edib, aralama yar-yoldaşdan.
Sör-söyüdü xan çinara calamağa meyl eyləmə.

## DÜŞƏRSƏN

Yaxın dosta fənd işlətmə, özün felə düşərsən,
El dalınca heç danışma, eldən-elə düşərsən.
Yaxşı yaşa, el dalınca həsrət çəksin qoy sənin,
Yaman olsan, yada düşməz aya, ilə düşərsən.

Həyat sənə bəxş olunub, zərif anla, zər düşün,
Alçalan kim, ucalan kim, boş taxtları bir düşün.
Sadiq dostun qoy bir olsun, dərdinizi bölüşün,
Hər yetənə sirr verərsən, yaman dilə düşərsən.

Hey ağlayar, göz qurumaz, zəhər bala düşəndə,
Parçalayıb eyni ürək sağa, sola düşəndə,
Köç qatarın hazır olub, karvan yola düşəndə,
Axtarmaqla, ay Nuriddin, hardan ələ düşərsən?!

## KÜSƏR

İl qədrini bilməyən dost,
Bir anlığa məndən küsər.
İbadəti sevməyən dost,
Hədər yerə dindən küsər.

Kin-küdrətdən qurub qala,
Hasar çəkmə sağa, sola.
Qismət olanda çaqqala,
Çil toyuq da hindən küsər.

Namərd səni dara salar,
Ürəyinə qara salar...
Zülmət sevən yarasalar,
Kölgədən yox, gündən küsər.

Vədəsində düşən yarpaq,
Son günündən verər soraq.
Xaric güllər vuran barmaq,
Sazdan küsər, simdən küsər.

Çox olubdur qanan dostun,
Yaxşı dostun, yaman dostun,
Ay Nuriddin, uman dostun,
Səndən də yox, kimdən küsər?!

## GÜL YARIM

Dəm dəmi gətirər, qəm də ki, qəmi,
Çox ağlama, barı bir yol gül, yarım.
Gözlərinin şəfqətini aparar,
Gözyaşını gözlərindən sil, yarım.

Adını çəkəndə dilim sevinər,
Əlinə dəyəndə əlim sevinər,
Sən bizə gələndə elim sevinər,
Qoyma bizi intizarda, gəl, yarım.

Necə deyim, bir baxışdan duyanam,
Gözlərindən ürəyini duyanam.
Çətin işdir, mən bu dərdə dayanam,
Bir təbibsən, əhvalımı sor, yarım.

Yadındamı, könül verdin bir bahar,
Özün dedin, gəl eyləmə ahu-zar.
Nuriddini bir də qoyma intizar,
Bəs deyilmi gözlədiyim il, yarım?!

## VAR

Eşq oduna alovlanan, canı oda yaxdı var,
Haqq aşiqi bu dünayda həqiqətdi, haqdı, var.
Biri çıxar, biri düşər bir qanundur əzəldən,
Bel bağlama bu dünyaya, bir ötəri taxtı var.

Bu gəlişin, ey nazənin, necə düşdü yerinə,
Dəli könül pərvaz edib, çıxdı dağlar seyrinə.
Adam var ki, bu dünyada qoyulmazmış yerinə,
Qızıl deyil, gümüş deyil, qızıldanca baxtı var.

Nuriddinəm, necə dözüm belə ahu-fəryada,
Bəxtin gülə, xoş gələsən həm qohuma, həm yada.
Təmiz dolan, təmiz adın qoy yaşasın dünyada,
Pis əməllər açılacaq, o ki başa qalxdı var.



## BƏHMƏN GÖYÇƏLİ
*(1960)*

***Bəhmən İsə oğlu Kazımov (Bəhmən Göycəli) 1960-cı ildə Göyçə mahalının Ardanış kəndində anadan olub. Aşıq ailəsində dünyaya göz açıb, sənətin sirlərinə də elə erkən yaşlarından ailədə yiyələnməyə başlayıb. Marağı, musiqi duyumu, səs diapazonu, yaddaşı onun sənətkar kimi yetişməsində müstəsna rol oynayıb. Aşıqlıq sənətini atası Aşıq İsədən öyrənib. Sonradan Aşıq Murad Niyazlı və Aşıq Hacı Bayramovla uzun illər yoldaşlıq edib, məclislərdə püxtələşib.***

***Azərbaycan Dövlət Pedaqoji İnstitutunu bitirib.***

***Aşıq şeirinin müxtəlif şəkillərində yaratdığı gəraylı, qoşma, təcnis və s. poetik nümunələri var. Şeirlərində Göyçə həsrəti, yurd-yuva acıları, ermənilərin törətdiyi qanlı hadisələr müxtəlif səviyyələrdə özünün ifadəsini tapır.***

***Azərbaycan aşıqlarının IV, V və VI Qurultaylarının iştirakçısı olub. Azərbaycan Aşıqlar Birliyi idarə heyətinin üzvüdür, "Əməkdar mədəniyyət işçisi" fəxri adına layiq görülüb.***

### İSTƏYİR

Kəhər at belində, Göyçə elində,
Gəzdiyim yerləri könlüm istəyir.
Dağların döşündən nərgiz, bənövşə,
Dərdiyim gülləri könlüm istəyir.

Nazlı bulağında məçlis qurduğum,
Dumana, çisginə vurğun olduğum,
Gözəllər eşqinə nəğmə qoşduğum,
Ayları, illəri könlüm istəyir.

A Bəhmən, Göyçədə hər nemət vardı,
Güneyləri xalı, zirvəsi qardı.
Mən ölüb getsəm də, bir sözüm qaldı,
O doğma elləri könlüm istəyir.

## DÜŞMÜŞƏM

Həyat nərddi, mən o nərdin zəriyəm,
Atılanda sözlə qoşa düşmüşəm.
Aylar, illər dolandıqca ömürdə,
Mən bu yolda bərkə-boşa düşmüşəm.

Gah büdrədim, gah yıxıldım, gah durdum,
Çeşmə kimi axa-axa duruldum.
Fəsillərin baharına vuruldum,
Dönüb gördüm, qarlı qışa düşmüşəm.

Mən Bəhmənəm, bir zamanlar gənç idim,
Arzulara çatammadım, ləngidim.
Çox səhvləri anlayanda ah dedim,
Ahıl olub, indi başa düşmüşəm.

## GƏL, ÇƏKİM

Gedən gözəl, ayaq saxla, sözüm var,
Dalğalanan zülflərinə əl çəkim.
Gümüş kəmər incə beli inçidir,
İzin versən, kəmərini gəl, cəkim.

Sinən üstə eşq odunu qalayım,
Qollarımı incə belə dolayım,
Yanağını şərbət kimi yalayım,
Zənbur olum, dodağından bal çəkim.

Bəhmən deyər, bülbül olum, gül gəzim,
Məçnun olum, səhra gəzim çöl gəzim,
Qarış-qarış oba, gəzim el gəzim,
Həsrətini hər ay çəkim, il çəkim.

## İMRAN XƏLİLOV
*(1965)*

***İmran Həsən oğlu Xəlilov 1965-ci il fevralın 25-də Qərbi Azərbaycanda – Göyçə mahalının Ardanış kəndində anadan olub. 1982-ci ildə həmin kənddə orta məktəbi bitirib. 1983-1985-ci illərdə hərbi xidmətdə olub. 1986-cı ildə M.F.Axundov adına Azərbaycan Pedaqoji Rus dili və Ədəbiyyatı institutuna (indiki Bakı Slavyan Universiteti) daxil olub, 1990-cı ildə ali təhsilini fərqlənmə diplomu ilə başa vurub. 1991-1994-cü illərdə Bakı şəhərindəki 35 saylı tam orta məktəbdə rus dili və ədəbiyyatını tədris edib, sonra müxtəlif vəzifələrdə çalışıb.***

***Yeniyetmə yaşlarından sənətə həvəs göstərib. Göyçə aşıq mühiti ənənələrini layiqincə yaşadan İmran Xəlilov Azərbaycan Aşılar Birliyinin üzvüdür. Bədii yaradıcılıqla da məşğul olur.***

### SƏNNƏN

Könül, gərək bu dünyada,
Bir nəsihət qala səndən.
Kim layiqsə ustad ada,
El sazını çala sənnən.

Hər yetənə demə qardaş,
Dayanmamış dəm üstə aş.
Arsız aşıq, satqın yoldaş,
Çətin gedər yola sənnən.

İmran, qəlbi üzməyəsən,
Şirin candan bezməyəsən,
Sən yığvalı gəzməyəsən,
Yığval özü ola sənnən.

## XANLAR XƏLİLOV
*(1967)*

***Xəlilov Xanlar Bayram oğlu 1967-ci ildə Göyçə mahalının Daşkənd kəndində dünyaya gəlib. Ustadı böyük qardaşı aşıq-şair Alqayıt Xəlilov olub. Göyçə aşıqlarına məxsus saz-söz repertuarını məharətlə qoruyub ifa etməkdədir.***

### MƏNİ

Aşıq qardaş, bu nə hava,
Telə öyrətmisən məni.
Koroğlu tək hay-haraylı,
Zilə öyrətmisən məni.

Aşıq elin balasıdı,
Bəzək dağın lalasıdı,
Uçan gölün sonasıdı,
Gölə öyrətmisən məni.

Xanlara söylə sözünü,
Sən, çalış, öymə özünü.
Danışanda de sözünü,
Belə öyrətmisən məni.

### OLMAYAYDI

İnsan oğlu müqəddəsdir, əzizdir,
Əqldən yarımçıq kaş olmayaydı.
Ən uca qamətdə, şux bir vüqarda,
Nə ola, qiymətsiz baş olmayaydı.

Yoxdu bünövrədən nə tabım, dözüm,
Mərdlər meydanında deyilir sözüm.
Bir qəmli görəndə qan ağlar gözüm,
Ürəklər heç zaman daş olmayaydı.

Bülbülə həmişə nəğmə oxudan,
Onu eyləyibdi şirin yuxudan.
Xanlar deyər, qəlbə çələng toxudan,
O gözlərin bəxti qış olmayaydı.

## LƏTİF NAMAZOV
*(1974)*

***Lətif Kamil oğlu Namazov 1974-cü ildə Qərbi Azərbaycanda – Basarkeçər rayonunun Pəmbək kəndində anadan olub. Kiçik yaşlarından sazın-sözün vurğunu olub, şeir yazmağa başlayıb. 1988-ci ildə Qərbi Azərbaycandan soydaşlarımızın sonuncu deportasiyası zamanı 14 yaşında ikən doğma yurdundan ayrılmaq məcburiyyətində qalıb. Əvvəlcə Gəncənin yaxınlığındakı Qovlarsarı kəndində məskunlaşıb və burada Aşıq Ənvərdən sənətin sirlərini öyrənib. 1990-cı ildə Abşeron rayonunun Pirəküşkül qəsəbəsinə köçüb və beş il Aşıq Rzaya, daha bir il isə ustad sənətkar Ədalət Nəsibova qulluq edərək aşıq sənətinin sirlərinə daha mükəmməl yiyələnib.***

### GÖYÇƏ

Bağlı qalan yollarına
Təzə izlə gəlim, Göyçə.
Bir qolunu qollarıma
Uzat, çatsın əlim, Göyçə.

Çığırları yordum deyə,
Hər yolçudan sordum deyə,
Göyçə adlı yurdum deyə,
Tez-tez deyir dilim, Göyçə.

Canı qızmır dağlarının,
Dağlarının karvanının,
Karvanının, sarvanının
Söylə, dərdin bilim, Göyçə.

Bir gəzəydim düzlərini,
Eşidəydim sözlərini,
Yaşla dolan gözlərini,
Əllərimlə silim, Göyçə.

Bağladığım gümanımı,
Yaşadığım ünvanımı,
Səndə qalan ilhamımı,
İndi hardan alım, Göyçə.

Sevanmı, Göyçə gölünü,
Göyçənin göyçək gülünü,
Sazımın sınan telini
Necə sıxım, çalım, Göyçə.

İzim qalan torpağında,
İsti yanan ocağında,
İzin versən, qucağında,
Qonaq kimi qalım, Göyçə.

Öpüm solğun yanağından,
Bar bağlayan dodağından,
Lətif üçün torpağından,
Saxla, gəlim, ölüm, Göyçə.

## GƏTİR

Durna, bizim eldən keçib gələndə,
Ana Vətənimnən bir xəbər gətir.
Öpmədim torpağını köçüb gələndə,
Öpüb torpağından, bir qədər gətir.

Dolan bir başına Ana Vətənin,
Baş çək oylağına ulu dədəmin,
Qalıb kəlağayı qoca nənəmin,
Solar, o yerlərdə çürüyər, gətir.

Ustad Alı, Ələsgərim ordadı,
Söz xəzinəm, neçə sirrim ordadı.
Biçarə Lətifin qəlbi dardadı,
Sirrimi düşmənlər götürər, gətir.

## SALAMAT QAL, SALAMAT

Atam dağlar, ayrılıram qoynundan,
Anam Vətən, salamat qal, salamat.
Baş açmadan kafirlərin oynundan,
Anam Vətən, salamat qal, salamat.

Göyçə yurdum, göyçək yurdum, göl yurdum,
Qaçqın düşür Göyçə adlı el, yurdum.
Bu hicranla necə edim, əl yurdum,
Anam Vətən, salamat qal, salamat.

Yada qalır Misgin Abdal Türk eli,
İçimizdən dağıtdılar, bərk eli.
Ayaq getmir, ürək etmir tərk eli
Anam Vətən, salamat qal, salamat.

Ağrı dağım, Şivri dağım, Şahdağım,
Ərşə qalxıb yüzminlərlə ah dağım,
Qır belimi, Lətif çəksin, ah, dağım,
Anam Vətən, salamat qal, salamat.

## DOLANIM, GƏLİM

Yönü doğma elə gedən durnalar,
Məni də aparın, dolanım, gəlim.
Yuxarıdan buraxın Göyçə gölünə,
O şəffaf suyunda sulanım, gəlim.

Doyunca seyr edim doğma diyarı,
Ordan qalxım düz evimizə sarı.
Nənəmin evində sönən buxarı,
Yandırım, közünə qalanım, gəlim.

Ordan qalxım o duzdağın başına,
Baxım cərgə-cərgə gözəl daşına.
Deyim ki, gəlmişəm on üç yaşına,
Əyilim, düzündən yolanım, gəlim.

Adlayım oradan Ağ düzə keçim,
Həbli bulağından doyunca içim,
Yanında özümə gözəl yer seçim,
Gözünün yazına bulanım, gəlim.

Şivrinin başında gəzim, yaylanım,
Molla bulağından içim, oylanım.
Xonçalı yurduna durum boylanım,
Köhnə dağ damından yol alım, gəlim.

Qatlanım ikiqat, dözüm zəhmətə,
Dırmanım birbaşa əmr əhmətə.
Döşündə paylaşım saza-söhbətə,
Bir azca dincəlim, əylənim, gəlim.

Aynalı bulaqda gedim yuxuya,
Çiçəkləri yan-yörəndə qoxuya.
O çöllər qızını salım qorxuya,
Durum, bir dalınca teylənim, gəlim.

Çadırlıda bir az çalım-oynayım,
Ağbulaqdan içim, yenə doymayım.
Pirverdi tək mən də çoşum, qaynayım,
Qısırda yurd salım, nöylənim, gəlim.

Həmzənin başından ocağa gedim,
Durum qarşısında ziyarət edim.
Deyim ki, qürbətdə qalmışam yetim,
Lətifəm, dərdimi söylənim, gəlim.

## URFAN GÖYÇƏLİ

***Urfan Elşən oğlu Qurbanov 1993-cü ildə Gəncə şəhərində anadan olub, əslən Qərbi Azərbaycandan – Göyçə mahalının Nərimanlı kəndindəndir. Kiçik yaşlarından aşıq sənətinə maraq göstərib, sənətin sirlərini öyrənməyə başlayıb. Hazırda Göygöl rayonundakı Aşıq Şəmşir adına Uşaq Musiqi məktəbində müəllim kimi fəaliyyət göstərir. Azərbaycan Aşıqlar Birliyinin üzvüdür.***

### AZƏRBAYCAN

O böyük Yaradan bəxş edib sənə,
Bütün gözəllikdən pay, Azərbaycan.
Bu qoca dünyanın heç bir yerində,
Yoxdur torpağına tay, Azərbaycan.

Əzəldən torpağın igid yetirir,
Hər qayan tarixdir, hər bir daşın sir.
Şair ürəyini cuşa gətirir,
Arazın, Kürün tək çay, Azərbaycan.

Elə bil ayrıca bir dünyasan sən,
Urfan ilham alır təbiətindən.
Gözümü açandan bu dünyaya mən,
Olmuşam heyranın, ay Azərbaycan.

### GƏLMİŞƏM

Sevinə-sevinə, bir uşaq kimi,
Bu dağların qucağına gəlmişəm.
Qəlbimdən ataraq həsrəti, qəmi,
Bu dağların qucağına gəlmişəm.

Bir yanım coşqun çay, bir yanım meşə,
Könlüm qalmaq istər burda həmişə.
Xəyallar içində dalıb keçmişə,
Bu dağların qucağına gəlmişəm.

Urfanam, meylimi saldıqca gülə,
Qəlbimin səsini gətirdim dilə.
Sazımla, sözümlə verib əl-ələ,
Bu dağların qucağına gəlmişəm.

## FƏTULLA

Sənət dünyasında, saz aləmində,
Bir nəhəng zirvədi, dağdı Fətulla.
Oxuyanda güllər açır elə bil,
Ətirli baxçadı, bağdı Fətulla.

Talenin yükündən donan qəlblərə,
Qəm-kədər əlindən sınan qəlblərə,
Vətən həsrətiylə yanan qəlblərə,
Narın yağış kimi yağdı Fətulla.

Eşitdim "Cəngi"də hay-harayını,
Urfanam, görmədim onun tayını.
Elə yaşayır ki, ömür payını,
Alnıaçıq, üzüağdı Fətulla.

## AMANDI

Əgər səndə insaf varsa, gözəlim,
Məni tənha qoyub getmə, amandı.
Könlün istəmirsə bükülsün belim,
Məni tənha qoyub getmə, amandı.

Gəl, qəmi, kədəri unudaq daha,
Bir də qul olmayaq amana, aha.
Səni and verirəm o bir Allaha,
Məni tənha qoyub getmə, amandı.

Urfanam, Tanrıdan payımsan mənim,
Nurlu Günəşimsən, Ayımsan mənim.
Ay dərdimi, həsrətimi bilənim,
Məni tənha qoyub getmə, amandı.

## GƏLİBDİ

Bəzənib-düzənib yenə, ay Allah,
Bu qız məni öldürməyə gəlibdi.
Baxmadan insafa, dinə, ay Allah,
Bu qız məni öldürməyə gəlibdi.

Od vurdu qəlbimə özü qəsd ilə,
Vuruldum baxışa, o şirin dilə.
Ədalı yerişlə hey gülə-gülə,
Bu qız məni öldürməyə gəlibdi.

Ay Urfan, min dərdə bir yar dərmandı,
Eşqi duymayanın halı yamandı.
Nazlana-nazlana, Allah amandı,
Bu qız məni öldürməyə gəlibdi.

## AY GÖZƏL

Nazlı yerişinlə, şirin dilinlə,
Sən məni dərd-qəmə saldın, ay gözəl.
Can alan baxışla baxanda mənə,
Ağlımı başımdan aldın, ay gözəl.

Ayrılıb gedəndə uzaqlara sən,
Həsrətdən bürüyür məni duman-çən.
Nə zaman baxdımsa gözlərinə mən,
Elə, hey xəyala daldın, ay gözəl.

Urfanam, duyaydın kaş ki dərdimi,
Qəm üstə köklənib könlümün simi.
Hüsnünü ilk anda mən görən kimi,
Qəlbimdə, könlümdə qaldın, ay gözəl.

## QARAQOYUNLU AŞIQLARI

***Qaraqoyunlu mahalı Göyçə mahalına yaxın bir bölgədir. Burada aşıqlıq ənənəsi tarixən o qədər də güclü olmamışdır. Bu bölgəyə məxsus aşıqlar daha çox Göyçə aşıqlıq ənənəsinə bağlı olmuşlar. Bir çox aşıqlar – Aşıq Əsəd, Aşıq Məhəmməd, Aşıq Cahad məhz Göyçə aşıqlarının təsiri altında biçimlənərək sənət aləmində yetkinləşiblər.***

### ƏSƏD RZAYEV
### *(1874-1951)*

***Aşıq Əsəd Əhməd oğlu Rzayev Qərbi Azərbaycanın Qaraqoyunlu mahalında anadan olub. 12 yaşında ikən atasını itirən Əsəd bir neçə il muzdurluq etdikdən sonra dörd il Aşıq Ələsgərin şəyirdi olub, beş il isə onunla birlikdə aşıqlıq edib.***

***1918-ci ildə daşnak ordusunun zabiti Selikovun öldürülməsində suçlandırılıb, qardaşı Məhəmmədlə birlikdə həbs olunaraq Kəvər qalasında saxlanılıb. Musavat özəyinin köməyi ilə həbsxanadan qaçırıldıqdan sonra uzun müddət Tovuz və Qazax bölgəsində yaşayıb, 1932-ci ildən isə Tovuzun Bozalqanlı kəndində məskunlaşıb.***

***1928-ci ildə Azərbaycan aşıqlarının I, 1938-ci ildə isə II Qurultaylarında iştirak edən Aşıq Əsəd 1930-1940-cı illərdə respublika səviyyəsində incəsənətlə bağlı tədbirlərdə həmişə fəallıq göstərib, müsabiqələrin qalibi olub. Göyçə, Tovuz, Qazax və Şəmkirdə bir çox aşıqların yetişməsində böyük rolu olub.***

***Aşıq Əsəd 1936-cı ildə Azərbaycan mədəniyyət xadimlərinin Moskvada qəbulunda və 1938-ci ildə Moskvada keçirilən Azərbaycan ədəbiyyatı və incəsənəti ongünlüyündə fəal iştirak edərək, "Şərəf nişanı" ordeni ilə təltif olunub. O, Azərbaycan Yazıçılar İttifaqının üzvü olan ilk aşıqlardan biridir (1939). V.Xuluflu onun söylədiyi "Koroğlu" dastanının bir neçə qolunu iki dəfə nəşr etdirib (1927 və 1929). 1930-1940-cı illərdə Azərbaycanın ən məşhur Koroğluxan aşığı sayılıb. Zəngin musiqi və söz repertuarına, zil, şaqraq səsə malik olub.***

***Aşıq Əsəd Rzayev 1951-ci ildə vəfat edib.***

## OLMASA
*(divani)*

Ağlı olan çox danışmaz, dərdi hazar olmasa,
Heç kimsənə xəstə yatmaz, canda azar olmasa.
Axtarıram, yoxdu təbib, dərdə dərman eyləyə,
Çox çalışmaq əfsanədi, Haqdan nəzər olmasa.

Dərdi olan, tüccar kimi yüklə, hər yanə gedər,
Söylər dərdin dərdbilməzə, özü əfsanə gedər,
Axırında Məcnun olar, bər-biyabana gedər,
Qan ağlamaz, sızıldamaz, canda azar olmasa.

Dərdi olan yad olmasın ol mövlanın dərindən,
Daima əlin çəkməsin mərd igidlər bərindən[1],
Qəlb əyilsə, bulmaz şəfa, duman getməz sərindən,
Şahi-mərdan, Şiri-Yəzdan dilində car olmasa.

Vaqifin ol gözəllərə vardı tərif-busatı, deyim,
Ələsgər, Xəstə Qasımda vardı etiqadı, deyim,
Şirin deyib qaya çapdı, yazıq Fərhadı deyim,
Kərəm oda yanmaz idi, çeşmi-xumar olmasa.

Aşıq Əsəd xırd eyləsin daim öz mətahını,
Həqiqətin, mərifətin gözlə bəndərgahını.
Doğru, düzgün qeyrətinən saxla dost irahını,
Dost dostundan kənar olmaz, mərdiməzar olmasa.

## KİMDƏN ÖYRƏNDİN

Oğrun-oğrun daldalardan,
Baxmağı kimdən öyrəndin?
Qəfildən könlüm evini,
Yıxmağı kimdən öyrəndin?

***1. Bər//pər - qanad***

Gül xəcildi yanağına,
Bal bələnib dodağına,
Qızıl üzük barmağına,
Taxmağı kimdən öyrəndin.

Mail oldum qələm qaşa,
Sədəf kimi inci dişə,
Əsədin canın atəşə
Yaxmağı kimdən öyrəndin?

## YOL ÜSTÜNDƏ DURAN GÖZƏL

Yol üstündə duran gözəl,
Söylə görüm, haralısan?
Yaranıbsan bir qətrədən,
Hansı yerin maralısan?

Yaradıb Cabbarü-Cəlil,
Bədnəzəri olsun zəlil.
Nə baxırsan məlul-məlul,
Yoxsa, yardan yaralısan?!

Əsəd deyir, intizaram,
Açılmış güllərin dərəm,
Hər gün sənlə seyrə varam,
Heyif, bizdən aralısan.

## BOYLANA-BOYLANA

Cilvələnib kəklik kimi,
Ötür boylana-boylana.
Müjganların sinəm üstə,
Atır boylana-boylana.

Eşqinən çalıram sazı,
Sənsən aşığın murazı,

Bu beymürvət qəmzə-nazı,
Satır boylana-boylana.

Navat deyərlər adına,
Aşiqin salmaz yadına,
Şirin canım eşq oduna,
Qatar boylana-boylana.

Gözüm doymur ala gözdən,
Meylini döndərmə bizdən,
Aşıq Əsəd, önümüzdən,
Ötür boylana-boylana.

## O GÖZƏLDİ, BU GÖZƏL

Nagah yerdən üç gözələ tuş oldum,
Biləmmədim, o gözəldi, bu gözəl.
Camalları bənzər bayram ayına,
Seçən yoxdu, o gözəldi, bu gözəl.

Birisi sultandı, əyləşib taxtda,
Biri kəşt eyləyir kefdə, damaqda.
Birinin gözləri canlar almaqda,
Seçəmmədim, o gözəldi, bu gözəl.

Əsəd girməz hər məclisə, hər toya,
Zəhməti, zilləti getməsin zaya.
Sərraflar yığışıb qiymətin qoya,
Qoy desinlər, o gözəldi, bu gözəl.

## NƏ BİLSİN

Ay üstə, gün üstə söyləyən aşıq,
Türkünü bilməyən, farsı nə bilsin.
Oxumayıb əlif, beydən qanmayan,
Sən verən öyüdü, dərsi nə bilsin.

Özgəsin nə bilər özün bilməyən,
Əyrisin nə bilər düzün bilməyən,
Məclislərdə doğru sözü bilməyən,
İşin avandını, tərsi nə bilsin?!

Sınıq könül cəfasına dözməyən,
Elm oxuyub ərəb, farsı bilməyən,
Gəşd eyləyib, bu dünyanı gəzməyən,
Şamı, Ərzurumu, Qarsı nə bilsin?!

Əsədnən meydanda qoşa düşməyən,
Aşıqlıq elmindən başa düşməyən,
Ustadın əlindən badə içməyən,
Yeri, göyü, ərşi-gürşü nə bilsin?!

## ÜÇ İL, BEŞ İL, ON BEŞ İL
***(Hüseyn Şəmkirliyə nəzirə)***

Yaxşı dostun mən sirrini açmaram,
Assalar da üç il, beş il, on beş il.
Namərd süfrəsində təam yemərəm,
Kəssələr də üç il, beş il, on beş il.

Nəsli əyri olan, özü düz olmaz,
Mərd igidin səxavəti az olmaz,
Bivəfanın əhd-ilqarı saz olmaz,
Yoxlasan da üç il, beş il, on beş il.

Paxır kəsən dəmir polad qat olmaz,
Bədəsildə nə kök, nə də zat olmaz,
Beygir gəlib köhlən kimi at olmaz,
Bəsləsən də üç il, beş il, on beş il.

Ustadların nişanəsiməndədi,
Nəsihəti, dürdanəsi məndədi,

Aşıqlığın kök-binası məndədi,
Saxlayacam üç il, beş il, on beş il.

Əsəd deyir, elə düşsün güzarım,
Az arıyla şirin olsun asalım[1],
Yar gəlsə, azalar dərdim, azarım,
Gözləyəcəm üç il, beş il, on beş il.

## ON İL QULLUQ ETDİM MƏN ƏLƏSGƏRƏ

On il qulluq etdim mən Ələsgərə,
Sidqimi bağladım etiqadına.
Hər nə desə, qəbul etdim sözünü,
Məni də yetirdi Haqq baratına.

On il qulluğunda dayandım, dözdüm,
Dilindən nə çıxdı, sinəmə yazdım.
Qırx beş il dünyanı dolandım, gəzdim,
Bələd oldum yerin yeddi qatına.

Yaxşını götürdüm, yamandan qaçdım,
Oxudum, sinəmin dəftərin açdım,
İyirmi beş yaşında qaynadım, coşdum,
Otuz yaşda mindim eşqin atına.

Eşqin səməndini hər yana çapdım,
Mərd ilə namərdi axtardım, tapdım.
Heç könül yıxmadım, çox könül yapdım,
Göz qoydum dünyanın hər büsatına.

Əsəd deyir, ustada qulp qoyanın,
Pünhanda laf edib özün öyənin,
Ustad sözün öz adına deyənin,
Lənət gəlsin belə əsil-zatına!

---

***1. Asal//əsəl – bal***

## İNDİ

A beymürvət, mən ha səndən ötəri,
Düşmüşəm çöllərə, sayılam indi.
Can çıxar cəsəddən, dur aşkara gəz,
O mah-camalına  mayılam indi.

Dərdli Məcnun kimi, bəlaya tuşam,
Mən sənin dərdindən billah, bihuşam.
Mey ki içməmişəm, niyə sərxoşam?
Əmsəm ləblərindən, ayılam indi.

Gördüm camalını, bu nə həvəsdir?
Ruhum gedib, cismim quru qəfəsdir.
Bu dərdi-möhnətin Əsədə bəsdir,
Öldürürsən öldür, qayılam indi.

## YADIMA DÜŞDÜ

Şanlı məktubunu oxuyanda mən,
Çalmalı dağları yadıma düşdü.
Təndir torpağının alma çiçəyi,
Lilpar bulaqları yadıma düşdü.

Dalı Gödək Güney, qabağı Çatar,
Göyçənin dövləti dağları tutar,
Ömürlər uzadar, mətləbə yetər,
Bu gözəl çağları yadıma düşdü.

Başı Çalmalıdı, ayağı düzlər,
Toyda oynayırmı gəlinlər, qızlar?
Oxuyub-çalırmı sədəfli sazlar,
Gözəl yığnaqları yadıma düşdü.

“Göyçənin qonağa çoxdu hörməti”,
Təzə cavanların var məhəbbəti,

Qayğanaq, qəysəfə, əmliyin əti,
Eyvan otaqları yadıma düşdü.

Əsəd bu fanidən köçüb üqbaya,
Dəli könül yenə qalxar havaya.
Qoçdaşın düzləri, Buxarlı qaya,
Tərlan ovlaqları yadıma düşdü.

**BİRİ NƏ**

Səhər-səhər üç gözələ tuş oldum,
Eyhamınan salam verdim birinə.
Hər üçü də bir-birindən sevməli,
Biri Badam, biri Püstə, biri nə?

Birisi yamşaqlı, birisi şallı,
Birisi ağ sifət, yanaqlar allı.
Üçü də möcüzə, dilləri ballı,
Bir gül tək oxşayır biri-birinə.

Dedim, belə məxluq görməmişəm mən,
Dedilər, anladıq, vuruldun həmən.
Dedim siz üçlüyə deyirəm əhsən,
Əsəd də aşiqdir üçdən birinə.

**GƏLİNCƏ**

Dostum, mənə vədə verdin, gəlmədin,
Çox çəkərəm ahü-zarı, gəlincə.
Xəstə kimi sızıldaram sübhədək,
Yata bilməm gecəyarı gəlincə.

Gözəl gərək sirr saxlaya dərində,
Ağlı, huşu, etibarı sərində.
Məcnun kimi durram vədə yerində,
Gözləyərəm düz ilqarı gəlincə.

Bir namə vermişəm sübhün badına,
Yoxsa, mən düşmərəm onun yadına?
Yanar cismim, atəşinə, oduna,
Çəkər könlüm intizarı, gəlincə.

Ruhum bağlı qalıb siyah telində,
Zənbur bal bağlayıb şirin dilində.
Əsəd deyir, gözüm qalıb yolunda,
Çıxır canım, bizə sarı gəlincə.

## DÜRÜST OLMAMIŞ
***(təcnis)***

Kamil ovçu durub ov bərəsində,
Atmaz xədəngini dürüst olmamış.
Sərraf olan seçər ləli, gövhəri,
Arayıb dəstində dürr üst olmamış.

Əgər qəvvas isən, axtar adamı,
Göydən yerə leysan yağar, a damı.
Dürüst adam gəzər dürüst adamı,
Nadürüst axtarar dürüst olmamış.

Əsəd, bəhri-mühit çaylar toxuna,
Qayıq üzə, ləpə gələ toxuna,
Gürbə[1] istər gölə, şirə toxuna,
Elmi cəm eyləyib dürüst olmamış.

## AYAĞA SALMAZ
***(təcnis)***

Gəzdim, kəşt elədim yaxın-uzağı,
İndi səfərimdi ayağa salmaz.
Könül zənbur kimi dolanır şanı,
Pərvanə cismimi ayağa salmaz.

***1. Gürbə - iri, kök pişik***

Dost gərək ki, yaxşı dostu sinayə,
Alnımıza yazılıbdı sin ayə.
Məhəbbət xəncərin qoysa sinaya,
Dost dostu sındırıb ayağa salmaz.

Bilirsənmi, danışıram nə sarı,
Bəxt əyilsə, rəngi olar nə sarı.
Abad könül, sən nə sındır, nə sarı,
Haqq kəsməz nəzərin, ayağa salmaz.

İstər məni dost yolunda kəs, qala,
Əyri çıxsam, qur divanı, kəs qala.
İstəmərəm müxənnətdən kəs qala,
Mərd igidlər məni ayağa salmaz.

Əsədin bəxtini salma qəzaya,
Mənim məzarımı kimlər qazıya.
İgid ürcah olsa qəhri-qəzaya,
Mərdlərin mövlası ayağa salmaz.

## YA SƏNDƏDİ, YA MƏNDƏ
*(cığalı təcnis)*

Ala gözlüm, dərdə oldum giriftar,
Dərdə dərman ya səndədi, ya məndə.
    Aşıq deyər, ya məndə,
    Bir sevgim var Yəməndə,
    Yaşamasın bədnəzər,
    Heç görməsin yaməndə.
Dedim, məni qoyma qalım yaməndə,
Dedi, təqsir ya səndədi, ya məndə.

Eşq ucundan cünun oldum, ya dəli,
Görən deyər, ya divanə, ya dəli.
    Aşıq deyər, ya dəli,
    Dərd cigərim ya dəli.

Şirin candan keçərəm,
Sənə dəysə yad əli.
Dedim gözəl, sən də tutsan yad əli,
Onda ölüm ya səndədi, ya məndə.

Kim görübdü mənim kimi yananı,
Nə keçirdər eşq oduna yananı.
Aşıq deyər, yananı,
Yandırmazlar yananı,
Mərd olanlar gözləyər,
Ya namusu, ya nanı.
Əsəd kimi ar oduna yananı,
Eşq atəşi ya səndədi, ya məndə.

## GƏLİN
***(müxəmməs)***

Nagah mənə urcah oldun,
ay qaşları qara, gəlin.
Günəş kimi zərrələndin,
şövqün düşdü bazara, gəlin.
Bədnəzərdən pünhan dolan,
gələrsən nəzərə, gəlin.
Çoxu sənə mail oldu,
salarsan azara, gəlin.
Zərrü-ziba geyinmisən,
üstündən bir xara, gəlin.

Üst-üstündən dörd don geyib,
hamısının köbəsi ala.
Gör bir necə cilvələnib,
çinniyib qabağa, dala.
Tər libası, tər əndamı,
mən istərəm daim qala,
Bəşərliyə şəkk elədim,
mən düşdüm özgə xəyala.

Zülflərin adam çalır,
dönübdü şahmara, gəlin.

Birisi növrəstə gəlin,
biri yəqin qızdı, bilin.
Yetmiş iki hava çalır,
teli incə sazdı, bilin.
Göydən gəlmiş məleykədi,
yerdə quba qazdı, bilin.
Qoynu cənnətin bağçası,
həm bahardı, yazdı bilin.
Aşiqinə zülm elədin,
saldın ahu-zara, gəlin.

Bu zülmün qabağında,
mən bilmədim haralıdır.
Geyinib xublar sayağı,
hansı yerin maralıdır.
Qıyğac baxıb, canlar alır,
bildim yardan yaralıdır.
Filankəsi xəbər aldım,
dedi, məndən aralıdır.
Yaram üstən yara vurdun,
oldum para-para, gəlin.

Araz üstdən bu ceyranı,
gətiriblər qova-qova.
Mail olub mina boya,
ərənlər də çıxdı ova.
Mən ki, köhnə kamandaram,
başıma gəlibdi hava.
Badi-səba, sən xəbər ver,
Tovusda Telli Zeynaba.
Əsədin də sinəsinə,
vurubdu min yarə, gəlin.

## XIRDACA QIZ
*(müxəmməs)*

Naz ilə gəldin otağa,
Leyli nişan, xırdaca qız!
Tovus kimi cilvələnib,
artırır şan, xırdaca qız!
Biri hüri, biri pəri,
biri də sən, xırdaca qız!
Gözləri cəllada dönüb,
qəmzəsi qan, xırdaca qız!

Məclisə o əmr eləyib,
aşiqini saz eyləsin.
Davud kimi nəfəs çəkib,
bir də xoş avaz eyləsin.
Bülbül kimi cəh-cəh vurub,
zimistanı yaz eyləsin!
İşvə, qəmzə canım alır,
daha bizə az eyləsin.
Mən ki, sənin aşiqinəm,
eylə güman, xırdaca qız!

Gəzmişəm hər ölkəni,
belə canan görməmişəm.
Boylananda durna sayaq,
qaşı kaman görməmişəm.
El-obada, ay həzərat,
Allah, aman görməmişəm!
Mənim kimi eşq əlindən
oda yanan görməmişəm.
Yaraların məlhəmisən
öldüm aman, xırdaca qız!

Cahıl, ahıl, qarasaqqal,
görüb səni mayil olub.

Didarından ayrı düşən,
ağlı gedib, zail olub,
Sən Leylisən, min bir Məcnun,
çölə düşüb, sail olub.
Hər nə fərmayiş buyursan,
hamı ona qail olub.
Əmirinə baş əyiblər,
buyur fərman, xırdaca qız!

Gəzmişəm, mən görməmişəm,
sənin tək qaşı qəməri.
Belin nazik, gərdən nazik
bağlayıb qızıl kəməri,
Tər-təzəcə ağ koftanın
üstündən geyib məxməri.
Əsəd sənə qurban deyib
bu əziz can ilə səri.
Bir gün ola, güzar düşə,
olaq mehman, xırdaca qız!

## AĞRIN ALIM
***(qoşayarpaq müxəmməs)***

Ay qaraqaş, ay yaşılbaş,
qarşıda süz, ağrın alım.
Ciləvələnib, eşqə bələn,
telini düz, ağrın alım.
Dildə kəlam, əldə qələm,
dərdimi yaz, ağrın alım.
Firqətindən, həsrətindən,
oldum nasaz, ağrın alım.

Boyu bəstə, oldum xəstə,
mən yazığa sən rəhm elə.
Üzü qəmər, müşkü ənbər,
xub yaraşır siyah telə.

Altından al, bir tirmə şal,
dolayıbsan nazik belə.
Bax xanıma, bu canıma,
qəsd eləmə şirin cana.
Gətirim saz, ol xoş avaz,
a Səlbinaz, ağrın alım.

Bir şəhla göz, bir belə qız,
görməmişəm bu dünyada.
Etmir hesab, bu nainsaf,
aşiqini salımr yada.
Salma çölə, insaf elə,
mən xəstəyə versin bada.
Əldə gülü, şirin dili
mən görmüşəm Minayədə.
Keç başa, qıl tamaşa,
mən çalım saz, ağrın alım.

Ay Mələk, qurma kələk,
gözlərini süz, bəri bax.
Mərdanə gəl, bu gərdanə
saçlarını düz, bəri bax.
Bu gün yazım, şeirim düzüm
olaq üzbəüz, bəri bax.
Bu səhər, qoynundu bahar,
açılıbdı yaz, bəri bax.
Daranıb, nə xub yaranıb
belə şahbaz, ağrın alım.

Ay gülüm, sənsən bülbülüm,
cəh-cəh edib, etmə haşa.
Alma yanaq, büllur buxaq,
bal bələnib dilə, dişə.
Sayıl olub, mayıl olub,
hər kim görsə, qələmqaşa.
Bu bazardan, bədnəzərdən

illər boyu uzaq yaşa.
Əsəd deyir, vəsfin yazır
bir belə qız, ağrın alım.

## GÖZLƏ, GÖZLƏ SƏN

Dedim, könül keçmə söz sərhəddini,
Öz sözündən öz-özünü gözlə, sən.
Aşıq deyər, gözlə, sən,
Pirsən, Haqqı gözləsən.
Dünya girsə min dona,
Nə seçərsən gözlə, sən.
Heç adamın tük axtarma gözündə,
Yaxşı olar, qeyrətini gözləsən.

Qopsa tufan, qızsa meydan əylə nər,
Gedən gedir, qalan yerdə əylənər.
Aşıq deyər, əylənər,
Hirsi soyut, əylən, ər.
Acıqlı baş qan eylər,
Ağıllı baş əylənər.
Danalar oynaşar kal qabağında,
Qabaq-qarşı gəlsə, gözlə, gözlə sən.

Sən ucalt sənəti, sənət də səni,
El-oba yaşatsın sənətdə səni.
Mən aşığam, sənətdə,
Ucalasan sənətdə.
Yaşa, yarat, dünyada,
Qoy ucalsın sənət də.
Əsəd də ad qoyub sazda, sənətdə,
Qoru bu sənəti, gözlə, gözlə, sən.

## EYLƏDİN

Can alan, getmə dayan,
Bil, məni candan eylədin.
Təbiətdə bəzək vurub,
Şövkəti şandan eylədin.
Kirpiklərin ox kimidir,
Qaşı kamandan eylədin.
Oxuyurdum qumru kimi,
Məni lisandan eylədin.
Xoşdur lisanın,
Böyükdür sanın,
Yoxdur nöqsanın,
Xoşdur dövranın,
Xalındır qoşa,
Səni yüz yaşa,
Dövran sür başa –
Belə süzüb sallanışla,
İnsanı heyran eylədin.

Mən sənə mail olmuşam,
Getmə dayan, ağrın alım.
Hurisən, məleykəsən,
Eylə bəyan, ağrın alım.
Həsrətindən xəstə düşdüm,
Mən biməkan, ağrın alım.
Həkim, loğman nəyə lazım?
Dərdə dərman, ağrın alım.
Dərman verənsən,
Zülfün görənsən.
Qəsdə girənsən,
Könül hörənsən.
Dövran sürənsən,
Qaşların qara,
Vurmusan yara,
Öldüm səd para,

Gəl eylə çara.
Xallarının yox qiyməti,
Gövhəri-kandan eylədin.

Şəkkə düşüb xof eylədim,
Mən nə deyim belə cana?!
Yeriyəndə şölə salır,
Yanaqları asimana.
Yazıram mən də vəsfini,
Səs yayılsın hər bir yana.
Zənəxdanın gözəlliyi,
Zinət verir gülüstana.
Qızıl düyməli,
Cüt nar məməli.
Tuti nəğməli,
Nəğmənə heyran.
Dərdimə dərman,
Sən eylə fərman.
Fərmana qurban,
Qoynu gülüstan,
Ay gözü məstan.
Məcnun oldum, düşdüm çölə,
Könlümü viran eylədin.



## MƏHƏMMƏD RZAYEV
*(1884-1968)*

***Məhəmməd Əhməd oğlu Rzayev 1884-cü ildə Böyük Qaraqoyunluda anadan olub. Qardaşı Aşıq Əsəd Rzayevə şagirdlik edib.***

***Göyçədə Aşıq Ələsgərin məclislərini dinləyib, Aşıq Nəcəflə toylarda iştirak edib. Aşıq Mikayıl Azaflı, Aşıq Murad Niyazlı, Aşıq Ədalət Nəsibov, Aşıq İbrahim Mövsümov və başqaları onun şagirdləri olmuşlar.***

***1918-ci ildə qaniçən erməni generalı Selikovun qətlində suçlandırılıraq Kəvər qalasına salınıb. 1920-ci ildə Əsədin tanışlarının köməyi ilə həbsxanadan qaçırılıb və taleyini birdəfəlik Azərbaycana – Daşkəsənə, Qaradaşa (Tovuz), Çaylıya (Qazax) və Tovuz şəhərinə bağlayıb.***

***Dövrünün ən mükəmməl biliyə malik aşıqlarından olub.***

***Aşıq Məhəmməd Rzayev 1968-ci ildə Tovuzda vəfat edib.***

### PƏRVƏRDİGAR
*(divani)*

İbtidadan xəlq eylədi, ümmanı Pərvərdigar,
Yeddi qat yer, yeddi qat göy, asimanı Pərvərdigar.
Əzrail torpaq apardı, yoğurdular xəmirin,
Yaratdı saldı dünyaya, insanı Pərvərdigar.

Həmişə səcdə qılıram, yaradıbsan, ya Xuda,
İncili İsa götürdü, Zənbur gəldi Davuda.
Musaya Tövrat yetişdi, Cəbrayıl verdi nida,
Məhəmmədə bəxş eylədi, Quranı Pərvərdigar.

Şəriətdən xəbərdaram, təriqəti bilirəm,
Haqq-ədalət irahını, axtarıram, buluram.
Elmə bələd olub, dərsi acibatdan alıram,
Məhəmmədə qismət eylə imanı, Pəvərdigar.

## BOYLANA-BOYLANA

Dostum bizə qədəm qoyub,
Gəlir boylana-boylana.
Kəklik kimi qaqqıldayıb,
Gülür boylana-boylana.

Səni görən çox insanlar,
Ürəyinə dolur qanlar.
Hər baxışın neçə canlar,
Alır boylana-boylana.

Məhəmmədin gülgər yarı,
Sən gələndə bizə sarı.
Çoxu verir baxtavarı,
Qalır boylana-boylana.

## BİR SƏHƏR GƏL, BİR GÜNORTA

Dostum, sən məni görməyə,
Bir səhər gəl, bir günorta.
Bir şirin salam verməyə,
Bir səhər gəl, bir günorta.

İnsan üçün ölüm haqqdı,
Kim çox yaşar, baxtabaxtdı.
Bir yol şamlar yanan vaxtı,
Bir səhər gəl, bir günorta.

Bir söz danışırdın bayaq,
Həftə nədir, günmü sayaq?!
Məhəmmədlə ilqar qoyaq,
Bir səhər gəl, bir günorta.

## BURDA
***(Kəvər türməsi, 1918-1920-ci illər)***

Gəldim Əsədi görməyə,
Tutdu məni qada burda.
Xudam, mənə rəhmin gəlsin,
Özün yetiş dada burda.

Bir sekret[1] qalaya salır,
Selikovu xəbər alır.
Adamın səbri daralır,
Yandırırlar oda burda.

Bacım ağlar, qardaş deyər,
Yarım ağlar, sirdaş deyər,
Bütün el başabaş deyər,
Məni salar yada burda.

Cavan ömrüm talan oldu,
Ciyərim dolu qan oldu,
Qala mənə vətən oldu,
Necə gen dünyada burda.

Qalada iki qardaşıq,
Eldən-obadan çıxdaşıq.
Məhəmməd elə yaraşıq,
Verirəm ifadə burda.

## AŞİQƏM

Mehmanlar gəldilər, məclis quruldu,
Söz verin danışım, dilə aşiqəm.
Açılmış qönçəyəm dostun bağında,
Şeyda bülbül kimi gülə aşiqəm.

---

***1. sekret - gizli***

Zənbur tək sözlərim bal arasında,
Dərs almışam əhli-hal arasında.
Çox səfa sürmüşəm el arasında,
Köhnə sənətkaram, elə aşiqəm.

Məhəmmədəm, mərifətdən tac aldım,
Sərraf baxdı, qiymətləndim, ucaldım.
Səksən yaşda demərəm ki, qocaldım,
Pəsdən oxumaram, zilə aşiqəm.

## VƏSSALAM

Huri, mələk gördüm Qara Təhlədə,
Başxanım yadımdan çıxdı, vəssalam.
Sultandı, cəlladdı zalımın qızı,
Büsbütün evimi yıxdı, vəssalam.

Daha sağalmaram, dərdlərim çoxdu,
Ədhəm su da verdi, çarəsi yoxdu.
Canımı alanın kirpiyi oxdu,
Başqa silah deyil, oxdu vəssalam.

Bir həkim çağırın, məni yoxlasın,
Qohumlar dərdimdən yara bağlasın.
Ölübdür Məhəmməd, ellər ağlasın,
Desinlər bu gündən yoxdu, vəssalam.

## BAŞINA DÖNDÜYÜM
*(cığalı təcnis)*

Könül qalxıb, ürək dolub, təb gəlib,
Deyim təzə söz, başına döndüyüm.
Bahar gəlib, sığallanır göllərdə,
Üzür ördək, qaz, başına döndüyüm.

Söyün[1] heç vaxt itirməyib zəndini,
Yoxlayıbdır şairliyin fəndini.
Səməd Vurğun minib eşq aməndini,
Gəzir səhra, düz, başına döndüyüm.

Rahim[2] , Osman[3] aşiq olub gözələ,
Qaşlar qara, kirpik müjgan, göz ala.
Könül sevə, elçi düşə, göz ala,
İş düzələr özbaşına döndüyüm.

Cəfər Xəndan mehribandı gül üzə,
Ayna qabaq, büllur buxaq, gül üzə.
Şagirdlərimiz bağ becərə, gül üzə,
Ala mətləb tez, başına döndüyüm.

Məhəmmədəm, könlüm oldu ay aşiq,
Şövqdə yox Əsəd[4] kimi ay aşiq.
Mirzə[5] sevib, olacaqdır ay aşiq,
Yaşı olsa yüz, başına döndüyüm.

## NƏ YAZIM İNDİ

Təbim coşdu, könlüm istər cananı,
Qələm yox, kağız yox, nə yazım indi?
Küskün könlüm müdam çəkir zimistan,
Nə qışım xoş gəldi, nə yazım indi.

Otlu, sulu, səfalıdır bu yurdum,
Leysan yağdı, sel apardı bu yurdum.
Nə gün gördüm, nə oğul, qız buyurdum,
Fələk qara yazdı nə yazım indi.

***1. Aşıq Hüseyn Bozalqanlı***
***2. Şair Məmməd Rahim***
***3. Şair Osman Sarıvəlli***
***4. Aşıq Əsəd Rzayev***
***5. Aşıq Mirzə Bayramov***

Məhəmmədəm, dərdim artıb beş-beş il,
Günüm keçdi, ömür azaldı beş-beş, il.
Dörd kitabdan dərs almışam beş, beş il,
Nə xəttim oxunur, nə yazım indi.

**ÇƏPƏ ÇƏP**
***(cığalı təcnis)***

Aşıq, yarımçıqsan, hələ get öyrən,
Çəp deyirsən ustad sözün, çəp, ə çəp.
    Aşıq deyər, çəpəçəp,
    Çal çəpiyin çəpə-çəp.
    Yaxşı mənnən dost olsun,
    Qoy tuş gəlsin çəpə çəp.
Hərcayı sözləri başım götüməz,
Kim oxusa əlli, yüzün çəpə çəp.

Nabələdlər doğru yolu çəp gedər,
Köhlən atı mənzilinə çəp gedər.
    Aşıq deyər, çəp gedər,
    Axar, gəmi çəp gedər.
    Dost dostundan incisə,
    Kənar keçər, çəp gedər.
Dedim, aşıq, sözüm sənə çəp gedər,
Şövqə gəldi, çaldı sazın çəpə-çəp.

Sən xoryatsan, sözlərindi belə çəp,
Məhəmmədlə gəl danışma belə çəp.
    Aşıq deyər, belə çəp,
    Kəsdin düzü belə, çəp.
    Mənə rast olmayıbdı,
    Sənin kimi belə çəp.
Müxənnətsən, çək qılıncı belə çəp,
Mərd igidsən, söylə düzün çəpə-çəp.

## GÖZƏL-GÖZƏL
*(cığalı təcnis)*

Dedi: aşıq, buyur, mehman ol bizə,
Dedim: mənə qurma al gözəl-gözəl.
Aşıq deyər, al gözəl,
Geyinibsən al, gözəl.
Sən aşkara səfa sür,
Mətləbini al, gözəl.
Dedi: oxu, müştaq olmuşam sözə,
Dedim: müştərisən, al gözəl, gözəl.

Dedi: gir bağçadan lalə dər, indi,
Dedim: mənə göstər, halə, dərindi.
Aşıq, lalə dər indi,
Deyib halə: dər indi,
Təbib qarşı gəlibdi,
Xəstə tapar dər[1] indi.
Dedi: məhəbbətim lal, ə, dərindi,
Dedim: bir canım var, al gözəl-gözəl.

Dedi: küsüb səndən Sara, Məhəmməd,
Dedim: sirrin verməz sara Məhəmməd.
Aşıq sara, Məhəmməd?
Nədir sar, a Məhəmməd?
Sənə ərkinaz eylər,
Dostun Sara, Məhəmməd!
Dedi: sınıq könlüm sarı, a Məhəmməd,
Dedim: bir ərzim var, al gözəl-gözəl.

***1. Tər tapar anlamında işlədilib.***

## OYNASIN
*(müxəmməs)*

Əl vurun, dövrə qurun,
Durub Münəvvər oynasın.
Salam verin, baxın, görün,
Qəddi qələmkar oynasın.
Üzündə xal, yanağı al,
Ləbləri şəkər oynasın.
Qəddi düz, qaməti düz,
Belə bəxtəvər oynasın.
Gəlsin Xırda, lap axırda
Yanında Zivər oynasın.

Usta Əli, çal "Ənzəli",
Bax şabaşa, qıl tamaşa.
Söylə yara, sən dübara,
Az qalıbdı ağlım çaşa.
Sürməni də, vəsməni də
Gör nə yaxıb gözə, qaşa.
Özü gözəl, adı Xəzəl,
Təklif eylə, keçsin başa.
Can alan, işıq salan,
Təzəcə nübar oynasın.

Bülbül ötər, cəh-cəh edər,
Bir bunun baharına bax.
Ağlayar, qara bağlayar,
Gülün ahu-zarına bax.
Ay qabaq, büllur buxaq,
Savalanın qarına bax.
Bu fələk qurur kələk,
Belə kəc rəftarına bax.
A yoldaşlar, insaf olar,
Gül üstündə xar oynasın?

Şuralar verib qərar:
Sevəni sevənə verin.
Mərdə qismət qana afət,
Nadanı nadana verin.
Sərraf duyar, qiymət qoyar,
Gövhərə dürdanə verin.
İnsaf eylə, baxın belə,
O canı bu cana verin.
Yazsın Zaqs[1]: qalxsın o qız,
Alsın ixtiyar, oynasın.

Şuralar, məşhurələr,
Sizə mən əhsən deyirəm.
Qanununa, qərarına
Həli-bədəxşan deyirəm.
Aşıq Əsəddən, Mirzədən,
Utanıb pünhan deyirəm.
Qara, İslam, Məsim olsun,
Boyuna heyran deyirəm.
Qədir, Vəli, Nağı, Qoca,
Aşkara qurban deyirəm.
Məhəmmədi mən əbədi
Gözələ mehman deyirəm.
A yoldaşlar, din şüar,
Bir növcahan yar oynasın.



*1. ZAQS – nigahı qeydə alan idarə*

## CAHAD QARAQOYUNLU
*(1917-2013)*

***Cahad Camal oğlu Nağıyev 1917-ci ildə Böyük Qaraqoyunluda anadan olub. Sənətin sirlərini əvvəlcə Aşıq Əsəddən öyrənib. Sonra Aşıq Nəcəfin yanıda şagird olub və bir sənətkar kimi yetişib.***

***O, İkinci dünya müharibəsində iştirak edib, döyüşlərdə qolundan ağır yaralandıqdan sonra cəbhədən geri qayıdıb.***

***Qərbi Azərbaycandan 1988-ci il deportasiyası zamanı o da Azərbaycana üz tutaraq Şəmkir rayonunun Çənlibel kəndində məskunlaşıb.***

***Aşıq Cahad 3 iyun 2013-cü ildə vəfat edib və Çənlibel kənd qəbiristanlığında dəfn olunub.***

### OLUR

Qocalanda insanların,
Başında yüz xəyal olur.
Qanmazın dərdini qanan
Çəkəndə, başı çal olur.

Uşaqlar baxmır sözümə,
Hərdən vururam dizimə.
Arvad qayıdır üzümə,
Görən pərişan hal olur.

"Cahad, bəs, qazancın hanı!"
Danlayır mən binəvanı.
Paltardı arvadın canı,
Alanda, dili lal olur.

### BİR İL, BİR İL

Dostları qəmli görəndə,
Qocalıram bir il, bir il.
Gözləri nəmli görəndə,
Qocalıram bir il, bir il.

Ürəyimdən nələr keçir,
Sərraf ləlü-gövhər seçir.
Ömür zəmi, dəryaz biçir,
Qocalıram bir il, bir il.

Mən Cahadam, baxtı qara,
Tapılmır dərdimə çara.
Düşmüşəm qürbət diyara,
Qocalıram bir il, bir il.

## DƏRD ÇƏKMƏKDƏN QOCALMIŞAM

Dərd çəkməkdən qocalmışam,
Daha dərdə dözəmmirəm.
Xocalıda, Xankəndində,
Mən Şuşada gəzəmmirəm.

Dağılıbdı mənim elim,
Bağlanıbdı mənim yolum,
Lal olubdu mənim dilim,
Doğru sözü yazammıram.

Tağ yatıb, solubdu bostan,
Xəbər yox qohumdan, dostdan.
Cahadam, bağlaram dastan,
Dərya dərin, üzəmmirəm.

## GÖYÇƏ

Yenə ermənilər azdı, qudurdu,
Dağıldı, çapıldı, talandı Göyçə.
Beş günün içində kimsə qalmadı,
Elə bil, yox imiş, yalandı Göyçə.

Dövlətdən bu dərdə olmadı çara,
Qaçqınlar düşdülər borana, qara.
Ələ keçənləri çəkdilər dara,
Nahaqdan qanlara bulandı Göyçə.

Cahad, şərəflidi adı Göyçənin,
Getməz ağızlardan dadı Göyçənin.
Sönməz ürəklərdən odu Göyçənin,
Boşalıb, yenə də dolandı Göyçə.

## BİLİNMƏZ

Bir sirri-xudadı, bilin, bu dünya,
Nə tarixi, nə də yaşı bilinməz.
Bu gün qan ağladan sabah qan ağlar,
Bu çarxı-fələyin işi bilinməz.

Gündüz işıq olub külli-kainat,
Gecələr aləmə çökür zulumat.
Deyirlər, qopacaq bir gün qiyamat,
Nə baharı, nə də qışı bilinməz.

Adam var, hər yerdə öyər özünü,
Adam var, məclisdə bilmir sözünü.
Aşıq Cahad deyər sözün düzünü,
Dar günə düşməmiş, kişi bilinməz.

## MƏNİM ÜÇÜN

Ay vəfalı dilbər, gəl gedək bizə,
Mən çalım həvəslə saz, sənin üçün.
Mənim məhəbbətim sənə bağlıdı,
Sənin məhəbbətin az, mənim üçün

Dişlərin mirvari, ləblərin püstə,
Mən sənin dərdindən olmuşam xəstə.
Bir ləhzə başımı al dizin üstə,
Hərdən-hərdən eylə naz, mənim üçün.

Sərvi qamətinə vurulmuşam mən,
Büllur sular kimi durulmuşam mən,
Cahadam, çox gəzib, yorulmuşam mən,
Qoynun içi cənnət, yaz, mənim üçün.

## KİMİ QAN AĞLAYIR, KİMİ KEF ÇƏKİR

Kimi qan ağlayır, kimi kef çəkir,
Bilmirəm, bu fələk nə həvəsdədi.
Soylayıb qılıncı, alıb əlinə,
Məqamdı, başımı kəsəkəsdədi.

Tacirəm, mətahım dünyanın qəmi,
Heç pərgar olmadı içimin çəmi.
Daima nizamdı könlümün simi,
"Kərəmi" kökdədi, "Dilqəm" üstədi.

Mən Aşıq Cahadam, dost yorğunuyam,
İlqar qədəhinin tam dolğunuyam.
Elə vurulmuşam, el vurğunuyam,
Eldən ötrü hey qulağım səsdədi.

## BİLMİRƏM

Vətən çox şirindir, çıxmaz yadımdan,
Qırılıb qanadım, uça bilmirəm.
Sərgərdan qalmışam sahibsiz yerdə,
Sirrimi yadlara aça bilmirəm.

Urus zərbə vurdu Azərbaycana,
Dığalar əlindən yetmişik cana.
Köç-köç oldu, hərə düşdü bir yana,
Burdan özgə yerə qaça bilmirəm.

Aşıq Cahad el oduna yanandı,
Laçın, Şuşa, Kəlbəcərim talandı.
Açar Yeltsindədi[1], qalan yalandı,
Bağlayıb qapını, aça bilmirəm.

***2010***

***1. Yeltsin – Rusiyanın keçmiş prezidenti***

## HANI

Göyçəyə baş çəkir Ələsgər ruhu,
Deyir, bu mahalın elləri hanı?!
Qaratikan kök salıbdı bu yerdə,
Bəs, mənim ətirli güllərim hanı!?

Miskin Abdal, Seyid Bayram ocağı,
İndi o yerlərdə yurd salıb yağı.
Mənim ürəyimin alovlu çağı,
Bayatı dediyim dillərim hanı?!

Aşıq Əsəd "Cəngi" çalmır Göyçədə,
Dost-qohumlar qonaq qalmır Göyçədə,
Bir-birini yada salmır Göyçədə,
Ot basıb cığırı, yollarım hanı?!

Məşəd İsa haray salıb, hay vurmur,
Kalvay Miri, Qaçaq Cəmil qıy vurmur,
Cahadam, ağlaram, ürəyim durmur,
Qırılıb qanadım, qollarım hanı!?.

## BİR YARA MƏNİ

Sirdaşım yox, sirr sözümü söyləyəm,
Pünhandan incidir bir yara məni.
Naşı təbib gətirməyin üstümə,
Kamil cərrah gərək, bir yara məni.

Qürbət eldə tikdirmişəm bir qala,
Nahaq yerdən mən də düşdüm bir qala.
Yaxşı dostun ocağını bir qala,
O səndən istəsin bir yar əməni.

Aşıq Cahad, söylə sözün bir aya,
Oxumamış nə bilərsən bir aya.
İnsan oğlu yol salıbdı bir Aya,
Tut qolumdan, tapşır bir yara məni.

## SƏLİM ABDULLAYEV
***(1955-2020)***

***Səlim Nəsrəddin oğlu Abdullayev 1955-ci ildə Qaraqoyunlu mahalında anadan olub. Gənc yaşlarından aşıq sənətinə böyük maraq göstərib, ustad aşıq Hacı Bayramova şəyirdilik edərək, ondan sənətin incəliklərini öyrənib.***

***Göyçə mühitində işlək olan havaları, eləcə də dastanları mükəmməl bilib. Mühitin ustad aşıqlarının sənət ənənəsini yüksək ustalıqla davam etdirib.***

***O, bədii yaradıcılıqla da məşğul olub, gəraylı, qoşma, divani və digər poeziya nümunələri aşıqların repertuarında özünə yer alıb. Şeirlərinin bir qismi mətbuat səhifələrində çap olunub.***

***Aşıq Səlim Azərbaycan aşıqlarının IV, V və VI qurultaylarının, eyni zamanda Beynəlxalq Aşıq Festivalının iştirakçısı olub.***

***Səlim Abdullayev 2020-ci ildə Gəncə şəhərində vəfat edib.***

### OĞLUYAM

Mərdlik, igidlik rəmziyəm,
Türk balası, türk oğluyam.
Elin səadət səsiyəm,
Türk balası, türk oğluyam.

Ayırmaram heç milləti,
Mən baxmaram ona səthi.
Meydandan qaçmaram qəti,
Türk balası, türk oğluyam.

Aşıq Səlim, bac almışam,
Şöhrətinlə ucalmışam.
Mən Qorquddan güc almışam,
Türk balası, türk oğluyam.

## QƏHƏTDİR

Yalan demə, doğru danış,
Düz başına qəhətdimi?
Ona-buna ölüm gəzmə,
Öz başına qəhətdimi?

Baxmırsan qaraya-ağa,
Göydən leysan yağa-yağa,
Yolunu salıbsan dağa,
Düz başına qəhətdimi?

Aşıq Səlim, tanı bunu,
Yalandan geyinib donu,
Nə olacaq işin sonu,
Göz başına qəhətdimi?

## ELİM MƏNİM

Şirin dilli, xoş ləhcəli
Tanıyıbdır elim mənim.
Keçir elin arasında
Ayım mənim, ilim mənim.

Babam kimi meydan açdım,
Günəş kimi şəfəq saçdım.
Namərd, müxənnətdən qaçdım,
Şirin olub dilim mənim.

Sinəmdədi telli sazım,
Dastan deyim, şeir yazım.
Aşıq Səlim, çəkər nazım
Göyçə kimi elim mənim.

## QOCALANDA

Qara saçın ağaracaq qar kimi,
Gələr gözlərinə tor qocalanda.
Dizin ağrıyacaq, bel büküləcək,
Olacaq işlərin zor qocalanda.

Güzgüyə baxanda peşman olarsan,
Kövrələrsən, bulud kimi dolarsan,
Gündə yüz yol xəyallara dalarsan,
Dolar yatağına qor qocalanda.

Əsil ola, övlad baxa sözünə,
Təsəlli verəsən özün-özünə.
Fikir qoymaz yuxu getsin gözünə,
Dünya olar sənə dar qocalanda.

Aşıq Səlim, həya gərək yerində,
Min hikmət var bu dünyanın sirrində.
Dil dolaşar, dil də qalmaz sərində,
Çox çəkərsən ahu-zar qocalanda.

## CEYRANDIR

Gəncə şəhərində görmüşəm onu,
Geyinibdir əyninə lalədən donu,
Eşqin, məhəbbətin görünmür sonu,
Allah, bu ceyran hara ceyranıdı?!

Boylanıb yollara həsrətlə baxır,
Görənin qəlbini yandırıb yaxır.
Həzin nəğmə olub, qəlbimə axır,
Allah, bu ceyran hara ceyranıdı?!

Aşıq Səlim görüb xəyala dalıb,
Sənət ilhamını tək ondan alıb,
Hey baxıb, gözləri yollarda qalıb,
Allah, bu ceyran hara ceyranıdı?!

## DEYƏ-DEYƏ

Vaxtsız xəzan əsdi, saraldı bağım,
Mən hələ gəzirəm bağ deyə-deyə.
Fələk xəstə etdi, pozdu növrağım,
Qalmışam yataqda nar deyə-deyə.

Dolaşa bilmirəm dağı, aranı,
Baxt yatıb, dost-qohum kəsib aranı,
Əsir bədənimə dağın boranı,
Ömür başa çatır yar deyə-deyə.

Ömür demək bir gecəlik yuxuymuş,
Sinəmə sancılan eşqin oxuymuş,
Aşıq Səlim tapa bilmir, yoxuymuş,
Apardı şikarım sar, deyə-deyə.

## YARANIBDI

Mən razı deyiləm öz taleyimdən,
Çünki yaranandan kəm yaranıbdı.
Qara baxtın yedəyində gəzirəm,
Bütün dərdlər mənə cəm yaranıbdı.

Xəstə oldum, hamı dedi, öləcək,
Gülmədi üzümə gənclik, gələcək.
Yəqin ki, el-oba bir gün deyəcək,
Bu yazıq gözləri nəm yaranıbdı.

Ömür keçir, beş-on ilə qalmaram,
Xoşbəxtliyi zorla versə, almaram,
Nə düşünüb, nə yadıma salmaram,
Aşıq Səlim, zilin bəm yaranıbdı.

## BİRDƏN

Acı xəbər, yaman aldın üstümü,
Sevgi bağım soldu-saraldı birdən.
Gör nə qədər arzularım varıydı,
Məhəbbət çırağım qaraldı birdən.

İlk məhəbbət gör nə qədər şirindi,
Yaraları sağalmazdı, dərindi.
Qəm çəkməyi öyrənirəm mən indi,
Tərlan oylağını sar aldı birdən.

Aşıq Səlim, nə bəd baxtın varıymış,
Məhəbbət yolların boran, qarıymış,
Bu dünyada belə işlər varıymış,
Sevdiyim özgəyə yar oldu birdən.

## YALAN DEMƏZ

Dost, yalan demə, doğru söz danış,
Dost olan dostuna yalan söz deməz.
Eşitdiyin saxla, gördüyün danış,
Qulaq yalan deyər, göz yalan deməz.

İnsan olan hörmət eylər özünə,
Müxənnətin özü nədi, sözü nə,
Namərd böhtan atar, durar üzünə,
Mərdi öldürsələr, yalan söz deməz.

Dostluqda saf olar etibar, inam,
Çətin ki, bu yolda əyiləm, sınam,
İnamma, inamı, ilqarı danam,
Aşıq Səlim ölər, yalan söz deməz.

## GƏLƏRSƏ COŞA

Hər bir musiqinin qədim əcdadı,
Aşıqdı, yaranıb sazınla qoşa.
Elin, məclislərin yaraşığıdı,
Əgər dinərlərsə, tez gələr coşa.

Neçə min illərlə gəlir sorağı,
Qılıncla bərabər iyid yarağı,
Haqdan yanır əbədilik çırağı,
Müqəddəs sayılar, çəkilər başa.

Aşıq Səlim, zəhmət çəkdin, dərs aldın,
Sənətini sevə-sevə qocaldın,
Ustalığın zirvəsinə ucaldın,
Yaşa, xalqım, yaşa Vətənim, yaşa.

## GÖYÇƏNİN

Başı bəla çəkib illərdən bəri,
Qəlbi yaralıdır ulu Göyçənin.
Gözəlliyi öz başına bəladı,
Mərifət elmində dolu Göyçənin.

Məmməd Hüseyn ağa, Aşıq Ələsgər, Alı,
Sənətin sirrindən oldular halı.
Beynəva Nəcəfin töküldü qanı,
Kəsildi bədəndə qolu Göyçənin.

Ordumuz düşmənin gözünə oxdu,
İndi qələbəyə inamım çoxdu.
Bizlə savaşmağa qüvvəsi yoxdu,
Bəlli olmaz sağı-solu Göyçənin.

İnşallah, Vətəni geri alarıq,
Düşmənləri pərən-pərən salarıq.
Aşıq Səlim, “Misri”, “Cəngi” çalarıq,
Açılar əbədi yolu Göyçənin.

## KÖVRƏLİRƏM MƏN

Ömrüm boyu həsrətimsən, qəmimsən,
Baxıram arxanca, kövrəlirəm mən.
Dəryada ümidsiz üzən gəmimsən,
Baxıram arxanca, kövrəlirəm mən.

Ürəyimdən bir dolaşıq yol saldın,
Həkk oldun beynimə, yadımda qaldın.
Bütün varlığımı əlimdən aldın,
Baxıram arxanca, kövrəlirəm mən.

Çoxdan ağlamağı etmişəm peşə,
Çoxdu şikayətim səndən həmişə.
İnanma ki, aşıq Səlim gen düşə,
Baxıram arxanca kövrəlirəm mən.

## MƏƏTTƏL QALMIŞAM

Dünyanın işinə məəttəl qalmışam,
Ağlayır bir gözüm, gülür bir gözüm.
Hamı deyir, xeyirlə şər qardaşdır,
Qəmlənir bir üzüm, gülür bir üzüm.

İnsan yaranandan qalmaqaldadır,
Köç karvanı gedir hər gün, yoldadır.
Ağır imtahanlar hələ daldadır,
Nə taqətim qalıb, nədə ki, dözüm.

Aşıq Səlim, fələk qəddin əyibdir,
Yerli-yersiz ürəyinə dəyibdir.
Məni bəxtim deyil, döyən döyübdür,
Bunu Allah bilir, birdə ki özüm.

## KƏRƏM BƏKİROĞLU
*(1955-2008)*

***Kərəm Bəkir oğlu Namazov 1955-ci ildə Çəmbərək rayonunun Bəriabad kəndində dünyaya gəlib. Həmin kənddə ibtidai məktəbi bitirəndən sonra təhsilini Əmirxeyir kəndində davam etdirib. Kərəm burada oxuyandan üç ay keçmiş gözləri tutulmağa başlayıb. Buna görə məktəbi yarımçıq qoyub. Erməni həkiminin yanlış müalicəsi onun vəziyyətini daha da ağırlaşdırıb. Sonra da Bakıda və İrəvanda müalicə olunsa da, heç bir faydası olmayıb və o, dünya işığına həsrət qalıb.***

***Kərəm hələ lap uşaqlıqdan saza-sözə könül verib, qısa müddətdə el-oba arasında Aşıq Kərəm kimi tanınıb.***

***Aşıq Kərəm də digər eloğluları kimi, Qərbi Azərbaycandan soydaşlarımızın 1988-ci il deportasiyası zamanı Bakı şəhərinə köçüb, burada məskunlaşıb.***

***Aşıq Kərəm 2008-ci il iyun ayının 2-də vəfat edib.***

***2017-ci ildə "Beləcə boşalıb, dolur bu dünya" adlı kitabı çap olunub.***

### SARITEL

Bir gözəlsən bu dünyada,
Yoxdu sənə tay, Sarıtel.
Barmaqların inci, sədəf,
Kirpiklərin yay, Sarıtel.

Gəzdim bütün el-obanı,
Tapmadım bir sən tək canı.
Ver sən dərdimə dərmanı,
Bir cüt busə pay, Sarıtel.

Bəkiroğlu, yana-yana,
Gedirəm kannan məkana.
Əgər ölsəm, məzar ara,
Öz əlinlə qoy, Sarıtel.

## SALDI

Çox nadanlar üzdə gülüb,
Axır səni ələ saldı.
Talan edib var-yoxunu,
El içində dilə saldı.

Ay mərd olan, yaxşı dayan,
Sənə qalxan abır-həyan.
Gəl dərdini etmə bəyan,
Aşıq onu elə saldı.

Kərəm deyər, Haqqı görnən,
Mərd oğula salam vernən.
Yığnaq edib, məclis qurnan,
Xudam işi belə saldı.

## DOLANDI

Yenə cana gəldi bu sınıq könlüm,
Gəşd eylədi yar bağını dolandı.
Çıxdı qarşısına elə bənövşə,
Dönə-dönə budağını dolandı.

Elə bil cənnətdi oturub pəri,
Sığmayır sinəmə tərif dəftəri.
Nəzər etdim təkcə əlvan gülləri,
Tutdu ləçək, yarpağını dolandı.

Yazda laləzardır, baharda cənnət,
Hər vaxt gözəl olmur belə təbiət.
Kimsə bu Kərəmə etməsin minnət,
Həm aranı, həm dağını dolandı.

## DAĞLAR

Üstündə saz çalıb, söz oxunardı,
İndi nə qalıbsan xaraba, dağlar.
Tapmadım binədə, gəzdim kimsəni,
Dağıldı üstündən el-oba, dağlar.

Qəza qəfil gəldi, olduq didərgin,
Xoş gün yoxa çıxdı, gəldi qara gün.
Qapı-qapı gəzib olmuşam küskün,
Harda qaldı görən yurd-yuva, dağlar.

Boşuna deyilmir Kərəmin sözü,
Eldən ayrılanın gülərmi üzü?
Dolandım, hərləndim dərəni, düzü,
Bizi betər tutdu bəddua, dağlar.

## OLAR
***(Bağlama-qıfılbənd)***

Aşıqsansa, al sazını, cavab ver,
O nədir ki, dəhanında nar olar?
O hansı ağacdı, dayağı yox, kökü yox,
Çiçək açar, budağında bar olar?

O nədir ki, dəhan yeyir sərinnən?
Tərpənəndə nalə çəkir dərinnən.
Bir nəhəngi oynadanda yerinnən,
Çırpınanda boran olar, qar olar.

Keçirdim ömrümün qırx dörd yazını,
Çox çəkmişəm vəfasızın nazını.
Bu meydanda mən almasam sazını,
Sərraf Kərəm kəltə-kəla ar olar.

## OFA-OF
*(müəmma)*

Ellər, hikmət gördüm, bilinmir yaşı,
Hündürdən endirir düzə ofa-of.
İnsanın əliylə gərdiş eləyir,
Salavat çevirir üzə ofa-of.

Özü bir baladır, təmizdir işi,
Ülgüc, almaz kimi, bərk kəsir dişi.
Girir bir kisəyə onu, ya beşi,
Nə candır altında dözür ofa-of.

Bəkiroğlu, agah etdin, nə sirdir,
Yaranan hər kimi ona yesirdir.
Gərdişin eyləyir, necə əsirdi,
Yan tutcaq cismini cızır ofa-of.

## YERİNDƏMİ

Mehribanım, bir xəbər ver,
Oylaqların yerindəmi?!
Ağır ellər gəlib düşən
Yaylaqlarım yerindəmi?!
Uçuşurmu ördək, qazlar,
Gəzişirmi gəlin, qızlar,
Baş qaldırıbmı yarpızlar,
Bulaqların yerindəmi?!

Gəzişirmi çəmənlərdə
Bülbüllərim, güllər, deyin,
Axırmı şırıltı ilə
Dəli-dolu sellər, deyin;
Varmı orda məndən başqa
Xoşbaxt olan, baxtı yeyin.
Orda bir dəftərim qalıb,
Varaqları yerindəmi?!

Çoxmu gələn bu yerlərə,
Gözəlliyə baxıb qonan,
Bu dağların havasında,
Özünü bir xoşbəxt sanan...
Varmı Sərraf kimi qanan,
Dost yolunda candan yanan;
Söylə, varmı halım soran,
Qonaqlarım yerindəmi?!

## İNSAN

Yüz il yaşa, bir gün gələr,
Düşəcəksən yana, insan.
Kasıb ol, halal dolan,
Susamaynan qana, insan.
Haram olub yoldaşına,
Cib güdməynən heç vaxt, heç an,
Uyub şeytanın felinə;
Danışmaynan şəri-böhtan,
Sağı-solunda yazanın var,
Qurulacaq Haqqı-divan;
Ah-nalən göyə çıxacaq,
Rəhmin gəlsin cana, insan.

Tarixin tamam olanda,
Baxmazlar heç mülkə, vara;
Bəliyib beş arşın kəfənə,
Sallıyacaqlar məzara;
Qıl körpüdən keç deyəndə,
Düşəcəksən ahuzara;
Əməl salahın düzdüsə,
Su gələcək göydən nara;
Olubsansa fitnə-kələk,
Girəcən hər dona, insan.

Ay biçarə Sərraf Kərəm,
Bir gör, qarşında nələr var;
İnkir, minkir, iti çəngəl,
At addamaz neçə yollar...
Göz sığanıb yumulacaq,
Çatılacaq yandan qollar.
Qırx gün qabaq sual da var,
Çıxmasın yadından bunlar.
Hər kim desə yalan sözdür,
Çəkəcək altını onlar;
Haqq yolunda ver canını,
Sahibinə, ona, insan.





## İXTİYAR QOCAYEV
*(1970)*

***İxtiyar Qocayev 1970-çi ildə Qaraqoyunlu mahalının Çəmbərək rayonunda (Çıvıxlı kəndi) anadan olub. Saza, sözə sonsuz həvəs göstərən İ.Qocayev bir müddət sonra Aşıq Hacı Bayramovun yanında şəyird olub. Ustadın sənət yolunu yüksək şəkildə mənimsəyərək onunla birgə məclislər keçirib.***

***Yaradıcı aşıqdır. Müxtəlif səpkili şeirləri onun yaradıcı istedadının göstəricisidir. Şeirlərində qaçqınlıq həyatının ağrı-acıları, yurd yerlərinin həsrəti, erməni vəhşiliklərinin təqdim-təsviri müxtəlif səviyyələrdə özünə yer alır.***

***Azərbaycan aşıqlarının V və VI qurultaylarının nümayəndəsi olub.***

### AY CIVIXLI

Elim-obam, ay Cıvıxlı,
Torpağına qurban olum.
İştah açan, diş göynədən,
Bulağına qurban olum.

Solub getdi o gözəllik,
Həsrət qaldıq birdəfəlik.
Neynək, dözürük hələlik,
Qucağına qurban olum.

Ayrılıq yaman çəkəcək,
Çoxları sənsiz köçəcək,
Yurd sökülüb iz itəcək,
Ocağına qurban olum.

İxtiyaram, dözəmmirəm,
Yaylağında gəzəmmirəm,
Bənövşəni üzəmmirəm,
Ocağına qurban olum.

## "BAŞ SARITEL"

Doğma elim yada düşər,
Çalınanda "Baş sarıtel".
Ürək yanıb oda düşür,
Çalınanda "Baş sarıtel".

O dağları dolaşıram,
Çən-dumana qarışıram,
Atdan düşüb, yol çaşıram,
Çalınanda "Baş sarıtel".

Bulaqlardan su içirəm,
Çəmənlərdə gül seçirəm,
Sərin yaylağa köçürəm,
Çalınanda "Baş sarıtel".

Neçə yara tapar şəfa,
İxtiyar da çəkər cəfa,
Gözəllər gələr insafa,
Çalınanda "Baş sarıtel".

## GÖRƏN

Üzübəri baxan dağlar,
Bizim dağlardımı, görən?
Həsrətdən qəlbimi yaxan,
Bizim dağlardımı, görən?

Düzdə maralı gəzirik,
Qəlbi yaralı gəzirik,
Eldən aralı gəzirik,
Qonaq saxlardımı, görən?

İxtiyarın yük boynunda,
Qalıbdır fələk oynunda,
Gəzsəm vətənin qoynunda,
Sevinib ağlarmı, görən?

## DEYİL

Haraylama ötən ömrü,
Bir də geri gələn deyil.
Dünya vəfasız dünyadı,
Dərdlərini bölən deyil.

İllərlə yoldaşın olan,
Dost deyib, sirdaşın olan,
Doğmaca qardaşın olan,
Gözyaşını silən deyil.

Ömür belə qalsa nə var,
Sən istəyən olsa, nə var,
İxtiyari sorsa, nə var,
Sevincinə gələn deyil.

## QARAQOYUNLU

,

Bir yanı Cantəpə, bir yanı Murguz,
Bir yanı Haqqıxlı, Ulusu, Oğuz,
Süfrəsində çörək, nemətiydi duz,
Söhbətli el olub Qaraqoyunlu.

Yaylağında ağsürülər mələşən,
Payız olcaq meşəsi xəzəlləşən,
Çəmənləri, yaz olcaq gözəlləşən,
Ətirli gül olub Qaraqoyunlu.

Yolboyu görərsən Salah, Poladı,
Gölkəndin ən başda çəkilib adı.
Getməz damağından xəngəlin dadı,
Ruzuli el olub Qaraqoyunlu.

Sağda Qaraqaya, həm Əmirxeyir,
Yanıqpəyə haray çəkir, gəl deyir.
Çaykəndlə Bəryabad qonaq gözləyir,
Mənalı il olub Qaraqoyunlu.

Hələ mən demirəm şoru, motalı,
Arının cökədən çəkdiyi balı,
Gəzsən, o yerlərdən olardın halı,
Tarixi nəsildi Qaraqoyunlu.

İxtiyaram, haralarda gəzirəm,
Cıvıxlı, xəyallarda süzürəm.
Mənəm, hələ bu dərdlərə dözürəm,
Görün kimə qaldı Qaraqoyunlu.

## QORXURAM

Nəfs məni yaman tutdu suala,
Söylədi ki, bu bədxahdan qorxuram.
Sığınmışam övliyalar pirinə,
Səcdəgahdan, qibləgahdan qorxuram.

İnsanlar hərisdi dövlətə, vara,
Sorğuyla, sualla çəkilir dara.
Kimi lənət, kimi rəhmət apara,
Qiyamətdə qəmdən, ahdan qorxuram.

Günahın böyüyü qeybət etməkdir,
Yaxşıyla yamanlıq ətək-ətəkdi.
İxtiyar bilir ki, Allahı təkdi,
Başım üstə bir Allahdan qorxuram.

## BİR AZ

Sevgilim qolunu boynuma dola,
Gedək təbiətə, dolanaq bir az.
Əslini çağıraq, Kərəm də gəlsin,
Alışaq, odlara qalanaq bir az.
Sən çiçək olasan, mən arı olum,
Sən könül verəsən, ilqarın olum,
Sən dağım olasan, mən qarın olum,
Dönək qış qarına, ələnək biraz.

Gözləyək axşamı, qaranlıq düşsün,
Biz yerdə, ulduzlar göydə görüşsün.
İxtiyar sarılsın, sinə üşüsün,
İsti komamıza yollanaq bir az.

## ÖLÜM, GƏLMƏYİM

Ey fələk, qanadlı quş eylə məni,
Gedim ana yurda görüm, gəlməyim.
Seyr edim Vətəni başdan ayağa,
Nərgiz, bənövşəni dərim gəlməyim,
Gedim o torpaqda ölüm, gəlməyim.

Kəkilin başında çıxım ağaca,
Cıvıxlını seyr eləyim doyunca,
Yarpız, qaymaqgülü, çiçəkli yonca,
Lilparı bulaq üstə sərim, gəlməyim,
Gedim o torpaqda ölüm, gəlməyim.

Sonra yolum düşsün məzarıstana,
Hay verim ordakı hər bir insana.
İxtiyaram, o torpaqda yatana,
Bir Allah duasın verim gəlməyim,
Gedim o torpaqda ölüm, gəlməyim.

## GÖRMÜRƏM

Murguz dağı, Xərya, Toxluca yalı,
Neçə ildi o dağları görmürəm.
Məni xəstə saldı Vətən həsrəti
Gül-çiçəkli yaylaqları görmürəm.

Görən Daşlı bulaq yenə axırmı
Ağ sürülər Mahmudluya qalxırmı,
Xərya dağı həsrət-həsrət baxırmı,
Həsrətəm, o bulaqları görmürəm.

Mehvallar qəmlidi, qanlar ağlayır,
Cantəpə hay verib, qara bağlayır,
Ana, kəndim sinəsini dağlayır,
Viran olmuş oylaqları görmürəm.

Harda qaldı Böyük təpə, Kor bulaq,
Kəklikotu solub, bitibdi alaq.
Yarpızdı bulağına getməyir qonaq,
Erkək kəsən qonaqları görmürəm.

Dərdlə qəm sinəmdə yuva salıbdı,
Kim köç edib, kimi payın alıbdı.
İxtiyaram, qəlbim dağlar qalıbdı,
Başı qarlı o dağları görmürəm.



## DƏRƏÇİÇƏK–LORU-PƏMBƏK AŞIQLARI

***Bu bölgəyə məxsus aşıqlar həm göyçə, həm də Borçalı-Qazax aşıq çevrələri ilə yaxın münasibətdə olub, onlardan faydalanıb, eləcə də, Borçalı, Qazax bölgəsində aşıq sənətinə öz xoş təsirlərini göstəriblər. Bu mühitin Dərəçiçəkli Alı, Sadıq Sultanov, Məmməd Süleymnaov kimi nəhəng sənətkarları saz-söz aləmində indi də məşhur sənətkarlar kimi tanınırlar.***

### OZAN HEYDƏR
*(XV əsr)*

***Aşıq Heydər – Ozan Heydər XV əsrdə Dərəçiçək mahalının Ozanlar kəndində yaşayıb-yaradıb. Ozan Heydər adı ilə yaddaşlarda qalıb. Zəngin yaradıcılıq yolu keçən bu sənətkarın haqqında elə də ətraflı məlumat yoxdur. Xalq arasında barəsində bir sıra əhvalat-rəvayətlər dolaşmaqdadır.***

### ÜSTÜNDƏ

Sübh ikən sübhana düşdüm,
Baş qoydum ocaq üstündə.
Dəryayi-ümmana düşdüm,
Şam gördüm çıraq üstündə.

Bulundum dağda-aranda,
Qibleyi-ərzim Turanda.
İmanım-dinim Quranda,
Haqq yolum yarpaq üstündə.

Mən Heydərəm, üzüm gülməz,
Gələn gedər, gedən gəlməz.
Sar yuvama qona bilməz,
Ayağım torpaq üstündə.

## YETƏR

Haqqa varan Haqqı bular,
Haqq ilə imana yetər.
Ələstidən şad olan ruh,
Yetəndə, Sübhana yetər.

Özündə doğru bulmayan,
Könlümə işıq salmayan,
Məddahi-mövla olmayan,
Mətləbdə şeytana yetər.

Heydərdi məşhərə gedən,
Sidqi ibadətə yetən,
Məhəmmədə biət edən,
Zikr edib Qurana yetər.

## GƏLMƏZ

Dərd əhlidi mənim pərim,
Sirrin bildirməyə gəlməz.
Gözlərindən yaşlar axar,
Nədən, sildirməyə gəlməz.

Hər nə olub, mənə olub,
Gül başını xoryad alıb,
Mənim könlüm ağlar qalıb,
Pərim güldürməyə gəlməz!

Heydər deyər, olmadım şad,
Dilədim Xudadan imdad.
Haqqı görən qanlı cəllad,
Bir yol öldürməyə gəlməz.

## OZAN İBRAHİM
*(XVI-XVII əsrlər)*

***Ozan İbrahim XVI əsrin sonu və XVII əsrin əvvəllərində Dərəçiçək mahalının Ozanlar kəndində yaşamış ustad sənətkarlardandır. Sənətin sirlərini öyrətməyə xüsusi həvəs göstərmiş, istedadı, bacarığı olanların aşıq kimi yetişməsinə yardımçı olmuşdur. Şeirlərinin az bir hissəsi günümüzə gəlib çatmışdır.***

### YETMƏZ

Bar ilahim, bu nə işdi,
Haqq işim divana yetməz.
Öz-özünü adil bilən,
Günahsız qurbana yetməz.

Şübhəm yoxdu doğru sözdə,
Astarım görükər üzdə,
Gözüm qalar yolda, izdə,
Dildarım peymana yetməz.

Namərd dosta olma həyan,
Haram sevda etmə bəyan.
Bu mədarla ötər dövran,
Xoş günüm dövrana yetməz.

Hər pay xudadan qismətdi,
Payım başıma zinətdi.
Yaxşılıq elə nemətdi,
Qeydinə qalana yetməz.

Vaxtında tədbir qılmasa,
Söz qapıb, inci bulmasa,
Dərsini pirdən almasa,
İbrahim Ozana yetməz.

## ÜSTÜNDƏ

Sübh ikən sübhanə düşdüm,
Baş qoydum ocaq üstündə.
Dəryayi-ümmana düşdüm,
Şam gördüm çıraq üstündə.

Bulundum dağda-aranda,
Qibleyi-ərzim Turanda,
İmanım-dinim Quranda,
Haqq yolum yarpaq üstündə.

Qəmli Ozan, üzüm gülməz,
Gedən gedər, gələn gəlməz.
Sar yuvama qona bilməz,
Ayağım torpaq üstündə.

## DEYƏRLƏR

Mənim yığvalıma talıb olanlar,
Kövsər şərbətini içdi, deyərlər.
Baxdı bu dünyaya sərraf gözüylə,
Gövhəri axtardı, seçdi, deyərlər.

Xaqan köntöy baxar taxtdan aşağa,
Deyirlər, düşməndi bayquş işığa.
Bimürvət zamana neçə aşığa,
Yaxasız köynəklər biçdi, deyərlər.

Dövranım piyada, yolda yorular,
Yazar məlakələr, əməl sorular.
Haqq-hesab çəkilər, divan qurular,
Çoxları canından keçdi, deyərlər.

Yetişsin dadıma püşti-pənahım,
Əfv etsin, çoxdusa cürmi-günahım.
Çalışdı, vuruşdu Ozan İbrahim,
Dünyadan əliboş köçdü, deyərlər.

## GƏLMƏZMİ

Necoldu sultanım, necoldu şahım,
Kərəm gözlədiyim kara gəlməzmi?
Yolu üstə şahin-şonqar, sar qonsa,
Eyləyib birtəhər çara, gəlməzmi?

Misli pərvanəyəm, yoxdu qərarım,
Çıxıbdı əlimdən dövlətim-varım.
O şəhdi-şəkərim, şahbaz şikarım,
Bizə tərəf baxtı qara gəlməzmi?

Pünhan dərdim pünhan edib ağlaram,
Bu zülümü sinəm üstə dağlaram.
Zəngi çaya dönə-dönə qarğaram,
Ah-naləmdən Zəngi zara gəlməzmi?

Səbri-qərarımı əlimdən alan,
Məni məcnun edib çöllərə salan,
Miskin vücudumda daim var olan,
Sevgidən qurduğum tora gəlməzmi?

Müştağam o yarın haqqı-sayına,
Sürahi boylumun gül camalına,
İbrahim döşənsə xaki-payına,
Dönüb Ozanlardan Zara gəlməzmi?



## MƏHƏR CƏFƏROĞLU
*(1870-1937)*

***Məhər Cəfər oğlu 1870-ci ildə Pəmbək mahalının Hallavar kəndində anadan olub. O, kiçik yaşlarında anasını itirib, atası Cəfər kişinin himayəsində böyüyüb. Kiçik yaşlarından kəndin varlı adamlarına nökərlik edib. Sinədəftər olub, təhsil görməsə də, qeyri-adi istedadı sayəsində özündən sonra böyük bir irs qoyub. Amma təəssüf ki, onun şeirləri nə sağlığında, nə də ölümündən sonra oxculara geniş şəkildə təqdim olunmayıb.***

***Aşıq Məhər 1937-ci ilin dekabrında vəfat edib.***

### BU EVDƏ

Şükür, tanrı, sənin min bir adına,
Göründü Abbasın yarı bu evdə.
Qayım-qədim olsun təzə gərdəyi,
Başacan yeyilsin barı bu evdə.

Qravat[1] bağlandı, gərdək quruldu,
Könüllər şad oldu, ürək duruldu,
Kəbinlər kəsildi, nigah vuruldu,
Açıldı xonçanın gülü bu evdə.

Artıq olsun bu gəlinin hörməti,
Başından tökülsün malı, dövləti,
Bir cüt corab Aşıq Məhər xələti,
Gətirsin geydirsin qarı bu evdə.

---

***1. qravat - çarpayı***

## SADIQ SULTANOV
*(1893-1965)*

***Sadıq Hasan oğlu Sultanov 1893-cü ildə Qərbi Azərbaycanın Axta mahalının (indiki Razdan rayonu) Qaraqaya kəndində anadan olub. İki il İrəvandakı Göy məsciddə dini təhsil alıb. Hələ kiçik yaşlarında ikən atası vəfat etdiyindən dayısı, ustad aşıq Dərəçiçəkli Alı həm ona, həm də qardaşı Məmmədə himayədarlıq edib, saz-söz sənətini sevdirərək hər ikisinin ustad kimi yetişməsində böyük rol oynayıb.***

***Ermənilərin törətdikləri kütləvi qırğınlardan yaxa qurtarmaq üçün Sadıq Hasan oğlu 1920-ci ildə Borçalının Araplı kəndinə köçüb. Burada uzun müddət qalmayaraq Qaçağan kəndinə, sonra Görarxıya (Alget), 1922-ci ildə isə Tiflisə köçüb. Tiflis ədəbi-mədəni mühiti onun bir sənətkar kimi daha da püxtələşməsində mühüm rol oynayıb, Borçalı mahalında bir çox aşıqların yetişməsində onun böyük xidmətləri olub.***

***Aşıq Sadıq 1946-1952-ci illərdə Qazaxda, sonra isə ömrünün sonuna kimi Tiflisin yaxınlığındakı Soğanlıq kəndində yaşayıb.***

***Aşıq Sadıq Sultanov 1965-ci il sentyabrın 4-də vəfat edib.***

### BİSMİLLAH

İbtidada bəli dedim, mən Qurana, bismillah,
Ümməti-Rəsulam ki, şükür Sübhana, bismillah.
Dərya təki mövcə gəlib, mən dönərəm hər yana,
Hər kim düşsə, tez qərq olar bu ümmana, bismillah.

Qismət verən ol xudadır, pirim şah Mərdan Əli,
Xəbər al həqiqətdən, mərifətdən mənəm dolu.
Sərraf gətir, qiymət qoysun, açmışam bu cəlalı,
Nakamilə duru verdim, çəkə bilməm qeyl-qalı,
Nə deyim, nə qandırım, bəs bu nadana, bismillah.

Gəl biçarə aşıq Sadıq, zəmin-asimandan deyim,
Dünyada “mənəm” deyən Təxti-Süleymandan deyim.
Yeddi il zülm çəkən Yusifi-Kənandan deyim,
Salsala qılınc çalan Əliyyi-İmandan deyim,
“İnna lillahi” eşidənlər qaldı bu fəna, bismillah.

## VƏTƏNİM

Başına döndüyüm şanlı Vətənim,
Gör ki səndə neçə canlar dolanır.
Elmli, bilikli, loğman kamallı,
Bir-birinə mehribanlar dolanır.

Gəzmişəm hər yanı, alçaq-ucanı,
Qəhrəman yetirən Azərbaycanı,
Nə xoşbəxt görürəm cavan, qocanı,
Şən ölkəmdə növcavanlar dolanır.

Məktublar yazılar, tutular bəsi,
Yarışa getməyə vardı həvəsi,
Mil-Muğan düzündə qız-gəlin səsi,
Aşıq Sadıq gülüstanlar dolanır.

## OLAR

Zalım fələk, heç kim qərib olmasın,
Qəribin qürbətdə yeri dar olar.
Qərib dinsə, elbə-eldən qınarlar,
Elli dinsə, ellərinə car olar.

Qəribin üzünə qapı açılmaz,
Yüz xan ola, qıraq yerdə seçilməz.
Əsla üzü gülməz, qəlbi açılmaz,
Həmişə işləri ahu-zar olar.

Aşıq Sadıq, bu dünyadan köç indi,
Burdan köçüb, vətəninə keç indi,
Yapalaqlar Vətənində laçındı,
Tülək tərlan qərib eldə sar olar.

## QARA QAŞLAR

Nə əcəb ad verib kamil ustası,
Qələmlə çəkilib qara qaşların.
Ayrılıq atəşi, hicran xəstəsi,
Vurubdu sinəmə yara qaşların.

Könül səni sevdi, ay boyu bəstə,
Cəllad kirpiklərin nə durub qəsdə?
Laləzar yanağın alagöz üstə,
Peykan çəkir kamandara qaşların.

Aşıq Sadıq bu sövdada çarəsiz,
Təbib, gəlmə, dərdim oldu çarəsiz.
Pərvanə tək alışıram çarəsiz,
Məni salıb intizara qaşların.

## GETDİ

Kamil bağban oldum, bir bağ bəslədim,
Dedilər, bu bağban qocaldı, getdi.
Can deyən dostlarım başa qalmadı,
Tamamən incidi, gec oldu, getdi.

İşim tənəzzüldür, pozulub halım,
Dağıldı başımdan cahi-cəlalım,
Görə kam sənətim, kəşdim, yığvalım,
Tale də pis döndü, tuc oldu, getdi.

Aşıq Sadıq yazır qəmli çağında,
Bülbüləm, gəlmişəm gül əyağında,
Hicran yedəyində, qəm dustağında,
Üzüldü taqətim, puç oldu, getdi.

## BƏNÖVŞƏ

Həsrətin çəkirəm ay ilə, ilnən,
Heç salmırsan, bizi yada, Bənövşə.
Sevgi sevgisinə şirin dilinən,
Doldurub gətirir badə, Bənövşə.

Bir ahu gözlüsən, dağlar maralı,
Haçan düşər könül səndən aralı,
Dolanırsan bir ovçudan yaralı,
Gəlibdi guşimə səda, Bənövşə.

Aşıq Sadıq mah camalın görəndə,
Sığa zülfün belə halın görəndə,
Əqli-huşun, tər kamalın görəndə,
Olmazmı yolunda fəda, Bənövşə?

## İGİD ODUR, YAMAN GÜNƏ DAYANA

Çox yollar gözlədim, könlüm intizar,
Gəlmədi bir yerdən Novruz sədası.
Fələyin zülmünə edibdi güzar,
Bu qəmli könlümün silinmir pası.

Məcnun Leyli deyib, çəkir nara hey,
Pərvanətək mən dolandım nara hey.
Yusif də Cahidə çəkdi nara hey,
Tez dada yetişdi qadir mövlası.

Aşıq Sadıq bu dərdlərə dayana,
Dərd əhlinə dərdim desən, dayana.
İgid odur, yaman günə dayana,
Yaxşı günə hamı edər həvəsi.

## FİKRƏT KÖRPÜLÜ
*(1966-2001)*

***Fikrət Körpülü 1966-cı ildə Qərbi Azərbaycanda – Barananın Yuxarı Körpülü kəndində anadan olub, ifaçı aşıq kimi tanınıb. Yeniyetmə yaşlarından aşıqlığa həvəs göstərib, saza, sözə sonsuz həvəsi onun aşıq kimi yetişməsinə imkan yaradıb. Aşıqlığın sirlərini dərindən mənimsəyən sənətkar "Qurbani", "Valeh və Zərnigar", "Abbas və Gülgəz", "Aşıq Qərib", "Məsum və Diləfruz" və s. dastanlarımızı da sinədəftər edib.***

***Aşıq şeiri tərzində bir sıra poetik örnəklər də yaradıb.***

### QOCALMAZMI

Vətənindən ayrı düşüb,
Qan-yaş tökən qocalmazmı?
Omru boyu eldən ötrü
Cəfa çəkən qocalmazmı?

İgidlərin, söylə, hanı,
Hey tökülür insan qanı.
Çərxi dönmüş bu dövranı
Belə görən qocalmazmı?

Dağılıbdır cah-cəlalım,
Şirm olundu dövlət-malım.
Körpülü tək bir mahalı
Əldən verən qocalmazmı?

Fikrətin ağardı başı,
Çünki görür yurd savaşın.
Babaların məzar daşı,
Qərib qalan qocalmazmı?

## ÜRƏYİMDƏN

Vətən, sənə həmdəm olmaq,
Yenə keçir ürəyimdən.
Sərin buzlu bulağından,
İçmək keçir ürəyimdən.

Koroğlu gəzdiyi oba,
Çinar, Dürmək, Qızılqaya,
Yekəyaldan hər bir yana
Baxmaq keçir ürəyimdən.

Bil, Fikrətdir mənim adım,
Körpülüdür əslim-zatım.
Orda qaldı cah-cəlalım,
Dövran keçir ürəyimdən.



## AĞBABA BÖLGƏSİ AŞIQLARI

***Azərbaycan aşıq sənətinin klassik ifaçılıq ənənələrini və təşəkkül dövrü repertuarını həssas bir mühafizəkarlıqla qoruyan Ağbaba aşıq mühitinin yerinə yetirdiyi tarixi vəzifə də bənzərsizdir.***

***Azərbaycan aşıq sənətinin ənənəvi musiqi repertuarı Ağbaba aşıq mühitində də ana axarı təşkil etmiş, bununla belə, bu mühitdə digər mühitlərdə müşahidə edilməyən xeyli sayda saz havası mövcud olmuşdur: "Ağbabayı", "Deyişmə", "Diyarbəkiri", "Qaracaoğlan", "Qurdoğlu", "Köşəbaşı", "İfxanı", "Güləndamı", "İsgəndəri", "Otalı", "Otuzbiri", "Xoşdamağı", "Çuxuroba", "Çıldır divanisi", "Çalpapaq", "Sümmani", "Şenlik Mirzəcanısı". Bu saz havalarının say çoxluğu və melodik zənginliyi Çıldır-Ağbaba mühitində bəstəçiliyə tarixən güclü meyil və marağın olduğunu göstərir.***

***Ağbaba aşıqlığı mühiti neçə-neçə tanınmış saz-söz sənətkarı yetirmişdir. Onların içərisində Xəstə Həsən uzun bir sənət yolunun binasını qoyan ustad kimi seçilir. XVIII yüzillikdə yaşayıb-yaradan bu qüdrətli söz sərrafı yüzlərlə aşıq şeirinin və bir neçə dastanının yaradıcısıdır. O, öz dövründə dəfələrlə Qul Qaranı, Usta Polad, Ömər, İrfani, Səfili kimi istedadlı aşıqlarla sənət yarışmasına girmiş və saz-söz xiridarı olduğunu sübuta yetirmişdir. Xəstə Həsənin sənət ocağı Ağbaba və onun yaxın çevrəsində yaxın zamanlara qədər davam etmişdir. Belə ki, usatd-şagird ənənəsi vasitəsi ilə bu ocağın saz-söz yatırı Xəstə Hasandan Aşıq Nuruya, Aşıq Nurudan Aşıq Şenliyə, Aşıq Şenlikdən Aşıq Nəsibə (Kor Nəsib), Aşıq Nəsibdən isə Ağbabalı Aşıq İssgəndərə və onun oğlu Faxfur Ağbabalıya təhvil verilmişdir. Bu sənətkarların digər şagirdləri olsa da, mərkəzi – aparıcı axar yuxarıdakı xətt üzrə getmişdir.***

## XƏSTƏ HASAN
***(1762-1866)***

***Çıldır-Ağbaba aşıq mühitinin yetirdiyi ustad sənətkarlardandır. Xəstə Hasanın yaşadığı dövrdə bölgədə Ürfani, Qul Qarani, Usta Polad, Küfdadi, Molla Xəlis, Aşıq Teyfi, Dəli Tammı və b. aşıqlar olub. Xəstə Hasan beş aşıqla – Aşıq Polad, Qul Qarani, Öməri, İrfani (Ürfani), Səfili ilə deyişib. Xəstə Hasanın Öməridən başqa adı çəkilən aşıqlardan hamısı ilə deyişməsindən nümunələr əldə var. Onlardan üçü – Qul Qarani, Aşıq Polad, Ürfani ilə deyişmələri daha geniş yayılıb. Xəstə Hasandan bəhrələnən Aşıq Nuru, Aşıq Şenlik, Aşıq Abbas, Aşıq Summani, Aşıq Mustafa, Aşıq Cebecili, Aşıq Zülalı, Aşıq İzani və b. bölgədə olduqca güclü bir mühit yaratmışlar… XX yüzillikdə Çıldır-Ağbaba aşıqlarının yolunu Kor Nəsib, Aşıq İslam Ərdənər, Aşıq Şenliyin oğlu Aşıq Qasım, Aşıq İsgəndər, Aşıq Murtuza, Aşıq Şərəf Taşlıova və b. davam etdiriblər.***

### ÜSTÜNDƏDİR

Bu dünya belə qurulmuş, dövlət-var üstündədir,
Ərül-qərül mal qazanır, tarımar üstündədir.
Adəm ata, Həvva ana atdılar ol cənnəti,
Qorxuram ki, aldanalar, şeytan şər üstündədir.

Bir anadan törəmişik, başqa-başqa dilimiz,
Yarın Haqqın divanında həp bir olur halımız.
Göz görəmməz, ayaq tutmaz, nə çətindi yolumuz,
Üstü körpü, altı qazan, o da nar üstündədir.

Xəstə Hasan, sözlərimi dinləyənə nəsihət,
Yatanda eylə salavat, qalxanda et vəsiyyət.
Göydən yağmadı rəhmət, yerdən qalxdı bərəkət,
Keçdi günüm, doldu sinnim, ixtiyar üstündədir.

## BİRDİ, BİR

Bizi yoxdan var eyləyən, Qəni Sübhan birdi, bir,
Abu, atəş, xaki, baddan xəlq olan can birdi, bir.
Bir qətrədən xəlq eləyib on səkkiz min aləmi,
Canlı-cansız hər nə varsa, küllü cahan birdi, bir.

Bir budaqda beş alma var, birisi şikəstədi,
Otuz hacı, yeddi dərviş, birisi güldəstədi.
Üç yüz altmış beş rüzgarı on iki bürc üstədi,
Gecə-gündüz gərdiş eylər, mahitaban birdi bir.

Xəstə Hasan sözlərini yəqin alıb, verəcək,
Bizi yoxdan var eləyən  qılı qıldan seçəcək.
Məğribdən məşriqə, hamı o divana köçəcək,
Padişahlar padşahı hökmü-sultan birdi, bir.

## BAX

Bizi yoxdan var eləyən ol şahi-dildara bax,
Abı, ataş, xaki, baddan xəlq olunan insana bax,
İnsan üçün layiq bildi cənnəti rizvanını,
Onun qəsdi-qərəzi olan ol məlun şeytana bax.

Haqq-taladan nida gəldi “İncil” endi İsaya,
“Zabur” Davuda verildi, “Abu Tövrat” Musaya.
Məhəmməd durdu qıvlaya, Məryəm girdi kilsəyə,
Məhəmmədin hümmətinə oxunan Qurana bax.

Hasan deyər, qiyamətdə suru çalan kim oldu?
Əzrayıl ki, can alandı, onun canın kim aldı?
Gələndə ölüm bazarı, tarixlər tamam oldu,
Xudam qismət eləsə, beş əşrə Qurana bax.

## MƏN

Səyyad oldum, seyrə vardım, tor qurdum tərlana mən,
Getdi qışım, gəldi yazım, dönmüşəm gülşənə mən.
Çəkərəm gül minnətini bir qönçə gül eşqinə,
Səhra gəzdim, dağ dolandım, sığınnam Sübhana mən.

Üç ay yazdı, üç ay yaydı, üç ay payız, üç ay qış,
Olmuşam leyli-nahar intizarı, sırxapiş.
Əl götür feli-fəsaddan, axirət üçün bir çalış,
Ay ağalar, bənzərəm bu dünyada mehmana mən.

Xəstə Hasan elə cövrə, söylə, necə dayansın,
Böylə dönsün çərxi-gərdiş, dövran belə dolansın.
İsrafil surunu çalsın, cəmü məxluq oyansın,
Uyaram o məxluqata, gələrəm nizama mən.

## GEDƏR

Ayaq kəsmə dost kuyindən, nazlı yar əldən gedər,
Naşı bağban bağ bəsləyib heyva, nar əldən gedər.
Aşnanın tərğini qılıb, meylini vermə yada,
Yad gəlib aşna olunca, aşna yar əldən gedər.

Gecə-gündüz gün dolanar, gərdiş eylər ayınan,
Ağ üzündə qoşa xallar düzülübdü sayınan.
Məğrurlanma dəli könül, hər gədaynan,
Bir gün olar, dövran dönər, dövlət-var əldən gedər.

İstə səni istəyəni, keçmə ondan heç necə,
Nazlı yar qəzəbə gəlib, ələ gəlməz heç necə.
Xəstə deyər, saxla məni, Haqq qonağı bir gecə,
Ay dolanıb illər keçər, ixtiyar əldən gedər.

## AĞI GÖZLƏR

Bəyzadələr məclisinə gələndə,
Ağlı kamil olan a yağı gözlər.
Ustadından nəsihət alan kimsələr,
Ağlı kamil olan a yağı gözlər.

Dəli könül, öz yerində paşasan,
Qanlı fələk, kimi qoydun yaşasın?
Ay anlamaz, niyə çıxdın başa sən?
Ağlı kamil olan a yağı gözlər.

Xəstə Hasan dəryalara dalanda,
Şirin canı eşq oduna salanda,
Ömür keçib, vədə tamam olanda,
Bu yazıq canım ay ağı gözlər.

## OYNAMASIN

Geyinib-kecinib toya gedənlər,
Amanat, amanat qız oynamasın.
Cavandı, oynamaq ona xoş gedər,
Yüngüllük eyləyib, tez oynamasın.

Yad-yağılar əyri-üyrü baxarlar,
Ağ əllərə əlvan həna yaxarlar,
Töhmət edər, başımıza qaxarlar,
Kəlağay altından göz oynamasın.

Xəstə Hasan deyər, alagöz yarım,
Sənə qurban olsun dövlətim, varım.
Demirəm, oynamasın, oynasın yarım,
Ədalı-işvəli naz oynamasın.

## QIZLARIN

Fəsli bahar, yaz ayları gələndə,
Açılar qoynunda gülü qızların.
Tumurcuq-tumurcuq tər buxağından,
Axar ləblərindən balı qızların.

Hürülərin, pərilərin eşisiz,
Bu qərib könlümün qəm yoldaşısız,
Əlli qızın, yüz gəlinin başısız,
Qucmağa yaraşır beli qızların.

Xəstə Hasan, öldüyümü bilsələr,
Səlib verib səlatımı qırsalar,
Məzarımı yol üstündə qursalar,
Gələndə uğrasın yolu qızların.

## GÖZƏLLƏR

Gözəllər dərgahına uğradım,
Birər-birər bəri varın, gözəllər.
Bəriyə varanda can təzələnir,
Haqq veribdi bu güzarı, gözəllər.

Kiminiz xınalar əzdirin üzə,
Kiminiz şəkərlər qatdırın sözə,
Üz tutub nəzərlər çevirin bizə,
Sevindirin dostu-yarı, gözəllər.

Xəstə Hasan deyər, dürdü sözümüz,
Gözəllərdə qaldı iki gözümüz,
Baxa-baxa bir aşığa  üzümüz,
Yetirməyin zəhrimara, gözəllər.

## MAŞALLAH

Təzədən bir gözəl çıxdı aləmə,
Yanağı  gül, buxaq lala, maşallah!
Onun gözəlliyin aldım qələmə,
Bədr sifət, ay camala maşallah!

İsmin Mələkdir, yoxsa Salatın,
Xətəmin zərnişan, sırması altun,
Qaldır, niqabını aç, Güləbatın,
Dal gərdəndə sarı telə, maşallah!

Xəstə pir əlindən içibdi bada,
Gözəllər yolunda gedərəm bada,
Daha tərif olmaz bundan ziyada,
İndi baxdı gülə-gülə, maşallah.

## MUYLARIN

Mənim sonam cilvə verib özünə,
Darayıb, gərdənə tökər muyların.
Görən həsrət, görməyənnər qiyamət,
Bu qədər sitəmə yetər muyların.

Şan verib şanədən, cığalı başdan,
Yan verib yanınnan, tökülüb döşdən,
Müjgan kirpiklərin o qələm qaşdan,
Enər dal gərdənə yatar muyların.

Xəstənin sevdiyi növbahar fəsli,
Binadan gözəldi onnarın nəsli,
Necə yaxdı xan Kərəmi xan Əsli,
Məni də yandırar betər muyların.

## DADIMA MƏNİM

Çox şükürlər olsun şahlar şahına,
Yetişdi bu halda dadıma mənim.
Göndərdi, üstümə gəldi ərənlər,
Bir sevgi saldılar yadıma mənim.

Torpaq verdi mənə, bir gözəl yeyim,
Yoxdu simli sazım, mən sizə deyim,
Əynimə geydirdi qəm paltar – geyim,
"Xəstən"i artırdı adıma mənim.

Pirlər məndən qat-qat dəri soydular,
Söylətdilər, söhbətimdən doydular,
Mənim adım Xəstə Hasan qoydular,
Dedim, Haqq yetişsin dadıma mənim.

## BAX BİRİSİNƏ

Əvvəl dörd kitabdan, hər bir hesabdan,
Siftə qələm çalmış Hax birisinə.
Kəbeyi-şərifdə, Sami mehrabda,
Oxuyur katiblər: bax, birisinə.

Əzizim, Həbibim "Ya Rəsul", – dedi,
Əyyub dərdə düşdü, "yara sil", – dedi.
Axdı qanlı hicran, "yarasil", – dedi,
Niyə nəhlət endi, bax, birisinə.

Xasta Hasan deyər: bir budaq üstə,
Bayqunun məskəni bir budaq üstə.
İki alma bitmiş bir budaq üstə,
Biri şöylə verdi, bax birisinə.

## BİR GÜNƏŞ

Yetişdi hesablar, doldu mətləbə,
Şükür, üstümüzə çatdı bir Günəş.
Çılpaqdı cəsədim, zəifdi atım,
Genə derlər, min, dağları bir gün aş.

Nə oğuldu, nə uşaqdı, nə bala,
Nə xətadı, nə qəzadı, nə bəla.
Könlüm yoxdu nə şikəstə, nə bala,
İstədilər içirələr bir gün aş.

Baxtı siyah taleyində olduğun,
Açammazlar bağladığın ol dügün.
Eşitsələr, Xəstə Hasan öldügün,
Çağırarlar, gəl, məzarı bir gün aç.

## GÖZƏL

Ömrü bada verdin, günü talana,
İndi sən ömrümün ayağı, gözəl.
Sənnən qeyri mənim yeyib-içdiyim,
Tamam mənə oldu ay ağı, gözəl.

Get bazara, gəl qəbrini qazana,
İyid odur, malı özü qazana.
Qurtarıbdı, su tökginən qazana,
Otur, biç kəfənim, o ağı, gözəl.

Xasta Hasan deyər: xasta sinnidi,
Gey-qurşan əyninə, xasta sinnidi.
Ölüm Haqdan gələr, xasta sinnidi,
Gəl, kəsmə üstündən ayağı, gözəl.

## QARA HEY
*(cığalı təcnis)*

Mən deyirəm, bu dünya da beş gündü,
Mən bilirəm beşini də qara, hey!
    Mən aşığam, qara hey,
    Oxu dərsin qara, hey.
    Seyrağubu görmüşəm,
    Qamətini qara, hey.
Sağlıq xəbərimi yara versələr,
Dost sevinər, düşmən geyər qara, hey.

Xəstə düşdüm, döşək ilə dər saldım,
Cəfa çəkdim, dünya üçün dər saldım.
    Eyləmi, dərs aldım,
    Eşiyinə dər saldım.
    Eşitdim seyrağub gəlir,
    Onun üçün dərs aldım.
Ağlı kamil bir ustaddan dərs aldım,
Oxumuşam əlif, əbcət, qara, hey.

Bayqu məskən salıb, yara deməzlər,
Leylidən Məcnundur yara, deməzlər.
    Aşıq, yara deməzlər,
    Sirri yara deməzlər.
    Sizlərdə necə qaydadır,
    Dərdə çara deməzlər.
Xəstənin öldüyün yara deməzlər,
Baxarsan ki, məzarımdı qara, hey!

## ƏYRİ

Bu gün mən bir pəri gördüm:
yerir, yürür, gəzər əyri.
Tut yükünü, al bacını,
qurma mənnən bazar əyri.
Ovçusan, ovun gözlə,
qoymaginən, gəzər əyri.
O səbəbdən yaş gözümdə
durmaz, gələr, axar əyri.
Sənəm əyri, sonam əyri,
cəhənnəmtək yaxar əyri.

Hər kimin dövləti çoxsa,
bu dünya mənəm, - deyər,
Hər kimin dövləti azsa,
çörəyini yavan yeyər.
Hər kimin dövləti yoxsa,
ah-zar edər, "ax-vay" söylər.
O səbədən yaş gözündə
durmaz, gələr, axar əyri.
Sənəm əyri, sonam əyri,
cəhənnəmtək yaxar əyri.

Gecələri çox uzundur,
yata bilməm, yerim dardır.
Dönərəm o yan-bu yana,
heç bilmirəm nə xəyaldır.
Mənə derlər, Xəstə Hasan,
sevdiyin çox zülümkardır.
O səbədən yaş gözündə
durmaz, gələr, axar əyri.
Sənəm əyri, sonam əyri,
cəhənnəmtək yaxar əyri.

## QARANİ
*(XVIII əsr)*

***Qarani Çıldır-Ağbaba aşıq mühitində yetişmiş ustadlardandır. Şeirlərinin az bir qismi günümüzə gəlib çatıb. Xəstə Hasan, Urfani, Usta Polad, Molla Xəsis, Öməri, Səfili və başqaları ilə sıx sənət əlaqələri olub. Mənbələrdə Qul Qarani imzası ilə daha çox tanınır. Deyişmələri, əlimizə gəlib çatan şeirləri dövrünün ustad sənətkarlarından olduğunu göstərir. Xəstə Hasanla sıx əlaqələri olub, onunla deyişmələrindən örnəklər günümüzə gəlib çatıb.***

### BAX

Ey könül, oyan qəflətdən, o dəm bu dövrana bax,
Hər səhər tezdən ərşə çəkilən ol karvana bax.
Göydə mahdı, yerdə murğu, onun ixtiyarı var,
Dünya heç kəsə qalmadı, hanı, Süleymana bax.

İbrahim ki, oğlunu apardı kuhi-Ərəfata,
Dedi, ata, qolum bağla, düşmə çətin əzyətə.
Xışmla bıçağı çəkdi ol Həcər-ül Əsfətə,
Kim gətirdi, kim götürdü ol qoçu, qurbana bax.

Otuz iki fərz içində oxunanı bilməli,
Sayminə səcdə et də, həm salavat qılmalı.
Qarani yüz yaşasa da, axır bir gün ölməli,
Bizi yoxdan var edənin yazdığı fərmana bax.



## ÇILDIRLI AŞIQ ŞENLİK
*(1853-1912)*

***Aşıq Şenlik Çıldır-Ağbaba aşıq mühitinin yetirdiyi ustad sənətkarlardandır. Erkən yaşlarından saza, bədahətən söz deməyə meyilli olub. Əsl adı Həsəndir. Sonralar "Şenlik" adı ilə məşhurlaşan Həsən Aşıq Nurunun yanında şagird olub, sənətin sirlərini ondan öyrənib.***

***Aşıq Şenlik ömrünün böyük hissəsini Borçalıda, Çıldırda keçirib. Onun şeirləri 1920-ci illərdən Azərbaycan mətbuatında çap olunmağa başlayıb. "Lətif şah", "Sövdəgar şah və Gülnaz", "Salman bəy və Durna", "Səməd bəy", "Məhəmməd və Güldanə", "Əhməd və Gözəl" dastanları da vardır.***

***Ustadnamələri Çıldır-Ağbaba, Borçalı və Qars bölgələrində geniş yayılıb.***

### MƏNƏM

Düşmüşəm qəm dəryasına, ummanda üzən mənəm,
Röyada çərxi aləmi dövr edib gəzən mənəm.
Dərsim aldım pünhandan, əyana çıxmaz sirrim,
Əhli mərifət, xoş nəsihət, cəvahir lisan mənəm.

Səmada məxluqat gördüm, nəzmidir nur dənəsi,
Çıxmaz ərşə, enməz xaka, incidəndir binası.
Yirmi dörd sahat, min dörd yüz qırxdır mənası,
Birində min kərə Haqqa şükr edər insan mənəm.

Nə layiq ki, məni deyib, arzulayıb gələsən,
Divanı aləm içində imtahana salasan.
Desələr ki, Səfil Şenlik, sən bir əzim qalasan,
Rütbəm ərşə dirək olsa, xak ilə yeksan mənəm.

## GƏLƏR

Dərd eləmə, cavan oğlan, hər gələn Haqdan gələr,
Günlər ötər bircə-bircə, qaradan-ağdan gələr.
Qovun-qarpız bostandadı, meyvələr bağdan gələr,
İsti-xəfə aran yerdən, sərinlik dağdan gələr.

Yetimliyin ayıb deyil, qəlbin olsun çox geniş,
Ərin yolu yoxuş olar, orda çox olmaz eniş,
Yüz kərə qəmə batarsan, şad olarsan bir dönüş,
Sözün safı, ən lətifi ürəyi sağdan gələr.

Qul Şenliyin düz söyləyər, həqiqəti düz deyər,
Haqqı sevər, aqilləri tərif edər, yüz deyər,
Yaxşı olar axrın sənin, tanı "bəndəm, döz", - deyər,
Yol açılar, sədan sənin soldan, həm sağdan gələr.

## MƏN

Dərdim ondur, doqquzunu söyləmərəm əğyarə mən,
Səkkizində bir arzum var, yeddiyə avarə mən.
Beş mənim kəsbkarımdır, dördə qıldım təmənna,
İkiyə məhəbbətim var, yalvarıram birə mən.

Otuz iki dərdim vardır, qırx səkkiz dəva ilə,
Üç yüz altmış altı bürcə çıxdım üç səhra ilə.
Çardır məzhəb, çardır kitab, çar könül sevda ilə,
Təsdiq və ilqar eylədim, varmadan inkara mən.

Əlli dörd fəzlin içində dəmim var, dövranım var,
Yetmiş min məzhəb içində bir Şahi-hübanım var.
Altı min altı yüz altmış altı dərd-dərmanım var,
Şenliyəm, ta ərşə qədər yar oldum o yarə mən.

## BİR

Dəli könül, abad olmuş, qış da birdir, yaz da bir,
Dolandım dağı, səhrayı, çöl də birdir, düz də bir.
Meylimi vermişəm Haqqa, uğraşır turab ilə,
Bütün dünya mənim olsa, çox da birdir, az da bir.

Əyyami təğayyür görən pərişan olur halı,
İnsana dərd gətirir nadanın qalmaqalı.
Dərini dayaza qatar, tanımaz xası, xamı,
Ağlı nöqsan bikamala şəb də birdir, duz da bir.

Dəli könül dalğalandı dəryayi-ümman kimi,
İstərəm, zəmini atam Urustami-Zal kimi,
Yüklənibsən el malını, daşıyıb hambal kimi,
Sənin kimi benəvaya şal da birdir, bez də bir.

Mövlam min il ömür verdi, Adəmi saldı aha,
Yeddi yüz əlli Şid yaşadı, doqquz yüz əlli Nuha.
Dedilər ki, Səfil Şenlik, aç gözünü, bax raha,
Bu dünyanın sonu boşdur, gec də birdir, tez də bir.

## MƏNDƏDİR

Əylən, usta, xəbər verim bürclər yıxan məndədir,
Yeddi iqlim, dörd köşənin bəndin sökən məndədir.
Səksən min şeyx,  övliya, doxsan mini üləma,
Gəzmişəm bürcü-mehrabı, şahrah məkan məndədir.

O ki gövhər mətahısan, məclisdə qur bağını,
Zağ nə bilir gülün qədrin, bülbülə ver tağını,
Bir töhmətli söz deyərəm, pozaram növrağını,
Qamətin tarimar edib, qəddin bükən məndədir.

Səfil Şenlik bir lisanı tapdı imran dil ilə,
Açıb eşqin ümmanını, qarşılaşsaq sel ilə,
Çox nabələd aşıq gördüm, gəzməz doğru yol ilə,
Əhli-mərifət ustalar dara çəkən məndədir.

## DURUR

Bir künbəz qalxdı havaya, minarəsi tuş durur,
Bir gəmi endi dəryaya, rəisi yox, boş durur.
Onu ümmana qərq etmək mənim köhnə peşəmdir,
Önümüzdə görüləcək neçə yüz min iş durur.

Gəl görüm, dərdli seyraqub, nə fitneyi-feldəsən,
Açma hicab pərdəsini, tut üzünə pərdə sən.
Aslanlar fəth edən könül, indi nə xəyaldasan?
Məclisimdə meydan alıb, kor yapalaq quş durur.

Əsilsizə fürsət vermək nə hiyleyi-şər imiş,
Südü xarab kimsələrlə danışması zor imiş.
Səfil Şenlik qorxdu, qaçdı deyənlər də var imiş,
Hanı, görünməz gözümə, diblərə sinmiş durur.

## CALASAN DA

Keçən günə gün çatammaz,
Günü-günə calasan da!
Dərdli adam gecə yatmaz,
Şirin layla çalasan da!

Öz dərdini özün üyüt,
Alma, heyva verməz söyüd.
Anlamazlar almaz öyüd –
Şahmar olub çalasan da.

Səfil Şenlik ağlar, gülməz,
Nanəciblər dostu bilməz.
Fani dünya sənə qalmaz,
Altun verib alasan da.

## DÜŞMANA

Əhli-islam olan eşitsin, bilsin,
Can sağ ikən yurd verməriz düşmana.
İstər ki, Uruset nə var ki, gəlsin,
Can sağ ikən yurd verməriz düşmana!

Qurşanın qılıncı, geyinin donu,
Qovğa buludları sardı hər yanı,
Doğdu qoç iyidin şan almaq günü,
Can sağ ikən yurd verməriz düşmana!

Əsgər olan bölük-bölük bölünər,
Qars qalası, sandızmı ki, alınar,
Boz atlar üstündə qılınc çalınar,
Can sağ ikən yurd verməriz düşmana!

Qovğa günü namərd səfa yer arar,
Ər olan, köksünü düşmana gərər,
Cəmi ərvah biznən meydana girər,
Can sağ ikən yurd verməriz düşmana!

Hələ Alosmanın görməyib zorun,
Din qeyrəti olan, tədarük görün!
At təpin, baş kəsin, qazağı qırın,
Can sağ ikən yurd verməriz düşmana!

Şenlik, nə durursan, atdarı minin,
Sıyra qılınc düşman üstünə dönün!
Artacaqdı şanı bu Alosmanın,
Can sağ ikən yurd verməriz düşmana!

## GÖRÜBDÜ

Necə söz deyəsən qəm ərbabına,
O da sənin kimi zəri görübdü.
Dindirəndə haldan olar xəbərdar,
Cəbrə düşüb, hər əfkarı görübdü.

Dost dostuna etsə iqrar imanı,
Qiyamətə gedər müddət zamanı.
Könül uman yerdən kəsməz gümanı,
Çün əzəldən etibarı görübdü.

Şenliyin zehnini verməyin zaya,
And verirəm, o yaradan Xudaya.
Bel bağlama dövrü keçən gədaya,
Neçə əyyam ruzigarı görübdü.

## İSTƏR

Yenə könül quşu pərvaz eyləmiş,
Dövr edib qonmağa bir budaq istər.
Bəzənib gözəllər göy çəmənlərdə,
Bəzən də türfayə bir otaq istər.

Yağışda, yağmurda, qarda, boranda,
O dağlar eşqinə yanar bir yanda.
Yayın isti çağı bürkü vuranda,
Yanları yarpızlı bir bulaq istər.

Bəzən həddən aşar mənim məlalım,
Bəzən bulaq kimi durular halım,
Bir mələk eşqiylə Şenlik xəyalım,
Dünya yaşadıqca yaşamaq istər.

## ÇƏKƏR

Sevda sitəmindən cismim səd parə,
Qəm ləşkəri bu hicrana mil çəkər.
Loğman-təbib olub, sağaltsa yaram,
Kim bilir, müddəti neçə il çəkər?!

Hicran alayları doymaz qanımdan,
Görən ibrət alar Nuh tufanımdan.
Cəllad kimi tutub gireyvanımdan,
Nə alar canımı, nə də əl çəkər.

Şenliyin fəryadı yeksan-xak kimi,
Salıbdı lərzəyə qəm əflakımı.
Məndə olan dərdin hicran yükünü
Nə kirədar daşır, nə də fil çəkər...

## GETDİ

Necə ağlamayım, necə yanmayım,
Sonam, düşdü məndən aralı, getdi.
Bir ox atdı, sinəm san-şan eylədi,
Sağı cismim yandı, paralı getdi.

Hicran qəhrindəyəm, bağlıdı qolum,
Sevda həsrətindən qalmayıb halım.
Canıma susayan o qanlı zalım,
Məni qoydu qəmdə, yaralı getdi.

Sanki bir mələkdi əlvanlı donda,
Pürrü pərvaz eylər hərə bir yanda,
Şenlik der, taqətim qalmadı canda,
Kəsildi səbrimin qərarı, getdi.

## BİR YARA
*(cığalı təcnis)*

Eşq odunnan ataş alıb yanıram,
Ərzi-halım yetirsəniz bir yara.
Əzizinəm, bir yara,
Bir hicrandı, bir yara,
Dərd bilən təbib gəlsə,
Məlhəm sevər bir yara.
Gecə-gündüz ahu-fəryad eylərəm,
Leyli-nahar intizaram bir yara.

Varmı mən tək şamu-səhər ləliyən,
Şirin canı eşq oduna talıyan.
Əzizinəm, talıyan,
Talan düşüb talıyan,
Deyirlər, murad alar,
Haqqdan dilək diliyən.
Məni belə dəli dərviş eliyən,
Bir hicrandı, bir əfkardı, bir yara.

Qul Şenliyəm, qara baxtım ağ deyil,
Sinəm üstə çalın-çarpaz dağ deyil.
Əzizinəm dağ deyil,
Düyün deyil, dağ deyil,
Keçdi dövrü-zamanə,
Zatı münkir sağ deyil.
Var əndamım başdan-başa sağ deyil.
Yüz min yerdən şan-şan olub bir yara.

## BİR YANA
*(cığalı təcnis)*

Ala gözlüm, məni Məcnun eylədin,
Xumarranıb sərxoş baxma bir yana.
        Əzzinəm, bir yana,
        Dara zülfün bir yana,
        Sən od saldın könlümə,
        Qorxuram ki, bir yana.
Əğər bənd olmasam zülfün telinə,
Baş götürrəm bu ölkədən bir yana.

Haqqın əmri, ikrarı var bu canda,
Üzər nəfis çarxı müddət bu canda.
        Əzizinəm, bu canda,
        Bu cəsəddə, bu canda,
        Məlakül mövt yeksanı,
        Qılar mənə bu canda.
Çox çəkmişəm cəbri-cəfa bu canda,
Göz önündən pünhan olma bir yana.

Biçarə Şenliyin gəlmir qərarı,
Sevda damu yanar narı qararı.
        Əzizinəm, qərarı,
        Qəhir çəkən qərarı.
        Sinəm evgah yayladı,
        Səfalansam qərarı.
Səbirsiz könlümün gəlmir qərarı,
Kərəm qılıf, gedəm basma bir yana.



## ÇORLU MƏHƏMMƏD
*(1860-1940)*

***Çorlu Məhəmməd Ağbaba mahalının Sultanabad kəndinə yaşayıb. Dövrün bütün müsibətlərini gözləri ilə görüb, şahidi olub. O, Aşıq Şenliyin şagirdi olub, əvvəlcə ustadı Aşıq Şenliklə, sonra isə sərbəst şəkildə ağır məclislər keçirib. Məclislərdə klassik sənətkarların, ustadının və özünün şeirlərini oxumağa üstünlük verib. Ömrünün axır vaxtlarında onun gözləri tutulub.***

***Çorlu Məhəmmədin çoxlu qoşma, gəraylı, təcnis, divani və müxəmməsləri olub. Xalq arasında haqqında maraqlı əhvalatlar, hekayətlər danışılır.***

### ELƏ

Ərş-əlaya bir yolum var, Tanrı, yolu rast elə,
Nur elə ki, kövrək könlü al əlinə məst elə.
Barilahi, işim müşkül, ətəyindən tutmuşam,
Nainsafı arxada qoy, huşunu al, süst elə.

Bağışlayan kərəmlisən, səhvi bizə bağışla,
El dolanan bir abdala, əhli-sözə bağışla,
Bir cavandı bir gül kimi, salma düzə bağışla,
Bir qocaya dayaq olsun, bir yaşlıya dəst elə.

Məhəmmədəm, dara düşdüm, yetiş ağam, dada tez,
Qıyma burda bir igidə, gələr betər qada tez.
Bağrım yandı, sinəm yara, atma məni oda tez,
Bu el ilə, bu obayla yarıt, məni dost elə.

## ŞENLİKSİZ

Gələn gedər bu dünyadan, qalan olmur, kam alan az,
Şörəyel, Çıldır, Ağbaba qan ağlar, qaldı Şenliksiz.
Dağlar yetim, ellər yaslı, matəmə batıbdı necə,
Qəm ləşgəri hücum edib qəlbləri aldı Şenliksiz.

İrəvanda zəhərləndi, niyə qıydılar ustada,
Namərdin adıyla oldu, Tanrıdan gəlmədi qada.
Dar günündə bir kimsənə, bircə kəs yetmədi dada,
Şəyirdləri el dolandı, dağa haray saldı Şenliksiz.

Məhəmmədim nalə çəkdi, arana, həm dağa döndü,
Əyildi, qəddi əyildi, yay kimi yumağa döndü,
Gördü bir Nəsiflə qalıb, sağa döndü, sola döndü,
Çorlu yanıqlı oxudu, Nəsif, saz çaldı Şenliksiz.

## ZİYARAT

Son gəlişdi, gəldim sənə dolandım, öpdüm daşını,
Ellərimin ümid yeri, şöhrəti-şanı Ziyarat.
Saf suyundan içən bilər bu dünyanın səfasını,
Ağbabanın, həm Çıldırın varlığı, canı Ziyarat.

Kaloğlanla Aşdıbaba sağında-solunda durur,
Sarp qaya tək zirvədəsən, üzündə-gözündə durur.
Əski türkün tarixisən, ürəyim sevinclə vurur,
Gül-çiçəyin dəniz kimi, yaşıl dörd yanı, Ziyarat.

Məhəmmədəm, özüm kimi Tanrı qulu görməmişəm,
Sənin kimi cah-calallı, qoynu dolu görməmişəm.
Bu yerlərdə səndən uca, səndən ulu görməmişəm,
Bizim bu qəlbi dağların sultanı-xanı Ziyarat.

## HEYDƏR MƏMMƏDOV
*(1867-1949)*

***Heydər Kərim oğlu Məmmədov 1867-ci ildə Ağbaba mahalının Düzkənd kəndində anadan olub. O, üç yaşında olanda atası vəfat etdiyindən əmisi Məşədi Rəcəbin himayəsində yaşayıb. 25 yaşında ona yuxuda İstanbulun yaxınlığında yerləşən Dəyirman kəndindəki Süleyman bəyin qızı Bəyaz xanım buta verilib. Amma Heydər Bəyaz xanıma qovuşa bilməyib.***

***Aşıq Heydər Aşıq Şenlik, Aşıq Nəsib və Çorlu Məhəmmədlə yaxın dost olub. Onun sözləri dillərdə dastan olub və bir qismi bu günümüzə kimi gəlib çatıb.***

***O, el şairi olmaqla bərabər kirkirə, dibək-salğar, cəhrə, yun darağı, ağacdan qaşıq, qəlyan, müştük yonub hazırlamaqda da mahir sənətkar kimi tanınıb.***

***Aşıq Heydər 1949-cu ilin mart ayının 19-u Düzkənd kəndində vəfat edib.***

***"Bu yan Ağbabadı, o yan Çıldır, Qars" adlı kitabı 2007-ci ildə çap olunub.***

### MƏNƏM
*(divani)*

Dəymə, fələk, dəymə mənə, ümmanda qərq olan mənəm,
Hicri-qəmin qucağında, dəryada qərq olan mənəm.
Düşmüşəm qəm dəryasına,dinib-danışa bilmirəm,
Gözlərim baxmır sözümə, sellərdə qərq olan mənəm.

Qəm mülkünün paşasıyam, virandı könlümün mülkü,
Ax, ay zalım, zalım, zaman, yıxmısan binəmi, bil ki!
Gəlin görün nə haldayam, bəyənmir aslanı tülkü,
Sönüb könlümün Günəşi, tufanda qərq olan mənəm.

Dindirməyin məni, ellər, yaram sağalmaz yaradı,
Danışmağa halım yoxdu, hər yerim para-paradı.
Desələr ki, Aşıq Heydər, bir topdağıtmaz qaladı,
Qızıldan taxtım olsa da, yeksanda qərq olan mənəm.

## ANA

Haqq işinə qarşı getmə,
Məni oda atma, ana.
Bu sevda Haqdan gəlibdi,
Ayıq olnan, yatma, ana!

Mənim başımı əydirmə,
Görən gözümü oydurma.
Məni qəm ilə doydurma,
Yollarımı tutma, ana!

Bu sövdadan dönmək olmaz,
Sal qayadan enmək olmaz.
Eşq yolunda sönmək olmaz,
Qollarımı çatma, ana!

Yazı yazan yazıb bunu,
Tanrıya tutsan bir yönü.
Bu eşqin görünmür sonu,
Günaha, gəl batma, ana!

Oğlun Heydər aşiq olub,
Gül rəngi saralıb solub!
Qəlbim ağlar, gözüm dolub,
Gəl başımı qatma, ana!

## OLSA DA

Ülgücə ülgüc deyərlər,
Kəsəri lap çox olsa da.
Mərdin dərdi böyük olar,
Gözü-könlü tox olsa da.

Mən nərəm deyən bərbər də,
Əsib-coşur xəlvət yerdə.
Arada saxlamaz pərdə,
Edər pislik, yox olsa da.

Heydər deyər, gədə pisdi,
Əlimdəki cam da misdi.
Bilməz soyuq, bilməz isti,
Sözü acı ox olsa da.

## VƏDƏSİDİ

Xal düşübdü yamac-yala,
Qar gedir, yaz vədəsidi.
Sevənlərə xəbər olar,
Gözəl avaz vədəsidi.

Nə gözəldi dağın döşü,
Danaqıran, mollabaşı,
Deyir, yola saldıq qışı,
Qızların naz vədəsidi.

Heydər, əsir dağın yeli,
İş-gücə tərpədir eli,
Çayın, gölün, suyun, selin,
Ördəklə qaz vədəsidi.

## AĞLASIN

Sallana-sallana gələn gözəlin,
Dördü qahqah çəksin, biri ağlasın.
Bir azca toxdasın, gəlsin özünə,
Verməsin özgəyə sirri, ağlasın.

Çıxarsın qaranı, geyməsin qara,
Qara olan salıb onu azara.
Al-yaşıl geyinib çıxsın bazara,
Dərdi olan gəlsin bəri, ağlasın.

Aşıq Heydər deyər, hər vaxt gördüyün,
Kor olsun düz işə salan kor düyün.
Allah qismət etsin barı toy-düyün,
Adını deyirəm, Pəri ağlasın.

## DOLANAR

Gətirməz dünyada kasıbın işi,
Nə olsun, hər yanda uzaq dolanar.
Qurumaz hər zaman gözünün yaşı,
Yediyi qarınla pazax dolanar.

Fələyin qanunu yazılıb belə,
Çirkin-pis tuş olar türfə gözələ.
Fağırın könlünü kim alar ələ?
Demək-gülmək ona yasaq, dolanar.

Dünya görən bilir ovandı-tərsi,
Kənd-kənd dolaşmışam Çıldırı, Qarsı.
Pirim pünhan yerdə veribdi dərsi,
Demə, Aşıq Heydər qaçaq dolanar.

## AY AĞA
*(təcnis)*

Dindirməyin, halı müşgül olmuşam,
Fələk məni başdan salıb ayağa.
Sevda sinəm üstə vurub səd yara,
İlim bir qərinə, gün olub ay, ağa.

Hicran dağı çəkib yala hasarı,
Gurum-gurum, yaraları ha sarı.
Görəydim mah camalını ha sarı,
Bircə dəfə üz sürtəydim ayağa.

Xumarlanıb sərxoş baxma bu yana,
Sərkərdən gəzirəm mən yana-yana.
Biçarə Heydəri az danla, yana,
Salma məni nəzərindən, ay ağa!

## KİMDƏDİ

Nə ucadı, nə alçaqdı, bu məqamlar kimdədi,
Gözəl işlər, gözəl peşə, böyük namlar kimdədi?
Pul oduna ömür verən, nə qazanar dünyada,
Haqq atəşi, üzün nuru, dolu camlar kimdədi?

Vari-dövlət qızıl-gümüş, ləlü-kövhər nə şeydi,
Nədi, söylə kişi işi, bu dünyada nə yeydi,
Qara saçı nə ağartdı, əlif qəddi nə əydi,
Ağır məclis şirin söhbət, qara damlar kimdədi?

Mərd dediyin neçə kəsdi, işi-gücü yoxdumu,
El içində yeri-yurdu, varı-yoxu çoxdumu,
Mala-pula meyl eyləmir, harda qurub taxtını,
Aşıq Heydər sual eylər, şirin dəmlər kimdədi?

## AĞBABALI AŞIQ NƏSİB
*(1874-1944)*

***Aşıq Nəsib 1874-cü ildə Ağbaba mahalında, Amasiyanın Güllübulaq kəndində anadan olub. Ağbaba-Çıldır aşıq mühitinin nümayəndəsidir. Aşıq Şenliyin şagirdi olub. Uşaqlıqda çiçək xəstəliyinə tutulduğundan gözləri görməyib, xalq arasında Kor Nəsib kimi tanınıb. Təhsil almayıb. Güllübulaqda olan din adamları, dövrün ziyalıları ilə sıx əlaqədə olub. Çıldır, Ağbaba, Borçalı, Axıska və b. yerlərdə ustadı Aşıq Şenliklə çoxsaylı məclislər keçirib.***

***Xalq arasında haqqında çoxlu rəvayətlər dolaşır. Şeirlərindən müxtəlif səpkili nümunələr mətbu orqanlarda çap olunub. Haqqında elmi araşdırmalar aparılıb.***

***Aşıq Nəsib 1944-cü ildə öz doğma kəndi Güllübulaqda vəfat edib.***

### GƏRƏK
*(divani)*

Qarayola getmək çətin, ona qara qəm gərək,
Qəmliliyə həm ağ-qara, həmi şöhrət-nam gərək.
Pünhan ola pis kəslərdən, uya aləm sirrinə,
Dədələrə bir münasib, xəlvəti bir dam gərək.

Türkdə sirli, möcüzatlı ata olar hər anı,
Günçıxanla günbatandı hər atanın məkanı.
Ürəkləri təpər dağı, qəlbləri gövhər kanı,
Üzü nurlu, coşqun təbli, bilgiləri tam gərək.

Qara dünya yolçusuyam, amma özüm ağ ata,
Əllərimdə gün işığı – dərdi-qəmi dağıda.
Qalxa bir ərşi-əlaya, könlüm istər tağ ata,
Görüb İşıqlı babam, Nəsib ala nam gərək.

## ALLAH

Qohum-qardaş o tərəfdə, kimdən xəbər alım, Allah,
Ürəyimdən qanlar axır, xoş xəyala dalım, Allah?!
Qaralanıb elim mənim, yarı orda, yarı burda,
Zəhər olub xörək aşım, bilməm olüm, qalım, Allah?!

Qəfildəncə gözüm dolur, könül arayır Canbazı,
Dodağımdan bir ah qopur, görəmmirəm gələn yazı.
Dərd əlindən qaradayam, oldum şadlığın möhtacı,
Axı, necə məclis qurum, telli sazı çalım, Allah.

Qəm əlindən gəl, ey Nəsib, dağlara de dərdini sən,
Dərd görənə, həm yeyənə, ağlara de dərdini sən.
Arpa kimi Qaraxan tək, çağlara de dərdini sən,
Dağ-daş, sular kömək olsun, dəyişsin əhvalım, Allah.

## EYLƏMƏ

Bir yerə çox gedib gəlmə, aşıqlığı şor eyləmə,
Hörmət ayrı, töhmət ayrı, öz işini zor eyləmə.
Paraya heç meyil salma, can sözünü çor eyləmə,
Yavaş danış, sakit dillən, səs-sədanı gur eyləmə,
Yandırma özün odları, yatağını qor eyləmə.

Aldınmı sazını ələ, elə çal ki, daş ərisin,
Şirin-şirin söhbət eylə, düşün sən sözün gerisin.
Nadanların, qanmazların, söz ilə çıxar dərisin,
Ürəyinə neştəri sox, tamahkarın, həm hərisin,
Dastan, hava, havacatı, sevənlərə xor eyləmə.

Mən Nəsibəm eşit, oğul, yadında saxla sözümü,
Bu dünyada şəyirdimsən, sənə tutmuşam üzümü.
Yalan eləmə düzümü, ay İsgəndər, məni dinlə,
Ağa “ağ” de, ala “al”de, işığı sənsən gözümün,
Ustadından ötə keçmə, zil qaranı mor eyləmə.

## MƏNİ

Bir gəlinin gözlərinin,
Yağışı öldürdü məni.
Baxışından çiçək yağır,
Baxışı öldürdü məni.

Bir naxışlı corab gətdi,
Özü bir mərd qızı mərddi,
Gözəlliyi əlamətdi,
Alxışı öldürdü məni.

Nəsib tez durdu ayağa,
Gördü məclisdə bəy, ağa,
Corabı geydim ayağa,
Naxışı öldürdü məni.

## DİDƏLƏRİM QAN AĞLAYIR

Didələrim qan ağlayır,
Nazlı yarı itirəndən.
Qəhərlənib tez doluram,
Ürək vərəm gətirəndən.

Bəlliyəm oba-elimdə,
Baharın adı dilimdə.
Ah çəkirəm saz əlimdə,
Yarı yada ötürəndən.

Şuxluq heç vaxt gülə qalmaz,
Solar, aya, ilə qalmaz.
Nəsib yanar, belə qalmaz,
Eşq sevdasın bitirəndən.

## ALLAH, ALLAH

Bahar adını eşitdim,
Bağrım yandı, Allah, Allah!
Gözlərimdən axan yaş da
Qızıl qandı, Allah, Allah!

Bir yanda mən, bir yanda yar,
Bir zaman olduq bəxtiyar.
O günlərdən xatirə var –
Könül andı, Allah, Allah!

Nəsib yazıq qaldı belə,
Sazını götürdü ələ,
Dərdini gətirib dilə,
Yarımcandı, Allah, Allah!

## KEÇDİ

Ağbabanın yaylağından
Bir cüt gözəl gəldi, keçdi.
Qızıl tənə qulağında,
Dərdlərimi bildi, keçdi.

Biri eşq əlindən xəstə,
Alma yanaq, boyu bəstə.
Hər nə dedim, "gözüm üstə",
Belə dedi, güldü keçdi.

Mən Nəsibə zülüm oldu,
Ağladım, gözlərim doldu.
Biri ürəyimi aldı,
Qara günlər gəldi keçdi.

## AY KÖNÜL

Mən sevdim, bir özgə yarı apardı,
Neyləsin bu yerdə fağır, ay könül?
Toxdaya bilmirəm, gözdən yaş gedir,
Dərdim artıb olub ağır, ay könül.

Həyat çox şirindi, olarmı doymaq,
Mənə ayran düşdü, düşmənə qaymaq.
Dolansam neçə el, oba, həm oylaq,
Qəm yenə başıma yağır, ay könül.

Üstümdə duranım bir Yaradandı,
Onadı imanım, onadı andım.
Nəsibəm, oduma alışdım, yandım,
Dardayam, Allahı çağır, ay könül.

## DÜNYANI

Anası bilinmir, dədəsi dörddü,
Bumunun kölgəsi tutar dünyanı.
Gəzər ruzigahı qarışbaqarış,
Əgər mümkün olsa, satar dünyanı.

Gahdan aram olur, gah dilənçidi,
Bambılı, xudbindi, el gülüncüdü.
Yaxşılıq həmişə onu incidir,
Qaldırsa, başından atar dünyanı.

İştahası çoxdu, daş-torpaq yeyər,
Güclüyə qul olar, gücsüzü döyər.
Namusu, qeyrəti hərraca qoyar,
Qan salar araya, qatar dünyanı.

Qəribə məxluqdu, bilməz özünü,
Həqiqət bir oxdu, tökər gözünü.
Nəsib xeyir görməz, görsə üzünü,
Əgər imkan olsa, udar dünyanı.

## NEYLƏYİM

Ustam öldü, genə qaldım ortada,
Yarımçıqdan aşıq olmaz, neyləyim.
Şagirdliyə kimə gedim bilmirəm,
Hər yetişən sözüm almaz, neyləyim.

Sinəm dolu, nabələdəm yollara,
Mən naşıyam  dərdə, qeylü-qallara,
Tanrı özü kömək olar qullara,
Kimsə məni yada salmaz, neyləyim.

Qəza vurdu, yetim qaldım atadan,
Könül evim qurtararmı xatadan,
Xəbərim var Ərginədən, Otadan,
Aşıq Nəsib, belə qalmaz, neyləyim.

## OLAR

Görməmişlər pul görəndə sevinər,
Ağlı gedər, elə bil ki, məst olar.
Haqqı görməz, var gözünü bağlayar,
Qəza vurar, şeytan ilə dost olar.

Bir gün tale döyər, alar varını,
Sail kimi daha doymaz qarını,
Yadlar yeyər məhsulunu, barını,
Paltar tapmaz, cındır bircə dəst olar.

Aşıq Nəsib, sözünü de qanana,
Canım qurban Haqq oduna yanana,
Başa keçə kəl yerinə hər dana,
Sanaram ki, şirin cana qəsd olar.

## GÖZƏL

Yazı bu yerlərin ayrı büsatdı,
Ağbaba elinin yörəsi gözəl.
Ağ sürü yayılıb yamaca, yala,
Qoyunun kərəsi, kürəsi gözəl.

Quş qanad saxlayar neyə, tütəyə,
Arılar daşıyar şirə pətəyə,
Xalı sərilibdi çölə, təpəyə,
Bulaq ayağının tərəsi gözəl.

Bu yan Ağbabadır, o yan Çıldır-Qars,
Nəsib, sözlərimə yaxşı qulaq as,
Gözlərim ağlardı, ürəyimdə yas,
Sərhədin dağları, dərəsi gözəl.

## ÇƏKƏR

Yazıya bax, gözəl gedir çirkinə,
Əğyar olan alagözə mil çəkər.
Bu ağrıdan ürək yanar, od olar,
Naləsini dodaq çəkər, dil çəkər.

Dərdimiz bir, sərimiz bir dünyada,
Fələk zalım, taleyimiz kür dünyada,
Murad almaq bir əcəb sirr dünyada,
Çərx hərlənər, neçə-neçə il çəkər.

Aşıq Nəsib, bas sinənə sazını,
Qadir Allah qara yazdı yazını.
Sözünü de, bilməsən də yazını,
Qəm karvanın çəksə-çəksə, fil çəkər.

## XƏBƏR VER

Sərini qarşımda nişanə qoyan,
Doqquz nədi, sənətindən xəbər ver.
Neçə doqquz bir-birinə bağlıdı,
O doqquzun qüdrətindən xəbər ver.

Doqquzu nə dildə edir söhbəti?
Doqquzu doqquzun buraxmır qəti.
O doqquzda nə görübsən xilqəti?
O doqquzun xilqətindən xəbər ver.

Doqquzu birləşib tapıb neçə yol,
Kim idi, onları eləyib qəbul,
Neçə şah, vəziri qabağında qul,
Nəsib deyər, hikmətindən xəbər ver!



## ŞAİR AĞACAN
*(1876-1951)*

***Ağacan Cabbar oğlu Cabbarlı 1876-cı ildə Şorayıl mahalının Qaraisə kəndində anadan olub. İlk təhsilini mollaxanada alıb. O, 1911-ci ildə Borçalının Quşçu kəndinə köçüb, burada uzun müddət yaşaya bilməyərək qonşu Qaçağan kəndində məskunlaşıb. Ərəb və fars dillərini mükəmməl bilən Ağacan tezliklə şair-aşıq kimi bölgədə böyük hörmət qazanıb.***

***1943-cü ildə həbs olunub, S.Vurğunun işə qarışması ilə həbsdən qurtara bilib. 1949-cu ildə Sibirin Tomsk vilayətinə sürgün olunub, 1951-ci ildə orada vəfat edib. 1956-cı ildə bəraət alaraq Borçalıya qayıdarkən həyat yoldaşı Zəhra onun məzarını açaraq nəşinin qalıqlarını da özüylə birlikdə gətirib. Amma repressiya qorxusu hələ də insanların canından çıxmadığından, Ağacanın sümüklərini bir müddət gizli saxlayıb. Ağacan ikinci dəfə 1958-ci ildə Borçalıda – Marneuli rayonunun Qaçağan kəndində dəfn olunub.***

### MƏNDƏDİ

İki deməm bir Allaha, hökmü Quran məndədi,
Sanmagınan pəhləvanam, demə meydan məndədi.
Urfatı cəm edərəm, alaram səndən hesab,
Qurulub mizan tərəzi, adil divan məndədi.

Peyğəmbəri xəbər alsan, yüz iyirmi dörd min tamam,
Elm ərəb kimsənədən, mən almışam imtaham,
Ustadımdır Şiri-Yəzdan, Haqq bilirəm on iki imam,
Çağıranda dada yetən Şahimərdan məndədi.

Açaram ürfan kitabı ara, axtar bil sanı,
Əlfin altında qoyub qədir müjdəm nöqtəni,
Dərdə düşən gəlib alsın Ağacandan dərmanı,
Xəstələrə şəfa verən elmi loğman məndədi.

## DURUR

Əhli-ürfan məclisində arifi, ürfan durur,
Kimi alçaq, kimi yüksək, hər cürə insan durur.
Şüaralar bəndəgahın kəsdiyim aşkar olub,
Fələk döndərdi çarxımı, indi də pünhan durur.

Urfatından xam olanı noxtaladım, çulladım,
Yeyi, lamı, əlif beyi nə deyə suvalladım?
Ağzı nəqqara olanı dilindən qıfılladım,
Seyrəqib çıxmır aradan, gözümə şeytan durur.

Ağacanın qarşısında nitqə gəldi bircə din,
Ustadım var, şiri-Yəzdan, artıraram birə min.
Aşıq, yaman qorxma ki, sən, mən olmaram nəkrain,
Qəbir durur, sual durur, ədalət divan durur.

## ƏZBƏRDƏDİ

Bir quş gördüm, havalanmış, yuvası səngərdədi,
Bir gəmi dəryaya dalmış, çarxları ləngərdədi,
Onu ümmana qərq etmək mənim əski peşəmdi,
Günəşin şövqü altında bulud ona pərdədi.

Tanıginən, qarşı gələn kimdən alıb dərsini,
Lövhi-qələm kəcavətdə keçib ərşin-kürsünü,
Yeddi min ayə içində nişan verrəm birsini,
Ruhları ərşi-əlada, cəsədi yerlərdədi.

Ağacanam, mən də sənə nişan verrəm zatımı,
Min bir yola ayırıram bir əlif urfatımı,
Şin şəhri tənəzzüldü, təriqət heyrətimi,
Ustadımdı Şahi-Mərdan dillərdə əzbərdədi.

## SIRAYNAN

Havalanıb dəli könlüm, kəşt eyləyir haraynan,
Dərdi deyim, yaz dəftərə, sən qələmi qaraynan,
Aldanmaynan bivəfaya, dünya karvansaradır,
Çox dolub, çox boşalıbdı, düzülübdü sıraynan.

Adam var ki, düşünməyir, şəmsi-qəmər, ay nədir,
Kimi eşqə talıb olur, kimi atın oynadır,
Kimi şeytan, kimi iblis, kimi fəsad qaynadır,
Adam var ki, din-imanı alıb-satır paraynan.

Ağacanam, tanıyıram Quranı, Peyğəmbəri,
Var dilimin ləşgəridir ərşin-kürşün ləngəri,
Alimi yox, mollanı yox, qazini çağır bəri,
Mən öləndə götürsünlər qoy Yasini suraynan!

## GÖZLƏ SƏN

Aşıq, üçə fikir vermə,
Dördü gözlə-gözlə sən.
Bir meydanda zər atanda,
Nərdi gözlə-gözlə sən.

Havalanma, lovğalanma,
Çox da öymə kəndini.
Xudam birdən qərq eyləyər,
Dərdi, gözlə-gözlə sən.

Oylağına düz fikir ver,
Gəlib laçın qonmasın.
Allahdan bəndəyə gələn,
Şərti gözlə-gözlə sən.

Şair Ağacanın özü,
Könlü odda yanmasın.
Namərddən kişi görmədim,
Mərdi gözlə-gözlə sən.

## GÜLƏR BİR GÜN

Dərdli könlüm, qəm eyləmə,
Ağlayanlar gülər bir gün.
Mürvət eylər çərxi-fələk,
Göz yaşını silər bir gün.

Çox gəzmişəm dağnan aran,
Gözüm görüb çiskin, duman,
Hiylə qurub, şər axtaran,
Əvəzini alar bir gün.

Ağacanın çoxdur dərdi,
Xudam, özün saxla mərdi,
Müxənnətin, həm namərdin,
Yurdu düm-düz olar bir gün.

## DİLİM

Daha sənə çox ixtiyar vermərəm,
Durmursan yerində farağat, dilim.
Danışanda ziyanını çəkirəm,
Açırsan başıma əlamət, dilim.

Kim nə desə, cavabında hazırsan,
Canıma, cismimə qəbir qazırsan,
Hərdən toxunmalı şeir yazırsan,
Hər yetənlə olmaz zarafat, dilim.

Ağacan keçibdir çox tarixləri,
Şüəra elmindən dolubdur səri,
Otuz iki dişdir dilin çəpəri,
Dolandır başını salamat, dilim.

## YATMAYACAQDIR

Mərd yaranıb bu dünyaya mərd gələn,
Namərd kölgəsində yatmayacaqdır.
Unudub ilqarı, əhdi-peymanı,
Namusu, qeyrəti atmayacaqdır.

Sirrini söyləmə sirr verən yada,
Axırda səni də tez verər bada,
Mərd igidlər ta ölüncə dünyada,
Dostunu dünyada satmayacaqdır.

Sərraf olub, ləli dürdən seçirdin,
Dost əlindən şərbət alıb içirdin,
Ey Ağacan, yaxşı günlər keçirdin,
Keçən günə günlər çatmayacaqdır.

## GEDİRƏM

Köçürəm dünyadan, dost olanlarım,
Oxudun üstümdə Quran, gedirəm.
Fitnəkar olmadım, könül yıxmadım,
Qazanıb saf vicdan, iman gedirəm.

Sinəmin dəftəri varaq-varaqdı,
Ayrılıq cismimi yandırıb-yaxdı,
Deyirlər, burada ərasət Haqdı,
Orada haqqıdır divan, gedirəm.

Mən qurbanam comərdlərin mərdinə,
Sinəmdə yaralar sızıldar yenə,
Ağacanın pünhan olan dərdinə,
Olmadı fələkdən dərman, gedirəm.

## SAMOVAR
*(müxəmməs)*

Sənsən mənim bu dünyada,
Dövlətim-malım, samovar!
Səhər tezdən qaynamasan,
Yamandı halım, samovar!
Yanında hazır olaydı,
Kərəylə balın, samovar!
Baxdım açılan səhərə,
Xəyalım uçdu göylərə.
Nəlbəkidə qaldı kərə,
Durum gedim dükənlərə,
Şirniyyat alım, samovar!

Tanrıdan dövlət istəməm,
Bircə ağ otağım ola!
Hər gecə bir bölük atlı,
Gəlhagəl qonağım ola!
Hatəmsayaq süfrə açam,
Pozulmaz yığnağım ola!
Öyəclər çəkilə şişə,
Qonaqlar düşə təşvişə.
Yarla öpüşə-öpüşə,
Bəlkə, onda eşqə düşə,
Qaynaya zalım samovar!

Sənin çayın içməyəndə,
Aşıqların səsi batır.
İçində dambatı olan,
Sazını tez yerə atır.
Şairlərdə qayda budur,
Sözünü qiymətli satır.
Mənim adım Ağacandır,
Sözlərim dürr-mərcandır.
Sinəm bir dərya ümmandır,
Gecə-gündüz dərsin verib,
O böyük alim, samovar!

## İSGƏNDƏR AĞBABALI
*(1925-1992)*

***Ağbaba aşıq mühitinin yetirməsidir. Aşıq Nəsibin şagirdi olub. Aşıq sənətinin sirlərini öyrəndikdən sonra müstəqil aşıqlığa (1945) başlayıb, məlahətli səsi, mahir ifaçılığı ilə məşhur olub. Qazaxıstanda, Qırğızıstanda (keçən əsrin 60-cı illəri) repressiya olunmuş azərbaycanlılarla görüşüb, məclislər keçirib. Dastanların bilicisi kimi tanınıb, "Gürcü qızı", "Yetim Məhəmməd", "Yaralı Mahmud", "Təbriz oğlu" və digər qədim dastanların söyləyicisi olub. Dastan yaradıcılığında da mühüm xidmətləri vardır. "İsgəndər şah", "Dəli Yusif", "Aybəniz", "Gündoğar" dastanlarının yaradıcısıdır. "Dərbədəri", "Konyalı", "Sarı yaylıq", "Sarı gəlin", "Şenlik xoşdamağı", "Çuxurobası", "Dəli hicranı", "Otalı qızı" və s. kimi az-az ifa olunan saz havalarının mükəmməl ifaçısı olub. "Güləndamı" saz havası isə onun adı ilə bağlıdır.***

### AĞRI DAĞI

Uzaqdan gördü gözüm, nə ucasan, Ağrı dağı,
Yaşın bəlli deyil bizə, çox qocasan, Ağrı dağı.
Başından qarın əskilməz, gül açasan, Ağrı dağı,
Durnagözlü bulaqların bir içəsən, Ağrı dağı.

Hökumətin arasında sən bircə gül yaranıbsan,
Ətəyin cənnətə bənzər, dərya kimi fırlanıbsan.
Gözəllər çıxır yaylağa, görəndə ilham alıbsan,
Nuh da səndə məskən salıb, həvəsdəsən, Ağrı dağı.

Qaf dağı gün arasıdır, onu dildə demək olmaz,
Altay dağı qar saxlayar, ucadadır, yemək olmaz.
Sənan dağı çox ucadır, yəqindir ki, sana gəlməz,
Ələgəz haça görünür, şən tacısan, Ağrı dağı.

Ural dağının adı var, özü cərgəyə düzülüb,
O köksünə çıxmaq olmaz, alnına belə yazılıb.
Neçə pələvanlar gəlib, yollarında çaşıb qalıb,
İsgəndərin nəğmə qoşub, nə gözəlsən, Ağrı dağı.

## GÖVHƏRƏ

Ay həzərat, yaxşı baxın qarşıdan gələn Gövhərə,
Gül kimi şölə verir, qaşları kaman Gövhərə.
Gözəllikdə çox əladı, huriyi-qılman Gövhərə,
Bu sifətdə, bu surətdə can deyim qurban Gövhərə.

Ay camaat, kim görübdü gözəllikdə Gövhər kanı,
Gəzmişəm çox yerləri, bu misalda gözəl hanı?
Məclisə ki, qədəm qoysa, qoçaqlıqda yoxdu tayı,
Qıryatda da kişi kimi, dillərdə dastan Gövhərə.

Aşıq sözün doğru deyər, İsgəndər də tərif eylər,
Gözəllikdə tayı yoxdur, istərsə divan da söylər.
Namusu var öz yerində, gözəlliyin dastan eylər,
Yeriyəndə çox gözəldi, baxsan ha üzdən Gövhərə.

## BOYLANA-BOYLANA

Bir cüt gözəl çeşmə üstə,
Gəlir boylana-boylana.
Məni qoyub qəmli yasda,
Gülür boylana-boylana.

Bir cüt əcəb gözəl qızdı,
Gözəl demək ona azdı,
Elə bil ki, bahar-yazdı,
Gəlir boylana-boylana.

Hər ikisi bir cüt çətir,
Görənlərə verir ətir,
Dedim, ay qız, bir su gətir,
Gülür boylana-boylana.

Dedim, ay qız, özüm matam,
Xoş baxtım var, inan şadam,

Əlimi qoynuna atam,
Gülür boylana-boylana.

İsgəndərəm, yaxşı bildim,
Hicran vədəsində gəldim,
Canımı odlara verdim,
Bilir boylana-boylana.

## A BƏXTƏVƏR

O yaradan qələm çalıb,
Gül yaradıb, a bəxtəvər.
Gözəlliyi sana verib,
Mələk xanı, a bəxtəvər.

Qara qaşlı, qara gözlü,
Ağzı şəkər, şirin sözlü,
Hər baxışı işvə-nazlı,
Gövhər kanı, a bəxtəvər.

İsgəndərəm, mən tək yansan,
Eşdib, mətləbim qansan,
Həm gözəlsən, həm cavansan.
Şirin canı, a bəxtəvər.

## BƏYƏNMİŞƏM

Gözəl, sənə məlum olsun,
Hər işini bəyənmişəm.
Oğrun-oğrun maral kimi,
Baxışını bəyənmişəm.

Sarı tellər gözün üstə,
Dərdindən olmuşam xəstə,
Hərdən-hərdən, çox ahəstə,
Gəzişini bəyənmişəm.

İsgəndərəm, el aşığı,
Telli sazdı yaraşığı,
Ağ əllərin saraşığı,
Naxışını bəyənmişəm.

## CEYRAN

Durum dolanım başına,
Qaşı-gözü qara Ceyran.
Dərdindən çoxları xəstə,
Eylə dərdə çara, Ceyran.

Ay qız, sənin gözün pürzə,
Danışanda sözün pürzə,
Aşıq gərək vəsfin düzə,
Qəlbim oldu yara, Ceyran.

Tərlan kimi səsə gəldin,
İsgəndər, həvəsə gəldin,
Neçəsinin canın aldın,
Söylə gedim hara, Ceyran.

## ƏZİZİM

Şəkər dodaqların yoxdu qiyməti,
Çox gəzmişəm bu cahanı, əzizim.
Bir beçə balıdı verəndə dadı,
Hər kim sürsə o dövranı, əzizim.

Şirindir dəhanın, qaradır qaşın,
O şahmar gözlərin, xoşdur baxışın,
Özün dərd əhlisən, cavandır yaşın,
Qoyuram yolunda canı, əzizim.

Aşıq İsgəndərəm, qurbanam sənə,
Dağlaram sinəmi, baxmasan mənə.
Can sağ ikən gəl bağlayaq əhdnamə,
Fanidi bu dünya, fani, əzizim.

## QARAGÖZ GƏLİN

Hilal qaşın mənim ağlımı aldı,
Sallan keç qarşımdan, bir də süz, gəlin.
Məni Məcnun kimi çöllərə saldı,
Alıbdı canımı qaragöz gəlin.

Bilirsənmi, könlüm çox sevir səni,
Yazığam, odlara yandırma məni.
Bu gözəl Vətəni, bu şən dünyanı,
Dolanıb deyirəm, dərdə döz, gəlin.

Belə olub ta əzəldən zamana,
Yazılıbdı, yaxşı gedər yamana.
Sən mələksən, ta gəlibsən cahana,
İsgəndər sözünü deyər düz, gəlin.

## OLA BİLMƏZ

Nəsilsiz insana heç bel bağlama,
Onda namus, qeyrət, ar ola bilməz.
Qonşuya kor olar, dostluğa xain,
Bədnəzər insanda var ola bilməz.

Sirrini söyləmə hər yetən yada,
Axırda canını qalayar oda.
Xainin üzünə baxma dünyada,
Mərdanə insanlar xar ola bilməz.

Dolandım el-oba, hər dərdə dözdüm,
Çoxuna dost dedim, canımı əzdim.
İsgəndərəm, yaxın-uzağı gəzdim,
Dünya çox böyükdü, dar ola bilməz.

## YOXSUL OLMASIN

Məclisə gələndə nə var, deyərlər,
Bir kimsə dünyada yoxsul olmasın.
Aşağı qoyarlar, başa qoymazlar,
Bir kimsə dünyada yoxsul olmasın.

Qohum-qardaş yad tək baxmaz üzünə,
Oğul-uşaq fikir verməz sözünə,
Yar-yoldaşın heç görünməz gözünə,
Bir kimsə dünyada yoxsul olmasın.

İsgəndərin ağlı, huşu yerində,
Ölüm hər insanın var qədərində,
Kasıba soyuqdur isti, sərin də,
Bir kimsə dünyada yoxsul olmasın.

## KİMİ

Özgənin sözünə inanmaq olmaz,
Özünün dilindən alana kimi.
Havayı sözlərlə dolanmaq olmaz,
Külüngü dağlara çalana kimi.

İnsanı insana salan çox olar,
Qılıncı dəstinə alan çox olar,
Yalandan qeydinə qalan çox olar,
Öz işi yerini alana kimi.

Bilirəm, insanlar çiy süd əmibdi,
Paxıllıq Adəmdən nişan qalıbdı,
İsgəndər, eşq ilə sinən dolubdu,
Boşalmaz sazını çalana kimi.

## DƏYDİ, DAYANDI

Bir sona ceyranım açdı qapını,
Gəldi binəsinə dəydi, dayandı.
Gördüm ki, minibdi eşqin atını,
Mətahını yerə qoydu, dayandı.

Əvvəl salam verib, gözün gəzdirdi,
Qaşını oynadıb canım üzdürdü,
Çox minnət eləyib mahnı düzdürdü,
Baxış əncamınnan döydü, qayıtdı.

Eşqin alovunda sıxıldı canı,
Gördüm ki, gedibdi dini, imanı,
Aşıq İsgəndərəm, kitab-Quranı,
Hamısın ürəkdən saydı, dayandı.

## ZÜBEYDƏ
***(müxəmməs)***

Xalların var qoşa-qoşa,
yanağın lala, Zübeydə.
Çox yaraşır, zər geyibsən,
bu qəddi-dala, Zübeydə.
Şəhdi-şəkər dodaqların,
batıbdır bala, Zübeydə.
Sənsən gözəllərin gözü,
düşmə xəyalə, Zübeydə.
Bircə görsə gözüm səni,
çatsam kamala, Zübeydə.

Pəri, qılman, hüri-mələk,
bir gözəl növrəstə, deyim.
Yaraşır ağ əllərinə,
qızılgüllər dəstə, deyim.

Gül üzün, gül camalın,
yanağın peyvəstə deyim.
Kirpiklərin xan qoruğu,
ala gözün üstə, deyim.
Çoxları bil, aşiq olub,
o xətti-xala, Zübeydə.

İsgəndərəm, mah camalın,
bəyənmişəm görməmişdən.
Yetik oldum hər işinə,
bəzənəndə altdan-üstdən.
Büllur buxaq, qaymaq dodaq,
sallananda yerişindən,
Kimsə qüsur tapa bilməz.
o inci, o sədəf dişindən.
Hərdən geyib bəzənərsən,
yaşıla, ala, Zübeydə.

**GÖZƏL**
***(müxəmməs)***

Durum dolanım başına,
qaşları qapqara gözəl.
Ay qabağın şölə verir,
düşübdür kənarə, gözəl.
Şəmsi-qəmər misal gəlir,
cümlədə cahana, gözəl.
İnsaf eylə, kənar gəzmə,
salma məni dara, gözəl.

Danışığın sultan kimi,
mail oldum hər işinə.
Danışanda şirin dilli,
asta-asta gülüşünə.
Hərdənbir də süzgün baxış,
ceyran kimi yerişinə.

Dil qanıb, mətləb anlayan,
sən tək şirin cana, gözəl.

Vətənində cox olmuşam,
Gürcüstanda yolum azdım.
Azərbaycan, Qazaxıstan,
onların sayını yazdım.
Qırğızıstan, Türkmənistan,
qoşma yazdım, şeir düzdüm.
Şəki, Şirvan, Qazax, Gəncə,
adın düşdü hara, gözəl.

Sən olsan bir gözəl sonam,
mən olaram vəfadarın.
Allahdan dilək dilərəm:
məğmun olsun sənin yarın.
Aşıq İsgəndərəm, bil ki,
mən çəkərəm intizarın.
Qoy gözlərin belə baxsın,
eylə dərdə çara gözəl.



## FAXFUR AĞBABALI
*(1954)*

***Faxfur İsgəndər oğlu Ağbabalı 1956-cı il iyulun 31-də Amasiya rayonunun Ellər kəndində anadan olub. 1973-cü ildə orta məktəbi bitirib, 1974-1976-cı illərdə hərbi xidmətdə olub. Ustad ocağında böyüdüyündən, uşaqlıqdan saza-sözə bağlı olub. Sənət dərsini atası, ustad aşıq İsgəndər Ağbabalıdan alıb.***

***Qərbi Azərbaycandan soydaşlarımızın 1988-ci il deportasiyası zamanı Bakıda məskunlaşıb. 2001-ci ildən paytaxtın Bakıxanov qəsəbəsində saz kursunda dərs deməyə başlayıb.***

***Aşıq Faxfur Ağbaba-Çıldır aşıq mühitinin, demək olar ki, sonuncu ustad sənətkarıdır.***

### YERİDİ

Doğma yurddan köç başladı,
Yeridi, ellər yeridi.
Yolda-izdə, dərddə-qəmdə
Əridi, ellər əridi.

Yana-yana aldım sazı,
Fələk belə yazdı yazı.
Sıxıb həsrətin ayazı,
Qarıdı, ellər qarıdı.

Faxfur istər saz çalmağı,
Vətənə qurban olmağı,
Ağbabadan söz salmağın
Yeridi, ellər, yeridi.

## MƏN

Vətən itirmişəm, yurd itirmişəm,
Sinəmin başından yaralıyam mən.
Gözyaşım çağlayır dağ seli kimi,
Bilin, qəm üstündə quruluyam mən.

Dağdan, buz bulaqdan gendə qalmışam,
Fələk məni salıb bəndə, qalmışam.
Yolu itirmişəm, çəndə qalmışam,
Dərd əl çəkmir, dərdə sarıyam mən.

Qəmli hekayətdi söhbətim-sözüm,
Ağbaba deyəndə hey dolur gözüm.
Faxfuram, ordadı alovum-közüm,
Deməkdən-gülməkdən aralıyam mən.

## QƏZANIN ORAĞINDAYAM

Həsrətəm gəzməyə Çıldırı, Qarsı,
Şenlik gəzən yerin sorağındayam.
Məskənim dağlardı, endim də gəldim,
İndi bir dənizin qırağındayam.

Nədən könlüm gülmür, açılmır eynim,
Qəddim sınıq qalıb, tökülür əynim.
Həsrətə yuvadı qucağım, qoynum,
Piltə tək fələyin çırağındayam.

Faxfuram, mən Haqqın qulu, köləsi,
Aşıq İsgəndərin aşıq balası.
Bir simsar bulmuram yoldaş olası,
Sünbül tək qəzanın orağındayam.

## MƏNDƏDİ

Sazımı dinləyən min sehrə düşər,
Qarsın havaları, sözü məndədi.
Çıldır, Axılkələk, Ağbaba birdi,
O axan suların gözü məndədi.

Yurdum əldən çıxıb, elim dağlıb,
Dəryaydım, hər yana selim dağlıb,
Dərd dərdin üstünə gəlib yığılıb,
Hicranın, kədərin yüzü məndədi.

Faxfuram, başıma gəlib min qada,
Ömrümü dərd ilə vermişəm bada.
Çox yaxın olmuşam alova, oda,
O qəm deyilənin özü məndədi.



# QƏRBİ AZƏRBAYCAN AŞIQ MÜHİTLƏRİ İLƏ BAĞLI SAZ HAVALARI VƏ DİGƏR HAVALARIN BU ÇEVRƏDƏKİ VARİANTLARI

***"İrəvan çuxuru"***
***"İrəvan gəraylısı"***
***"Göyçəgülü"***
***"Göyçə gözəlləməsi"*** – "Yüngül sərili" (variant)
***"Göyçə dubeytisi"*** – "Nəcəf gözəlləməsi" (variant)
***"Göyçə qaragözü"***
***"Cəlili"*** (Dərələyəzli Aşıq Cəlil yaratmışdır)
***"Ayaq Cəlili"*** – "Süsənbəri" ("Sulduzu"nun variantı)
***"Dərələyəz gəraylısı"*** – "Şəqai gəraylı" (variant)
***"Qəhrəmanı"*** (Dərələyəzli Aşıq Qəhrəmanın havası)
***"Kəvəri"*** – "Baş Sarıtel" (variant)
***"İmran divanisi"*** (İmran Həsənov yaratmışdır)
***"Çıldır duraxanısı"***
***"Ağbulağı"*** (İmran Həsənov yaratmışdır)
***"Ağbaba gözəlləməsi"*** (İsgəndər Ağbabalı yaratmışdır)
***"Ağbabayı"*** (İsgəndər Ağbabalı yaratmışdır)
***"Ağbaba zarıncısı"***
***"Güləndamı"***
***"Xoşdamağı"*** (Çıldırlı Aşıq Şenlik yaratmışdır)
***"Otalı qızı"*** (Çıldırlı Aşıq Şenlik yaratmışdır)
***"Çalpapağı"***
***"Şenlik mirzəcanısı"*** (Çıldırlı Aşıq Şenlik yaratmışdır)
***"Şenlik divanisi"*** (Çıldırlı Aşıq Şenlik yaratmışdır)
***"Qurdoğlu"***
***"Köşəbaşı"***
***"Summanı"*** (Aşıq Sümmani yaratmışdır)
***"Sarıyaylıq"***
***"Diyarbəkiri"***
***"Nabatxanım"***
***"Nəcəfi" və ya "Nəcəf şərilisi"*** ("Yüngül şərili"nin variantı)

## ANTOLOGİYADAKI ŞEİRLƏRDƏ YER ALAN TARİXİ-COĞRAFİ YER-YURD ADLARI

### *İRƏVAN MAHALI*

***Çobankərə*** – kənd
***İrəvan*** – 1) şəhər, 2) xanlığın adı
***Toxmaq göl***
***Vedi*** – 1) İrəvan yaxınlığında şəhər, 2) çay
***Zəngibasar*** – mahal

### *ZƏNGƏZUR MAHALI*

***Arpa çayı***
***Herher bağları***
***Gözəldərə*** – kənd
***Qısır*** – dağ
***Şah dağı*** – Şərgi Göyçə, Zəngəzur, Dərələyəz boyu uzanır
***Ululu*** – kənd
***Toğluqaya*** – dağ
***Zeyta*** – 1) Arpa çayın bir qolu, 2) dərə
***Zəngəzur*** – mahal

### *DƏRƏLƏYƏZ MAHALI*

***Ağsu*** – 1) çay, 2) yer
***Axta*** – kənd
***Bənövşəli*** – dağ
***Bülbülölən*** – kənd
***Cırranlı*** – kənd
***Civə*** – kənd
***Cul*** – kənd
***Dərələyəz*** – mahal
***Ələyəz*** – 1) kənd; 2) dağ; 3) göyərti çeşidi
***Əməğu (Amağu)*** – kənd
***Ərgəz*** – 1) yer, 2) pir, 3) kənd
***Əyricə*** – dağ adı
***Herher*** – kənd

***Hors*** – kənd
***Göy dağ***
***Güllü yaylağı***
***İstisu*** – 1) bulaq, 2) kənd
***Kotanlı*** – kənd
***Qabaxlı*** – kənd
***Qaraqaya*** – kənd
***Qovuşuq*** – kənd
***Leyliqaçan (Leyliköçən)*** – kənd
***Morun bulağı***
***Murad təpə***
***Novlar kənd***
***Sallı*** – kənd
***Salsal qalası***
***Sandıqlı*** – yaylaq
***Sarıyer*** – yaylaq
***Terp*** – kənd
***Təpəsidəlik*** – dağ
***Yazı yaylağı***

***GÖYÇƏ MAHALI***

***Ağbulaq*** - kənd
***Ağdağ*** – dağ
***Ağkilsə*** – kənd
***Ala göl***
***Alçalı*** – kənd
***Ardanış*** – kənd
***Aşağı Şorca*** – kənd
***Babacan*** – kənd
***Bala Qaraqoyunlu*** – kənd
***Basarkeçər*** – rayon
***Bəylik yalı***
***Böyük Məzrə*** – kənd
***Cil*** – kənd
***Çaxmaqlı*** – kənd
***Çala göl***
***Çalmalı dağ***

***Çalmalı yaylağı***
***Daltəpə*** – yer
***Daşgələn*** – yaylaq
***Daşkənd*** – kənd
***Daşlı Güney*** – yer adı
***Dürlü bulaq***
***Göyçə*** – 1) mahal, 2) göl, 3) dağ
***Hüseynquluağalı (Nərimanlı)*** – kənd
***Xəlvir təpəsi***
***Keyti dağı***
***Kərkibaş*** – kənd
***İnəkdağı*** – kənd
***Qaraxaç*** – dağ
***Qanıq*** – dağ
***Qanlı*** – kənd
***Qaraxaç*** – yaylaq
***Qarabulaq***
***Qara Quzey*** – dağ
***Qara Seyid ocağı***
***Qavrı*** – dağ
***Qızılvəng*** – kənd
***Qonur*** – dağ
***Qumlu bulaq***
***Murov*** – Kiçik Qafqazda dağ silsiləsi, Göygöl rayonu- Göyçə boyu uzanır
***Murğuz*** – Kiçik Qafqazda dağ silsiləsi, Gədəbəy- Göyçə boyu uzanır
***Muşov*** - dağ
***Samux düşən*** – dağ
***Sandıq bulaq***
***Sarı dərə***
***Sarınər*** - dağ
***Sarıyaqub*** – kənd
***Sarıyer*** – dağ
***Seyid Bayram ocağı***
***Şah dağı***
***Şişqaya*** – kənd
***Şirvi dağı***
***Şorca*** – kənd

***Uzun Güney*** – yer adı
***Tərsə dağı***
***Yalyurd*** – yaylaq
***Yarpızlı*** – kənd
***Zərkənd (Zərzəbil)*** – kənd
***Zina*** – yaylaq
***Zod*** – kənd

***QARAQOYUNLU MAHALI***

***Bəryabad*** – kənd
***Böyük Qaraqoyunlu*** – kənd
***Böyük təpə*** – dağ
***Buxarlı qaya***
***Cantəpə*** – dağ
***Çıvıxlı*** – 1) kənd, 2) nəsil
***Çalmalı*** – dağ
***Çatar*** – dağ
***Çaykənd*** – kənd
***Çəmbərək*** – rayon
***Daşlı bulaq***
***Əmirxeyir*** – kənd
***Gödək Güney*** – dağ
***Xərya*** – dağ
***Kor bulaq***
***Qaraqaya*** – yer
***Qaraqoyunlu*** – mahal
***Qoçdaş*** – yer
***Lilparı bulaq***
***Mahmudlu*** – yaylaq, dağ
***Polad*** – kənd
***Salah*** – kənd
***Seyid Bayram ocağı*** – pir, ocaq
***Toxluca yalı*** – yer, dağ
***Yanıqpəyə*** – kənd
***Yarpızdı bulağı***

## *DƏRƏÇİÇƏK–LORU-PƏMBƏK MAHALI*

***Axta*** – 1) mahal, 2) rayon
***Barana*** – rayon
***Çinar*** – yer
***Dərəçiçək*** – mahal
***Dürmək*** – dağlıq yer
***Hallavar*** – kənd
***Qaraqaya*** – kənd
***Qızılqaya*** – dağ
***Loru*** – mahal
***Pəmbək*** – 1) mahal, 2) kənd
***Ozanlar*** – kənd
***Yekəyal*** – dağ
***Yuxarı Körpülü*** – kənd
***Zara*** – kənd

## *AĞBABA MAHALI*

***Ağbaba*** – mahal
***Ağrı dağı*** – dağ
***Düzkənd*** – kənd
***Ellərkənd*** – kənd
***Güllübulaq*** – kənd
***Gümrü*** – şəhər
***Qaraisə*** – kənd
***Sultanabad*** – kənd
***Şörəyel*** – mahal
***Ziyarat*** – dağ



## KİTABDA YER ALAN ŞEİRLƏRDƏ İŞLƏDİLMİŞ ƏRƏB-FARS SÖZLƏRİNİN LÜĞƏTİ

***Abdal (ə)*** – ağlını itirmiş
***Abi-həyat (f-ə)*** – dirilik suyu
***Ahən (f)*** – dəmir
***Badi-səba (f-ə)*** – səba yeli, səhər yeli
***Badi-sərsər (f-ə)*** – qumlu, şiddətli külək, qasırğa
***Bəqa (ə)*** – əbədi, daimi olan
***Bərq (ə)*** – parlaq işıq
***Bərqi-əhmər (ə)*** – qırmızı işıq
***Bəst (f)*** – 1. pənah yeri, sığınacaq, ziyarətgah. 2. bağlı, 3. döşənmə
***Bəzirganlar (ə)*** – tacirlər
***Bidəxa (f-ə)*** – dərmansız, əlacsız
***Bihudə (f)*** – boş
***Bisəmər (f-ə)*** – xeyirsiz, dəyərsiz
***Bitab (f-ə)*** – tabsız
***Busə (f)*** – öpüş
***Bülənd olmaq (f)*** – qalxmaq, yüksəlmək
***Büryan olmaq (f)*** – alışıb yanmaq
***Cəbr (ə)*** – əzab-əziyyət
***Cəng (f)*** - savaş
***Cənnətül-məva (ə)*** – cənnət mənzili, cənnət kimi yer
***Cida salmaq (f)*** – ayrı salmaq
***Cihad (ə)*** – müqəddəs müharibə
***Çeşm (f)*** – göz
***Çeşmə (f)*** – bulaq
***Çeşmi-xumar (f)*** – xumar gözlü
***Damən (f)*** – ətək
***Danəndə (f)*** – alim
***Dari-fəna (ə)*** – fani dünya
***Dəhan (f)*** – ağız
***Dəhr (ə)*** – dünya, zaman, dövr
***Dər (f)*** – qapı
***Dərdimənd (f)*** – dərdə yetən, haraya çatan
***Dəstinlə (f)*** – əlinlə
***Didar (f)*** – görüş
***Didə (f)*** – gözün bəbəyi

***Dilxun (f)*** – ürəyi qanlı
***Dudi-ah (f)*** – ahın tüstüsü
***Eyn (ə)*** – göz
***Əbrişin (f)*** – qıvrım
***Əbrü-kaman (f)*** – qaşı kaman, kaman qaşlı
***Əfkarı (ə)*** – fikri, dərd-qəmi
***Əflakə (ə)*** – fələklər, göylər
***Əfzəl (ə)*** – üstün, daha gözəl
***Əhmər (ə)*** – qırmızı
***Əxi (ə)*** – qardaş
***Əxtər (f)*** – ulduz, bəxt, tale
***Ələm (ə)*** – qara bayraq
***Əndəlib (ə)*** – bülbül
***Ərbayi-ənasir (ə)*** – dörd ünsür
***Ərş (ə)*** – göy üzü
***Əsəl (ə)*** – bal
***Əşkbar (f)*** – göz yaşı seli
***Əşki-al (f)*** – qanlı göz yaşı
***Əttar (ə)*** – ətir satan
***Fanus (ə)*** – qədim əl fanarı
***Fəraq (ə)*** – ayrılıq, hicran
***Firdovsi-əlada (ə)*** – cənnət bağında
***Firqət (ə)*** – ayrılıq
***Giranbar (f)*** – göz yaşı tökən
***Giryan (f)*** – ağlar, gözü yaşlı
***Göftar (f)*** – söhbət edən
***Guşuna (f)*** – qulağına
***Hidayət (ə)*** – doğru yol
***Hilal (ə)*** – Ay
***Hüsnü-vəcahət (ə)*** – hüsnün gözəlliyi
***Xab (f)*** - yuxu
***Xaki-payına (f)*** – ayağın torpağına
***Xakisar (f)*** – yerlə bir
***Xanə (f)*** – ev
***Xar (f)*** – tikan
***Xədəng (f)*** – ox
***Xəyyat (ə)*** – dərzi
***Xəzan (f)*** – payız, yarpaq tökümü

***Xirədmənd (f)*** – düşüncəli, ağıllı, bilikli, alim
***Xırxa (f)*** – dərviş kürkü
***Xoryada (f)*** – alçaq adam, ləyaqətsiz
***Xub (f)*** – gözəl
***Xuban (f)*** – gözəllər
***Xudkeş (f)*** – işi yaxşı gedən
***Xunxar (f)*** – qaniçən
***İdbar (ə)*** - çirkin
***İltimas (ə)*** - xahiş
***İltifat (ə)*** – rəhm, mehribanlıq, lütf
***İmran (ə)*** – tuti, gözəl səsli quş
***İsmi (ə)***- adı
***İstiqna (ə)*** – etinasızlıq, ağır davranma
***Kar (f)*** – iş
***Keysu (f)*** – gözəl
***Kəbir (ə)*** – böyük
***Kəzzab (ə)*** – yalançı, yalan danışan
***Kibr (ə)*** – hiylə
***Kuh (f)*** – dağ, qaya
***Kuyuna (f)*** – ətrafına, çevrəsinə
***Küfr (ə)*** – 1) dinsiz, 2. Günaha batma, naşükür
***Külbeyi-hicran (ə)*** – hicran otağı
***Qadiri -qəffar (ə)*** – Allah, Tanrı
***Qafa (ə)*** – baş, beyin
***Qəflə (ə)*** – karvan
***Qəmər (ə)*** – Ay
***Qəsəm (ə)*** – and
***Qəssal (ə)*** – meyit yuyan, mürdəşir
***Leyli-nahar (ə)*** – gecə-gündüz
***Ləhni- Davud (ə)*** – Davud peyşəmbərin gözəl səsi, şirin dili olduğuna işarədir
***Ləhzə (ə)*** – dəfə
***Ləm (ə)*** - işıq
***Ləşərik (ə)*** – şəriki olmayan
***Ləşkər (f)*** – qoşun
***Libas (ə)*** – paltar
***Lisan (ə)*** – dil
***Mah (f)*** – Ay

***Mahi -ənvər (f-ə)*** – nurlu, işıqlı Ay
***Mahi-təban (f)*** – açılmış Ay
**Mar (f)** - ilan
***Matəmdar (ə)*** – yas içində olan
***Məlal (ə)*** – dərd, qəm
***Məğrib (ə)*** – qərb
***Məşriq (ə)*** – şərq
***Mətah (ə)*** – az tapılan dəyərli mal
***Mikayıl*** – Allahın ən yaxın mələyi
***Mötədil (ə)*** – orta
***Mövzun (ə)*** – əla, düzgün, gözəl
***Mur (f)*** – qarışqa
***Muraz (ə)*** – murad, dilək
***Muy (f)*** – tük
***Müəttər (ə)*** – ətirli
***Müənbər (ə)*** – ənbər ətirli
***Müjgan (f)*** – kirpik
***Müğ (f)*** – atəşpərəst, şərabsatan
***Mükəddər (ə)*** – kədərli
***Münəvvər (ə)*** – işıqlı
***Mürdə (f)*** – ölü
***Mürəssə (ə)*** – qaş-daşla, cəvahiratla bəzədilmiş
***Mürğiruhum (f)*** – könül quşu, ruh quşu
***Müsəlsəl (ə)*** – silsilə, düzüm-düzüm
***Müstəhəqq (ə)*** – ləyaqətli, layiq
***Müttəsil (ə)*** – daimi, hər zaman
***Naçaq (f)*** – kefsiz, əhvalsız
***Namə (f)*** – məktub
***Namidar (f)*** – adlı-sanlı, şöhrətli
***Nalə (f)*** - ağlar
***Nan (f)*** – çörək
***Natəvan (f)*** – zəif, gücsüz
***Nar (ə)*** – od
***Neştər (f)*** – iynə
***Nəqqaş (ə)*** – nəqş edən, rəssam
***Nihan (f)*** – gizli, qapalı
***Niqab (ə)*** – üz örtüyü
***Nimtənə (f)*** – don, üst paltar

***Nisab (ə)*** – son hədd,
***Nisfi (ə)*** – yarı, yarısı
***Nümayan oldu (f)*** – aydın, aşikar oldu, üzə çıxdı
***Pasiban (f)*** – yaxın, həmdəm, qoruyan, keşik çəkən
***Payəndaz (f)*** – yerə döşənmiş
***Payibənd (f)*** – ayağı bağlı
***Pərini (f)*** – qanadını
***Pəsənd (f)*** – bəyənmə, bəyənən
***Pəs etmək (f)*** – azaltmaq, bitirmək
***Piran (f)*** – qoca
***Piranələr (f)*** – müdrik qocalar
***Pust (f)*** – dəri, dərviş ayaqqabısı
***Pünhanda (f)*** – gizli
***Püstanı-rəna (f)*** – gözəl sinə
***Rah (f)*** – yol
***Rəhni-mürvət (ə)*** – mürvətli olan
***Rəxti-vücud (f)*** – bədən boyu
***Rəvan (f)*** – asan, axıcı
***Riza (ə)*** – razılıq
***Rizq (ə)*** – ruzi, yemək, çörək
***Rizvan (ə)*** – cənnət, cənnətin bağbanı, behişt
***Röya (ə)*** – yuxu
***Rubənd (f)*** – üz örtüyü, niqab
***Ruyi-zəmin (f)*** – yer üzü
***Saqi (ə)*** – şərab paylayan, aşıq ədəbiyyatında mənəvi mey gətirən nurani
dərviş
***Sayə (f)*** – kölgə
***Seyrəqib (f)*** – it rəqib, əğyar (aşıqların dilində bu söz seyrəğib, seyrəqub, segrəqib, seyrəgub və s. şəkillərdə səslənir ki, biz də poetikliyi
qorumaq üçün mətndə olduğu kimi saxladıq)
***Səg (f)*** – it
***Səlsəbil (ə)*** – behiştdə axan çay
***Səməndər (f)*** – alov quşu
***Sənə (ə)*** – il
***Səng (f)*** – daş
***Səngisar (f)*** – daşa basmaq, daş-qalaq etmək

***Sər (f)*** – baş
***Sərdar (f)*** – başçı
***Sərgəşteyi- aləm (f)*** – aləmi heyran edən
***Səyyad (ə)*** - ovçu
***Sin (ə)*** – məzar, qəbir
***Sitəmkar (f)*** – sitəm edən, əziyyət verən
***Siyahipuş (f)*** – qara geyimli, qara örtüklü
***Siyah (f)*** – qara
***Süxəndan (f)*** – söz bilicisi, söz sərrafı
***Şahimərdan (f)*** – Həzrət Əli
***Şamu-səhər (f)*** – axşam-sabah
***Şeşi cihat (f)*** – altı cəhət
***Şəbistan (f)*** – gecə gəzintisi
***Şəbnəm (f)*** – şeh
***Şəbi-yelda (f)*** – ən uzun gecə
***Şəddə (ə)*** – 1. ərəb əlifbasında təkrar olunması lazım gələn samitlərin üzərinə qoyulan işarə, 2. bəzəkli parça növü
***Şərif (ə)*** – şərəfli, şərəf gətirən
***Şərm eyləmək (f)*** – utanmaq, həya eyləmək
***Şəkərfəşan (f)*** – qənd, şəkər saçan
***Şəmistan (ə)*** – odlu yer
***Şikar (f)*** – ov
***Şikvə (ə)*** – şübhə, güman, şikayət
***Şükufəli (f)*** – çiçəkli
***Tar olmaz (f)*** – qaralmaz, qaranlıq olmaz
***Təbibi naşı (ə)*** – naşı təbib
***Təriq (ə)*** – yol
***Təvalla (ə)*** – səy, təşəbbüs
***Tifil (ə)*** – uşaq
***Tiğ (f)*** – ülgüc
***Üryan (ə)*** – şılpaq, paltarsız
***Üzaz (ə)*** – yanaq, üz
***Vird (ə)*** – eyni bir şeyi həmişə təkrarlama
***Yeksan (f)*** – dağılmış, səpələnmiş
***Zəban (f)*** - dil
***Zəbərcəd (ə)*** – bahalı cəvahirat
***Zəhmər (ə)*** – acıq, qəzəb
***Zəkat (ə)*** – təmizlənmə, yoxsullara verilən pay, illik gəlirin onda biri

***Zənbur  (f)*** – arı
***Zənən (f)*** – qadın
***Zərd (f)*** – zəhər
***Zəvvar (ə)*** – Həcc ziyarətinə gedən yolçu
***Zikri-girdikar (ə)*** – xəyallar aləmində olan
***Zimistan (ə)*** –  qış
***Ziyadə (ə)*** – artıq
***Zülf  (f)*** – saç
***Zünnar (ə)*** – keşişlərin belinə bağlanan kəmər

## *ARXAİK SÖZLƏR*

***Aba*** – böyük bacı
***Adna axşamı*** – cümə axşamı
***Al*** – hiylə
***Alçaq*** – təvazökar adam
***Arı*** – təmiz, duru
***Arqırı***  –  artıq-əsgik
***Ayıtmaq*** – demək, söyləmək
***Bayqu*** – qızılquş, quşların şahı
***Bəkləmək*** – gözləmək
***Bəlgə*** – nişan
***Bənək*** – xal
***Bulmaq*** – tapmaq
***Buta*** – nişan
***Çarvadar*** – qoyun taciri
***Çələb*** – Tanrı
***Çilə*** – əziyyət, çətinlik
***Çuğul*** – satqın
***Dal*** – budaq
***Dalda*** – gizlin yer
***Döşləmək*** – qabağına qatıb qovlamaq
***Döşürmək*** – yığmaq, toplamaq
***Duş*** – yuxu
***Eşi*** – tayı, oxşarı
***Əsrik*** – havalanmış, sərxoş
***Əyə*** – sahib, yiyə
***Gap etmək*** – söhbətləşmək

***Göygü*** – kürəkən
***Güz*** – payız
***Hız*** – tez, sürətli
***Hu*** – sufi dərvişlərin Allaha verdikləri rəmzi adlardan biri
***İsmarlamaq*** – sifariş etmək,  xəbər göndərmək
***İssiz*** – yiyəsiz, sahibsiz
***Kavmahi*** – balıq növünün adı
***Kəndi*** – özü
***Kov deyil*** – hesab deyil
***Kötü*** – pis, bəd
***Köy*** – kənd, oba, oymaq
***Qamın*** – güclü, qüvvətli
***Qamu*** – hamı
***Qatı yay*** – möhkəm, sərt yay (oxun yayı)
***Qızılcıq*** – zoğal
***Qonuşmaq*** – danışmaq
***Qutlu*** – uğurlu
***Ləlimək*** – yalvarmaq, sürünmək
***Löyün-löyün*** – növbənöv
***Maç*** – öpüş
***Naçağ*** – xəstə
***Pər*** - qanad
***Sayrı*** – xəstə
***Sayrışmaq*** – səpələnmək
***Suç*** – günah
***Şülən*** – şadlıq, yeyib-içmə məclisi
***Tamu*** – cəhənnəm
***Teyləmək*** – kəsmək, deşmək
***Uçar*** – meydan
***Uçmaq*** – cənnət
***Us*** – ağıl, huş
***Varmaq*** – getmək
***Yazğı*** – ərizə
***Yazı*** – çöl
***Yılmaq*** – yenilmək, məğlub olmaq

## İSTİFADƏ OLUNMUŞ QAYNAQLAR

1. ***Abbaslı İ.*** Folklorşünaslıq axtarışları. İki cilddə, I c., Bakı, "Nurlan", 2009, 512 s.

2. ***Abbaslı İ.*** Folklorşünaslıq axtarışları. İki cilddə, II c., Bakı: Qoliot Qkup QSC, 2010, 380 s.

3. ***Ağbaba A.*** Ağbaba-Çıldır aşıq mühiti. Bakı: "Elm və təhsil", 2012, 370 s.

4. ***Aşıq Alı.*** (toplayıb tərtib edənlər. Ə.Əmirov, Ş.Əsgərov, M.Həkimov). Bakı, "Yazıçı", 1982, 141 s.

5. ***Aşıq, bağrına bas sədəfli sazı.*** (tərtib edənlər: M.Qasımlı, M.Allahmanlı, M.Nəbioğlu, A.Məmmədli). Bakı: Zərdabi Nəşr MMC, 2023, 528 s.

6. ***Aşıq deyişmələri.*** (tərtib edənlər: M.Qasımlı, M.Allahmanlı, A.Məmmədli). Bakı: Azərbaycan Aşıqlar Birliyi, 2022, 540 s.

7. ***Aşıq divaniləri və müxəmməsləri.*** (tərtib edənlər: M.Qasımlı, Allahmanlı M., Məmmədli A.). Bakı: Gənclik, 2020, 424 s.

8. ***Aşıq ədəbiyyatı antologiyası.*** Aşıq poeziyası. (tərtib edənlər: M.Qasımlı, M.Allahmanlı). Üç cilddə, I c. Türkiyə, Meqaprint, 2017, 512 s.

9. ***Aşıq ədəbiyyatı antologiyası***. Məhəbbət dastanları. (tərtib edənlər: M.Qasımlı, M.Allahmanlı). Üç cilddə, II c. Türkiyə, Meqaprint, 2017, 640

10. ***Aşıq ədəbiyyatı antologiyası.*** Qəhrəmanlıq dastanları. (tərtib edənlər: M.Qasımlı, M.Allahmanlı). Üç cilddə, III c. Türkiyə, Meqaprint, 2017, 512

11. ***Aşıq Ələsgər.*** (toplayıb tərtib edəni İ.Ələsgər). İki cilddə, I kitab, Bakı, Elm, 1972, 326 s.

12. ***Aşıq Ələsgər.*** (toplayıb tərtib edəni İ.Ələsgər). İki cilddə, II kitab, Bakı, Elm, 1972, 327 s.

13. ***Aşıq Ələsgər.*** (Əsərləri, dastan – rəvayətlər, xatirələr) (toplayıb tərtib edəni İ.Ələsgər).. Bakı: Şərq-Qərb, 1999, 578 s.

14. ***Aşıq Ələsgərlə bağlı dastan-rəvayətlər.*** (hazırlayanlar: M.Qasımlı, M.Allahmanlı, A.Xəlilova). Bakı: Azərbaycan Aşıqlar Birliyi, 2021, 400 s.

15. ***Aşıq Əsəd.*** Seçilmiş əsərləri. (tərtib edənlər B.Abdullayev, R.Xəlilov). Bakı: Elm, 1979, 162 s.

16. ***Aşıq gözəlləmələri.*** (tərtib edənlər: M.Qasımlı, M.Allahmanlı). Bakı: Gənclik, 2020, 424 s.

17. ***Aşıq Murad Niyazlı.*** Ağır elllər ozanıyam. Bakı:Zərdabi LTD, 2018,152 s.

18. ***Aşıq təcnisləri.*** (tərtib edənlər: M.Qasımlı, M.Allahmanlı, A.Məmmədli). Bakı: Azərbaycan Aşıqlar Birliyi, 2022, 408 s.

19. ***Azərbaycan aşıq poeziyası*** (antologiya). (tərtib edənlər: M.Qasımlı, M.Allahmanlı) Bakı: Şərq-Qərb, 2000, 734 s.

20. ***Azərbaycan aşıqları və el şairləri.*** (tərtib edəni Ə.Axundov). 2 cilddə, I c., Bakı: Elm, 1983, 375 s.

21. ***Azərbaycan aşıqları və el şairləri.*** (tərtib edəni Ə.Axundov). 2 cilddə, II c., Bakı: Elm, 1984, 544 s.

22. ***Çıldırlı Aşıq Şenlik.*** Qarşılaşmalar, deyişmələr, rəvayətlər. (toplayıb tərtib edəni A.Ağbaba). Bakı: Uğur, 2017, 140 s.
23. ***Dərələyəzli ustad Aşıq Cəlil.*** Bakı: Elm və təhsil, 2018, 160 s.
24. ***Ələsgər ocağı.*** (toplayıb tərtib edəni İ.Ələsgər). Bakı: Yazıçı, 1991, 304 s.
25. ***Əmiraslan S., Mahmudoğlu Z., Göyçəli Ə., Xıdırqızı A.*** Şairlər yurdu, aşıqlar diyarı. Bakı: Elm və təhsil, 2022, 595 s.
26. ***Göyçə dastanları və aşıq rəvayətləri.*** Bakı: Səda, 2001, 700 s.
27. ***Həkimov. M.İ.*** Aşıq sənətinin poetikası. Bakı: Səda, 2004, 610 s.
28. ***Həkimov M.*** Bayatılar. Bakı: APİ, 1991, 101 s.
29. ***Həkimov M.*** Aşıq şeir şəkilləri və qaynaqları. Bakı: Maarif, 1999,376 s.
30. ***İman N.*** Seçilmiş əsərləri. (toplayıb tərtib edəni İ.Ələsgər). Bakı, Səda, 2004, 199 s.
***31. Qasımlı M.*** Ozan-aşıq sənəti və ədəbiyyatı. Bakı, Azərbaycan Aşıqlar Birliyi, 2023, 544 s.
32. ***Qasımlı M.*** Folklor və ədəbiyyat araşdırmaları. Bakı: Elm və təhsil, 2017, 627 s.
33. ***Qasımlı M., Allahmanlı M.*** Aşıq şeirinin poetik biçimləri və çeşidləri. Bakı, Elm və təhsil, 2018, 220 s.
34. ***Qasımlı M., Allahmanlı M.*** İzahlı aşıq ədəbiyyatı sözlüyü. Bakı: Azərbaycan Aşıqlar birliyi, 2019, 224 s.
35. ***Mirzəyev H.*** Dərələyəz folkloru. Bakı: Elm, 2006, 768 s.
36. ***Namazov Q.*** Aşıqlar. I kitab, Bakı: Səda, 2004, 444 s.
37. ***Nəbioğlu M.*** Ozan-aşıq dünyası. Bakı, "Nurlan" – 2010, 144 səh.
38. ***Nəbioğlu M.*** Şair Ağacan: Ömür yolu, mühit və sənəti. Bakı, "Bakı mətbəəsi" ASC, 2023, 192 səh.
39. ***Nəbioğlu M., Kamaloğlu M.*** Borçalı aşıqları. Bakı: 3 saylı Bakı mətbəəsi, 2020, 352 s.
40. ***Ozan-aşıq ensiklopediyası.*** (M.Qasımlı, M.Allahmanlı, İ.Köçərli, K.Dadaşzadə). 2 cilddə, I c., Bakı, Gənclik, 2019, 500 s.
41. ***Ozan-aşıq ensiklopediyası.*** (M.Qasımlı, M.Allahmanlı, İ.Köçərli, K.Dadaşzadə). 2 cilddə, II c., Bakı, Gənclik, 2020, 432 s.
42. ***Rzayeva B.*** Ululu Kərim. Bakı: Elm və təhsil, 2020, 264 s.
43. ***60. Sazlı-sözlü Göyçə*** (toplayıb tərtib edəni İ.Ələsgər). Bakı: Azərnəşr, 1999, 288 s.
44. ***Sarıvəlli O***. Qüdrətli şair, ustad sənətkar. Bakı: Avropa, 2011, 128 s.
45. ***Şamil Ə.*** Axıskalı Xəstə Hasan. Bakı: Elm və təhsil, 2012, 248 s.
46. ***Şamil Ə.*** Çıldırlı Aşıq İrfani. Bakı: Elm və təhsil, 2016, 152 s.
47. ***Təhmasib M.H.*** Gözəllik nəğməkarı. Aşıq Ələsgər. II cilddə, Bakı: Elm, 1972, s. 5-52.
48. ***Ustad nəfəsli saz-söz ərməğanı.*** (tərtib edənlər: M.Qasımlı, M.Allahmanlı). Bakı: Zərdabi Nəşr MMC, 2020, 400 s.
49. ***Vəliyev.V.Ə.*** Qaynar söz çeşməsi. Bakı: Yazıçı, 1981, 150 s.

# MÜNDƏRİCAT

**Qaraqoyunlu aşıqları**



**Dərəçiçək-Loru-Pəmbək aşıqları**



**Ağbaba bölgəsi aşıqları**

# QƏRBİ AZƏRBAYCAN AŞIQLARI
***(poeziya antologiyası)***

Kompüter tərtibatçısı
və dizayner: ***NAMİQ VƏLİOĞLU***
Buraxılışa məsul: ***ŞAHNİYAR ƏLİYEV***
Nəşriyyat redaktoru: ***HÜSNİYYƏ HÜSEYNOVA***
Texniki redaktorlar: ***SONA SÜLEYMANOVA***
***SEVİNC SUVAROVA***
Korrektor: ***NURLANA ALLAHMANLI***
Mətni yığanlar: ***ZAHİRƏ HACIYEVA***
***GÜLBƏYAZ DADAŞOVA***

Yığılmağa verilmiş: **05.09.2023**
Çapa imzalanmış: **15.11.2023**
Fiziki çap vərəqi: **32**
Kağız formatı: **70/100**
Tirajı: **1500**

Kitab “Zərdabi Nəşr" MMC Nəşriyyat Poliqrafiya
mətbəəsində ofset üsulu ilə çap olunub.
Ünvan: Bakı şəhəri D.Əliyeva 239/8